**Təbiətin ölkəmizə bəxş etdiyi zəngin sərvətlərə xüsusi qayğı ilə yanaşmaq, belə misilsiz xəzinələri bəşəriyyətin gələcəyi naminə qorumaq, üzərimizə düşən başlıca vəzifələrdəndir.**

***Ümummilli lider Heydər Əliyev***

# AZƏRBAYCAN RESPUBLİKASININ QIRMIZI KİTABI

# İKİNCİ NƏŞR

*"Azərbaycan Respublikasının Qırmızı Kitabı - nadir və nəsli kəsilməkdə olan bitki və göbələk növləri", "Şərq-Qərb" nəşriyyatı, Bakı, 2013, 676 s.*

*"Azərbaycan Respublikasının Qırmızı Kitabı - nadir və nəsli kəsilməkdə olan fauna növləri", "Şərq-Qərb" nəşriyyatı, Bakı, 2013, 518 s.*

**By yaxınlarda Azərbaycan Respublikası "Qırmızı Kitabı"nın II nəşri çapdan çıxmışdır. "Qırmızı Kitab"Azərbaycan Respublikası ərazisində nadir və nəsli kəsilmək təhlükəsi olan vəhşi heyvan və yabanı bitki növlərinin vəziyyəti haqqında rəsmi dövlət sənədidir. O, Respublikanın bütün ərazisində, o cümlədən Xəzər dənizinin Azərbaycana mənsub olan sektorunda heyvan və bitki növlərinin vəziyyəti, yayılması və mühafizəsi tədbirləri haqqında məlumatları özündə əks etdirir. Ölkə prezidenti cənab İlham Əliyevin 24 mart 2006-cı il tarixli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında bioloji müxtəlifliyin qorunması və davamlı istifadəsinə dair Milli Strategiya və Fəaliyyət Planı"na əsasən Azərbaycan Respublikası Ekologiya və Təbii Sərvətlər Nazirliyi (ARETSN) və Azərbaycan Milli Elmlər Akademiyasına (AMEA) Azərbaycan Respublikasının "Qırmızı Kitabı"nın 2-ci nəşrinin təşkili tapşırılmışdır. "Qırmızı Kitabı"n layihəsi AMEA, ARETSN, ali təhsil müəssisələrinin və vətəndaş cəmiyyəti institutlarının nümayəndələrinin birgə səyləri nəticəsində hazırlanmışdır. "Qırmızı Kitab"ın formalaşdırılmasında AMEA-nın Botanika və Zoologiya İnstitutlarının alimlərinin son illərdə apardıqları intensiv elmi-tədqiqat işləri və çöl ekspedisiyalarının mühüm rolu olmuşdur. Layihə dəfələrlə geniş müzakirə olunmuş, təhlillər aparılmış, rəy və tövsiyyələr əsasında qüsurlar aradan götürülmüş və nəticədə kitab daha təkmil formada çap edilmişdir.**

Azərbaycan Respublikası Qafqaz regionunda ən zəngin təbii sərvətlərə malik bir ölkədir. Bioloji müxtəlifliyinə görə də Azərbaycan dünyada özünəməxsus yerlərdən birini tutur, burada zəngin bitki və heyvan növləri cəmlənmişdir. Bu səbəbdən, Azərbaycan 2000-ci ildə biomüxtəliflik üzrə Beynəlxalq konvensiyaya qoşulmuşdur. Hazırda bu istiqamətdə mühüm tədbirlər görülür, xüsusi mühafizə edilən təbiət ərazilərinin şəbəkəsi genişləndirilir, dövlət təbiət qoruqları, yeni parklar yaradılır, həmçinin xüsusi mühafizə rejimi gücləndirilir. Eyni zamanda, bu sahənin hüquqi bazası möhkəmləndirilərək beynəlxalq hüquq normaları səviyyəsinə yaxınlaşdırılır.

Bioloji müxtəlifliyin qorunması Azərbaycanda dövlət siyasətinin əsas istiqamətlərindən biridir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 2006-cı il 24 mart tarixli sərəncamı ilə "Azərbaycanda bioloji müxtəlifliyin qorunması və davamlı istifadəsinə dair" Milli Strategiya və Fəaliyyət Planı təsdiq edilmişdir. Həmin sənədlərə uyğun olaraq, nadir və nəsli kəsilməkdə olan bitki və heyvan növlərinin qorunması, xüsusi mühafizə olunan ərazilərdə inkişaf etdirilməsi, prioritet ekosistemlərin müəyyən edilməsi istiqamətində işlər aparılır.

Bütün dünyada vəhşi təbiət qorunur və öyrənilir. Bu baxımdan xüsusi qorunan təbiət ərazilərinin rolu böyükdür; onlar ekosistemlərin saxlanmasında əvəzsizdirlər. Məhz, xüsusi mühafizə olunan təbiət ərazilərinin fəaliyyəti nəticəsində nadir və nəsli kəsilməkdə olan bitki və heyvan növlərinin qorunub saxlanılması mümkün olur.

Qeyd etmək lazımdır ki, "Qırmızı Kitab" - məhv olma təhlükəsi altında olan heyvan, bitki və göbələk növləri haqqında məlumat toplanan kitabdır. Azərbaycan Respublikasının "Qırmızı kitab"ı - ölkə ərazisində nadir və nəsli kəsilmək təhlükəsi olan vəhşi heyvan və yabanı bitki növlərinin vəziyyəti haqqında rəsmi dövlət sənədidir. O, ölkənin bütün ərazisində, o cümlədən, Xəzər dənizinin Azərbaycan Respublikasına mənsub olan sektorunda heyvan və bitki növlərinin vəziyyəti, yayılması və mühafizəsi tədbirləri haqqında məlumatları özündə əks etdirir.

Azərbaycanda "Qırmızı kitab"ın tərtib olunması haqqında 1977-ci ildə qərar qəbul edilmişdir. Bitki və heyvanların kitaba salınması onların məhv olmasının qarşısını müəyyən qədər almışdır.

Təbiətin və təbii ehtiyatların mühafizəsinin qlobal strategiyasına (1980) uyğun olaraq, biosferdə öz davamlılığını və tamlığını itirən bütün növlərin biomüxtəlifliyinin qorunması müasir dövrün ən mühüm vəzifəsidir. Azərbaycanın ərazisi, onun landşaftı bioloji müxtəlifliyin yüksək səviyyəsi ilə seçilir. Ölkəmizin ərazisində bitən 4500-dən çox ali sporlu bitkilərin 200-ə qədəri Azərbaycanın, 950-si Qafqazın endemi hesab olunur. 30 min fauna növlərinin isə 15%-ni endemlər təşkil

edir.

Hələ yaxın keçmişdə respublikamızın bitki və heyvanat aləminin olduqca zəngin olması məlumdur. Azərbaycan müstəqillik qazandıqdan sonra ətraf mühitin və ekologiyanın mühafizəsi sahəsində dövlət siyasəti məhz Ulu Öndər Heydər Əliyevin prezidentliyi dövründə formalaşmağa başlamışdır. Hal-hazırda ölkədə bu istiqamətdə çox uğurlu siyasət həyata keçirilir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin səyləri nəticəsində ətraf mühitin mühafizəsi sahəsində ekoloji siyasət yeni vüsət almış, onun formalaşması və həyata keçirilməsi üçün müvafiq dövlət proqramları işlənib hazırlanmışdır. Biomüxtəlifliyin öyrənilməsi biologiyanın fundamental məsələlərindən biridir. Respublikamızda biomuxtəlifliyin qorunması üzrə ilk təşəbbüs akademik Cəlal Əliyev tərəfindən göstərilmişdir. Təbiətdə növmüxtəlifliyinin itməsinə aparan ekoloji problemlərin araşdırılmasına həsr olunmuş tədqiqatlar müşahidə olunan dəyişikliklərin dinamikasının dərindən öyrənilməsinə yönəldilmişdir.

Azərbaycanın flora və faunasının növmüxtəlifliyi və yüksək səviyyədə endemizmi, hər şeydən əvvəl, ekoloji şəraitin müxtəlifliyi və müxtəlif dövrlərdə landşaftın biotik komponentlərinin inkişaf tarixi ilə əlaqədardır. XX əsrin ortalarından etibarən bioloji müxtəlifliyə və ekosistemlərə təhlükə törədən mənfi amillərin sayı artmış, insanların fəaliyyəti nəticəsində ekosistemlər deqradasiyaya uğramış, bir çox flora və fauna növləri məhv olmuş və ya onların nəsli kəsilmək təhlükəsi altında qalmışdır.

İnsanların əməli fəaliyyəti nəticəsində son 60-70 il ərzində bir çox qiymətli ağac cinslərindən (*Quercus macranthera, Acer trautvetterii, Betula pendula, B.litvinovii, Paeonia mlokosewitschii, Laurocerasus officinalis* və s.) ibarət olan meşələrin sahəsi xeyli azalmışdır. Həmçinin, bəzi növlərin çox az sahədə rast gəlinməsi və ya tamamilə məhv olması, respublikamızın əksər təbii zonalarında meşə örtüyünün antropogen dəyişilməsi və bitki qurşaqlarının əvəz olunması müşahidə olunur. Belə ki, dağ yamaclarında eroziya prosesinin güclənməsi, dağ ərazilərinin və çayların su rejiminin kəskin pisləşməsi baş verir. Buzlaşma dövrünün sonunda Bozdağ, Dibrardağ, Beşbarmaq dağ silsiləsinin bitki senozlarında *Erysimum, Xeranthemum, Stipa, Dianthus* cinslərinə aid olan növlər geniş yayıldıqları halda, hazırda onların çoxu sıradan çıxmışdır. Sənayenin, tikintinin, kənd təsərrüfatının sürətli inkişafı, əhalinin istirahəti üçün yeni ərazilərin istifadəsi nəticəsində müxtəlif bitkilərin həyat şəraiti dəyişilir, bəzən də bir çoxu sıradan çıxır. Digər tərəfdən, vaxtilə Azərbaycan ərazisində geniş rast gəlinən turan pələnginin tamamilə nəsli kəsilmiş, talış qırqovulu isə artıq yabanı təbiətdə məhv olmuşdur.

Növlərin qorunmasının ən səmərəli üsullarından biri "Qırmızı Kitab"ın təsis edilməsidir. Hələ 1977-ci ildə Azərbaycanın flora və faunasının zəngin genofondunun mühafizəsi üçün respublika höküməti Azərbaycan Respublikasının "Qırmızı Kitab"ının təsis edilməsinə dair qərar qəbul etmişdir. Ölkəmizdə bitkilərin mühafizəsi həm ölkə qanunvericiliyində, həm də 1989-cu ildə çap edilmiş Azərbaycan SSR-in bitki və heyvanlarının ilk "Qırmızı Kitab"ının I nəşrində təsbit edilmişdir. Bura alimlər tərəfindən Azərbaycan florasında mühafizəsi tələb olunan 140 növ bitki, faunasına isə 108 növ heyvan daxil edilmişdir. Azərbaycan Respublikasının "Qırmızı Kitab"ının I nəşrində verilmiş fauna və flora növləri 2 kateqoriya üzrə təsvir edilmişdir: yoxa çıxmaq təhlükəsi olan və nadir növlər. Birinci kateqoriyaya bir sıra mənfi amillərin təsiri nəticəsində (tələf olması və yaşadığı yerlərin dağıdılması) sayı və arealı əhəmiyyətli dərəcədə azalan və böhran səviyyəsinə çatan növlər daxil edilmişdir. Sayı azalmağa doğru meyl edən və kiçik sahələrdə rast gəlinən növlər isə nadir növlərə aid edilmişdir. Lakin bu meyarlara görə bölgü şərti olmuşdur və beynəlxalq təcrübə ilə təsdiq edilməmişdir. Bununla əlaqədar nadir ekosistemin və unikal genofondun qorunmasına kəskin tələbat yaranır. Son dövrə qədər biz nadir və nəsli kəsilmiş növlərin Beynəlxalq Təbiəti Mühafizə İttifaqının (IUCN) meyaralrına görə təsnif edilmiş və yenilənmiş siyahısına, nadir növlərin populyasiyalarının müasir vəziyyəti haqqında təsdiq edilmiş elmi materiallara, populyasiyaların həyat qabiliyyəti, sayı, yaş stukturu, yayılma sahəsi haqqında dəqiq məlumatlara malik deyildik.

Bununla yanaşı, birinci nəşrin çapından keçən 20 ildən çox müddət ərzində "Qırmızı Kitab"a daxil edilmiş bir cox nadir və nəsli kəsilmək təhlükəsi olan novlərin təbii ehtiyatları onların qorunması üçün həyata keçirilən tədbirlər (koçürülmə, iqlimləşdirmə və s.) nəticəsində bərpa olunmusdur. Digər tərəfdən, Azərbaycan flora və faunası üçün xarakterik olan bir çox novlərin sayı azalmış və nəsli kəsilmək təhlukəsi yaranmışdır. Azərbaycan Respublikasının "Qırmızı Kitab"ının hər 10 ildən bir çap olunması ölkə qanunvericiliyində nəzərdə tutulmuşdur. "Qırmızı Kitab"ın I nəşri 1989-cu ildə çap olunmuş və sonrakı illərdə yeni nəşrin işlənməsi zərurəti yaranmışdır. Azərbaycanın "Qırmızı Kitab"ının yeni – ikinci nəşri haqqında Azərbaycan Respublikası Nazirlər Kabinetinin 15 iyul 2000-ci il tarixli 125 saylı Qərarı olmuşdur. Azərbaycan Respublikası Prezidentinin 24 mart 2006-cı il tarixli 1368 saylı Sərəncamı ilə "Azərbaycan Respublikasında bioloji müxtəlifliyin qorunması və davamlı istifadəsinə dair Milli Strategiya və Fəaliyyət Planı" təsdiq edilmiş və onun 1.1.3-cü bəndinə əsasən "Qırmızı Kitab"ın II nəşrinin çapı 2009-cu ildə nəzərdə tutulmuşdur. Son illərin tədqiqatları nəticəsində ölkə florasına yeni növlər əlavə olunmuş və bir sıra nomenklatur dəyişikliklər edilmişdir.

Azərbaycanın "Qırmızı Kitab"ının ikinci nəşri çox arzuolunan bir haldır. Hazırda akademik Cəlal Əliyevin rəhbərliyi altında respublika ərazisində yayılmış nadir və nəsli kəsilməkdə olan bitki, göbələk (I cild) və fauna (II cild) növlərinin tədqiqi üzrə nəticələri əks etdirən "Azərbaycan Respublikasının Qırmızı Kitabı" (ikinci nəşr) hazırlanmış və dərc edilmişdir. 300 ali və ibtidai bitki, həmçinin göbələk və 223 fauna növü, onların yayılması, sayı və azalma tendensiyaları haqqında məlumatlar ilk dəfə olaraq kitaba daxil edilmiş, onların bioekoloji və fitosenoloji xüsusiyyətləri, məhdudlaşdırıcı amillər və mühafizə tədbirləri qeyd olunmuşdur. GİS sisteminin istifadəsilə (ArcGIS10 proqramı) növlərin yayılması üzrə xəritələr tərtib edilmiş və Beynəlxalq Təbiəti Mühafizə İttifaqının (IUCN) kateqoriya və meyarlarına uyğun olaraq onların təbiətdə saxlanma statusunun müasir qiymətləndirilməsi aparılmışdır. "Qırmızı kitab"ın tam formalaşdırılması son illər ərzində aparılan fəal tədqiqat işləri hesabına mümkün olmuşdur, AMEA-nın Botanika və Zoologiya İnstitutlarının mütəxəssisləri tərəfindən nadir, nəsli kəsilməkdə olan və endem bitki və heyvan növlərinin tədqiqi üzrə son illər intensiv monitorinqlər keçirilmiş, onların beynəlxalq səviyyədə müasir qorunma statusu müəyyənləşdirilmişdir.

"Qırmızı kitab"ın II nəşrində respublika flora və faunasının qorunmağa ehtiyacı olan növləri haqqında məlumat verilir. Siyahıya daxil edilmiş 300 növün 266-sı ali bitkilərə, 20-si ibtidai (6 yosun, 13 şibyə və 1 mamır) bitkilərə və 14-ü göbələk növlərinə aiddir. Ali bitkilərin arasında Plaunkimilər – 1 növ, Qatırquyruğukimilər – 1 növ, Qıjıkimilər – 4 növ, Çılpaqtoxumlular - 4 növ, İkiləpəli örtülütoxumlular – 256 növ təşkil edir. 223 fauna növləri içərisindən respublikamızın hidrofaunasına daxil olan 1 növ Oligochaeta, 1 növ Crustacea, 1 növ Mollusca, 71 növ Insecta, 6 növ Amphibia, 14 növ Reptilia, 9 növ Pisces, 72 növ Aves, 42 növ Mammalia sinfinə aiddir. Qeyd etmək lazımdır ki, materialların tərtib edilməsində Respublikanın bir sıra ali məktəb və ixtisaslaşmış qurumlarının, nazirliklərin, ictimai təşkilatların mütəxəssisləri də iştirak etmişdir.

Təhlükə dərəcəsinin qiymətləndirilməsi Beynəlxalq Təbiəti Mühafizə İttifaqı (IUCN) tərəfindən qəbul edilmiş kateqoriyalar və kriteriyalar sistemi - itmişlər (EX), kritik vəziyyətdə olanlar (CR), zəiflər (VU), nəsli kəsilməkdə olanlar (EN), təhlükəli vəziyyətə yaxın olanlar (NT), daha az təhlükəli vəziyyətdə olanlar (LC), informasiya çatışmazlığı (DD) əsasında həyata keçirilmişdir.

IUCN-nin qaydalarına uyğun olaraq, kateqoriyalar yalnız yabanı növlərin populyasiyaları üçün onların təbii arealı çərçivəsində təyin edilməlidir. Növlərin nəslinin kəsilməsi mümkün olan prosesdir. Ona görə də növün nəslinin kəsilməsinin yüksək risk kateqoriyasına aid edilməsi onun təbiətdə nəslinin kəsilməsinin yüksək ehtimallığını ifadə edir. Yalnız zamana görə yüksək risk kateqoriyasına aid edilmiş növlərin əksəriyyətinin daha aşağı risk kateqoriyasına aid edilən növlərə nisbətən yaxın zamanda nəslinin kəsilmə ehtimallığı (onlar üçün səmərəli mühafizə tədbirləri tətbiq edilmədiyi

təqdirdə) da eynilə yüksəkdir. Növlərin “kritik təhlükə həddində olanlar” (CR), “nəsli kəsilmək təhlükəsində olanlar” (EN) və “nəsli kəsilməyə həssas olanlar” (VU) kateqoriyalarına aid edilməsi üçün miqdari meyarlar şkalası mövcuddur.

Növün coğrafi yayılma ərazisində olan populyasiyaların hazırkı statusu haqqında dəqiq məlumatlar əldə etmək üçün Qırmızı siyahının ideal qiymətləndirilməsi tam, sistematik çöl icmalına əsaslanmalıdır. Praktiki olaraq bu nadir hallarda mümkün olduğundan qiymətləndirmə, ehtimal ki, herbari və icmal məlumatları və ekspert bilgilərinin istifadəsindən asılı olaraq qalır və Qırmızı siyahı növlərinin qiymətləndirilməsi zamanı kateqoriyanın təyin edilməsi üçün obyektivlik, şəffaflıq və dəqiqliyi artıran 5 kəmiyyət meyarı tətbiq edilir. A meyarı populyasiyaların ölçülərinin keçmişdə, indi və gələcəkdə azalmasına; B meyarı azalan və/və ya müstəsna dəyişmələrlə davam edən fraqmentləşmə ilə birlikdə sahənin coğrafi ölçüsünə; C meyarı bir yarımpopulyasiyada böyük nisbətdə və/və ya müstəsna dəyişmələrlə azalmaqda davam edən populyasiyanın kiçik ölçülərinə; D meyarı populyasiyanın çox kiçik və ya məhdud ölçüsünə və E meyarı itmə riskinin keyfiyyət təhlilinə əsaslanır. Qırmızı Siyahının qiymətləndirmə nəticələri səlahiyyətli orqanlar tərəfindən yoxlanıldıqdan sonra IUCN-nin məlumat bazası www.redlist.org vasitəsilə istifadə imkanı yaradılır.

“Qırmızı siyahı” növləri nəzərdə tutulduqda “nadir” və “endem” anlayışları fərqləndirilməlidir. Nadir növlər aşağıdakı xüsusiyyətləri əks etdirir: təbii olaraq dar coğrafi ərazidə bitir, bir və ya az xüsusi yayılma ərazilərini tutur, öz ərazisində yalnız kiçik populyasiyalar əmələ gətirir. Lakin endem növ təbii şəkildə ölçüsü dar və ya nisbətən geniş ola bilən yalnız bir coğrafi ərazidə bitir. Bütün endem növlər nadir deyil, həmçinin bütün nadir növlərin də endem olmaları mütləq deyildir. Nadir və endem növləri itmə təhlükəsi ilə əlaqələndirən mülahizə xüsusi maraq kəsb edir. Nadir və endem növlərin itməyə meyllilik səbəbinin müəyyənləşdirilməsi bioloji konservasiya strategiyasının yaradılması üçün əsas bazanı təmin edir. Beləliklə, bir sıra nadir və/və ya endem növlər onların itməsinə gətirib çıxaran bir və ya bir neçə xüsusiyyətləri özündə saxlayır: 1) dar (və yeganə) coğrafi zona; 2) yalnız bir və ya az populyasiya; 3) populyasiyanın kiçik ölçüsü və az genetik dəyişkənlik; 4) insanlar tərəfindən hədsiz istifadə; 5) populyasiyanın ölçüsünün azalması; 6) aşağı reproduktiv potensial; 7) xüsusi ekoloji məkana tələbat; 8) ətraf mühit təsirlərinə davamlı stabil böyümə. Insanın müxtəlif fəaliyyəti nəticəsində nadir və/və ya endem növlərin yayılma əraziləri pozulduğu və/və ya fraqmentləşdiyi zaman digər növlərlə müqayisədə onlar daha böyük sürətlə itməyə meylli olaraq populyasiyalarının sahə və ölçülərinin paylanması azalır. Genetik saxlanmağa yönəlmiş fəaliyyətdə yuxarıda qeyd edilən xüsusiyyətlərə malik növlərə üstünlük verilməli, onlar daha diqqətlə müşahidə edilməli və qorunmalıdır.

"**Bioloji, ekoloji və fitosenoloji xüsusiyyətləri**" bölməsində növlərin ekologiyası və onların səciyyəvi bioloji xüsusiyyətləri, istifadəsi haqqında məlumatlar verilir.

"**Yayılması**" bölməsində növlərin arealı imkan daxilində tam xarakterizə olunmuşdur. Təbii ki, onların Azərbaycanda yayılması haqqında məlumatlar daha ətraflı verilir. Bu zaman bir qayda olaraq, növlərin bitdikləri ərazinin inzibati vahidi göstərilir. Xülasəli və dəqiqləşdirici xəritələr respublikada taksonların arealları haqqında təsəvvür yaradır, lakin konret olaraq yerli mühafizə tədbirlərinin işlənilib hazırlanmasında xüsusi işlərdə verilmiş daha dəqiq xronoloji materiallara, yaxud da herbari kolleksiyası məlumatlarına mütləq əsaslanmaq lazımdır.

«**Sayı və tendensiyası»** bölməsində nisbətən daha yaxşı öyrənilmiş bəzi növlər üçün onların populyasiyalarının vəziyyəti, sayca dəyişməsi, ayrı-ayrı məskunlaşma yerlərinin itməsi tendensiyaları və eləcə də (xüsusi hallarda) bu vəziyyətə gətirib çıxan səbəblər haqqında məlumatlar verilmişdir. Bir çox bitkilər təhlükədə olduğu və kifayət qədər öyrənilmədiyindən bu qisimdən olan məlumatlar təəssüf ki, heç də bütün növlər üçün mövcud deyildir.

"**Məhdudlaşdırıcı amillər**" bölməsində taksonların sayının azalmasına, onların bitdikləri yerlərin pozulmasına və eləcə də nadir növlərin mövcud olması üçün potensial

təhlükə yaradan istər təbii, istərsə də antropogen amillərin xarakterizə edilməsinə cəhd göstərilmişdir.

"**Mühafizə tədbirləri**" adlı Qırmızı Kitabın ən vacib bölməsində həmin kitaba daxil edilmiş növlərin mühafizəsinin qəbul olunmuş və xüsusilə zəruri tədbirləri haqqında məlumatlar öz əksini tapmışdır. Tərtibçilər bu və ya digər növlərin rast gəlindiyi milli parkları, qoruqları və yasaqları qeyd etməyə çalışmışlar, lakin zəruri olan bütün materiallara malik olmadıqlarından müəyyən çatışmazlıqların olması qaçılmazdır.

Bir sıra növlər üçün tam aydın şəkildə, digərləri üçün isə ümumi formada zəruri mühafizə tədbirləri tövsiyə edilmişdir. Konkret mühafizə tədbirləri yerlərdə yaranmış vəziyyətin nəzərə alınması şərtilə, çox vaxt xüsusi əlavə tədqiqatlardan sonra işlənilib hazırlanmalıdır və təbii ki, bunların tam və bütün təfərrüatı ilə “Qırmızı kitab”da öz əksini tapması mümkün deyil. Bitkilərin bitmə yerlərinin şəraiti saxlanılmadan onların mühafizəsinin təşkili mümkün olmadığından əksər növlər, xüsusilə CR, EN, VU statusu kateqoriyalarına aid edilmiş növlər üçün qoruqlar, yasaqlıqlar, təbiət abidələri kimi qorunan təbii ərazilərin yaradılması təklif edilmişdir. Bioloji müxtəlifliyin qorunub saxlanılmasında xüsusi mühafizə olunan təbiət ərazilərinin rolu əvəzedilməzdir. 2003-cü ilədək Azərbaycanda bir dənə də Milli Park olmadığı halda qısa bir dövr ərzində Respublikamızda 8 Milli Park (Akademik Həsən Əliyev adına Zəngəzur, Şirvan, Ağ göl, Hirkan, Altıağac, Abşeron, Şahdağ, Göy-göl) və 4 Dövlət Təbiət Qoruğu (Şahbuz, Eldar Şamı, Bakı və Abşeron Yarımadasının Palçıq Vulkanları qrupu, Korçay) yaradılmış və Xüsusi Mühafizə olunan təbiət ərazilərinin sahəsi artırılaraq 4.5%-dən 10.2%-ə çatdırılmışdır. Hal-hazırda, flora və faunanın qorunub saxlanılması və davamlı istifadəsi üçün ölkədə 11 Dövlət Təbiət Qoruğu və 8 Milli Park mövcuddur və yeni qorunan ərazilərin yaradılması istiqamətində aparılan işlər davam etdirilir. Müstəqillik dövrünün əvvəllərində Azərbaycanda meşə sahələrinin azalma tendensiyası müşahidə edilirdi. Hazırda yaşayış ərazilərinin qazlaşdırılması, bərpa olunan enerji mənbələrindən istifadə ağacların oduncaq məqsədilə kəsilməsini əhəmiyyətli dərəcədə azaltmışdır. Həyata keçirilən məqsədyönlü tədbirlər və aparılan intensiv meşəsalma işləri nəticəsində meşələrin azalma tendensiyasının qarşısını almaq mümkün olmuşdur. Belə ki, beynəlxalq ekspertlər də Azərbaycanın meşə fondunun 0,4% artmasını təsdiq etmişlər. Ümümiyyətlə, Azərbaycanda təbiəti mühafizə tədbirlərinin həyata keçirilməsi nəticəsində 43 xüsusi qorunan və ölkə ərazisinin 10%-ni təşkil edən təbiət ərazi vahidi (mili parklar, dövlət təbiət qoruqları, yasaqlıqlar) yaradılmışdır.

Azərbaycan Hökuməti ölkənin bioloji müxtəlifliyinin mühümlüyünü nəzərə alaraq müxtəlif qanunvericiliklər təyin etmişdir. Ölkənin biomüxtəlifliyinin qorunması və istifadəsini tənzimləyən bir neçə qanun mövcuddur: “Bitkilərin mühafizəsi haqqında Qanun” (1997), «Heyvanlar aləmi haqqında» (1999) “Ətraf mühitin mühafizəsi haqqında Qanun” (1999), “Ətraf mühitin mühafizəsi və təbii sərvətlərdən istifadə haqqında Qanun” (1992), “Xüsusi mühafizə olunan təbiət əraziləri və obyektləri haqqında Qanun” (2000),“Meşə məcəlləsi” (1997).

Təbii ki, “Qırmızı Kitab”ın tam formalaşdırılması son illər ərzində AMEA-nın Botanika və Zoologiya İnstitutlarında aparılan intensiv elmi-tədqiqat işləri və çöl ekspedisiyaları hesabına mümkün olmuşdur. Bununla yanaşı CEPF və IUCN (2006-2009) tərəfindən maliyyələşdirilən “Qafqazın endem bitkilərinin qorunması” üzrə Beynəlxalq layihənin, Azərbaycan Respublikası Prezidenti yanında Elmin İnkişafı Fondunun (EİF) dəstəyilə (2010-2011) “Azərbaycanın nadir və nəsli kəsilməkdə olan bitki və göbələk növlərinin statusunun qiymətləndirilməsi” layihəsinin nəticələri əsasında və dünyanın bir çox nüfuzlu universitetləri və təşkilatları ilə unikal əmakdaşlıqda çox qısa zamanda mühüm yeni məlumatların toplanılması və sistemləşdirilməsi, həmçinin Respublikanın nadir və nəsli kəsilməkdə olan növlərinin əlavə monitorinqinin keçirilməsi mümkün olmuşdur.

Ayrı-ayrı növlər üzrə xülasələrin tərtibatçıları arasında AMEA-nın Botanika və Zoologiya İnstitutlarının əməkdaşları ilə yanaşı, Respublikanın müxtəlif universitetlərinin və Akademiya təşkilatlarının, Ekologiya və Təbii Sərvətlər Nazirliyinin, bir sıra Milli Parkların əməkdaşları da vardır.

Növlərin nadir orijinal fotoşəkillərini təqdim etmiş, eləcə də dəyərli elmi məsləhətləri və bilavasitə metodik vasitələrlə yardım etmiş xarici həmkarlarımızın iştirakı xüsusi qeyd edilməlidir.

"Azərbaycanın Qırmızı Kitabı"nın II nəşri, şübhəsiz ki, bir sıra çatışmazlıqlar və texniki qüsurlardan da azad deyil. "Qırmızı kitab"lar mütəmadi olaraq dəqiqləşdirilməli və yenidən nəşr edilməli olduğundan, redaksiya heyəti kitabın təkmilləşdirilməsi üçün əlavə növlərin daxil edilməsi və zənginləşdirilməsi, eləcə də dərc olunan materialların strukturunun yaxşılaşdırılması baxımından mütəxəssis alimlər tərəfindən konkret təkliflərin veriləcəyinə ümid edirlər.

"Qırmızı Kitabı"n hazırkı nəşrinin tərtib olunmasında iştirak edən redaksiya üzvləri və müəllif heyəti kitabın nəşrinin respublikanın bitki və heyvanat aləminin mühafizəsinin gücləndirilməsinə, onun öyrənilməsi sahəsində elmi tədqiqatların dərinləşməsinə kömək edəcəyinə, son nəticədə ölkəmizin təbii sərvətlərinin gələcək nəsillər üçün qorunub saxlanılmasına imkan verən Azərbaycan Konstitusiyası ilə müəyyənləşdirilmiş mühüm məsələlərin həlli yolunda irəliyə doğru atılmış bir addım olacağına böyük ümid bəsləyirlər.

***Validə Əli-zadə***
***b.e.d., prof., AMEA Botanika İnstitutunun direktoru***

***İlham Ələkbərov***
***b.e.d., prof., AMEA-nın müx. üzvü,***
***AMEA Zoologiya İnstitutunun direktoru***

# «КРАСНАЯ КНИГА» АЗЕРБАЙДЖАНСКОЙ РЕСПУБЛИКИ

# ВТОРОЕ ИЗДАНИЕ

*"Красная книга Азербайджанской Республики - редкие и исчезающие виды растений и грибов", Издательский дом "Западо-Восток", Баку, 2013, 676 с.*

*"Красная книга Азербайджанской Республики - редкие и исчезающие виды фауны", Издательский дом "Западо-Восток ", Баку, 2013,518 с.*

Недавно было опубликовано второе издание "Красной книги" Азербайджанской Республики. "Красная книга" - это официальный государственный документ о статусе редких и находящихся под угрозой исчезновения видов животных и растений Азербайджанской Республики. В ней отражена информация о состоянии, распространении и мерах по охране видов животных и растений на территории всей Азербайджанской Республики, включая принадлежащий ей сектор Каспийского моря. В соответствии с «Планом действий и национальной стратегией по сохранению и устойчивому использованию биологического разнообразия Азербайджанской Республики", утвержденным указом президента страны господина Ильхама Алиева от 24 марта 2006 года, Министерству экологии и природных ресурсов Азербайджанской Республики (МЭПРА) и Национальной Академии наук Азербайджана (НАНА) было поручено организовать 2-е издание «Красной книги» Азербайджанской Республики. Проект "Красной книги" был разработан в результате совместных усилий НАНА и МЭПРА, а также представителей организаций гражданского общества и высших учебных заведений. Интенсивные исследования и полевые экспедиции последних лет, проведенные учеными Институтов ботаники и зоологии НАНА, сыграли важную роль в формировании данного издания «Красной Книги». В результате широких обсуждений проекта, многократного рассмотрения и устранения недостатков в соответствии с предложенными рекомендациями, книга была опубликована на высокопрофессиональном уровне.

***Валида Али-заде,***
***д.б.н., проф., директор Института НАНА***

***Ильхам Алекперов,***
***д.б.н., проф., чл.-корр. НАНА, директор Института зоологии НАНА***

# THE "RED BOOK" OF THE AZERBAIJAN REPUBLIC
# SECOND EDITION

*"Red Book of the Azerbaijan Republic – rare and endangered species of plants and fungi", "East-West" publishing house, Baku, 2013, 676 p.*

*"Red Book of the Azerbaijan Republic – rare and endangered species of fauna", "East-West" publishing house, Baku, 2013, 518 p.*

Recently the second edition of the "Red Book" of the Azerbaijan Republic has been published. The "Red Book" is an official state document about the rare and endangered species of plants and animals of the Azerbaijan Republic. The book contains information on status, distribution and efforts to protect the plant and animal species throughout the republic, including the sector of the Caspian Sea belonging to Azerbaijan Republic. According to "The National Strategy and Action Plan on Protection and Sustainable Use of the Biodiversity" approved by the Decree of the President of Azerbaijan Republic Mr. Ilham Aliyev on March 24, 2006, the Ministry of Ecology and Natural Resources of the Azerbaijan Republic (MENRAR) and Azetbaijan National Academy of Sciences (ANAS) were entrusted to organize the 2nd edition of the "Red Book". The "Red Book" project was developed as a result of the joint efforts of ANAS, MENRAR and representatives of higher education institutions and civil society organizations. The recent intensive researches and field expeditions conducted by scientists of the Institute of Botany and the Institute of Zoology, ANAS, played an important role in the compilation of the "Red Book". As a result of the broad discussions of the project, analyses and corrections based on the suggested recommendations, the book was published on a high professional level.

***Prof. Valida Ali-zade***
***director of the Institute of Botany, ANAS***

***Prof. Ilham Alekperov***
***director of the Institute of Zoology, ANAS***

# *Bilacunaria microcarpa* (Bieb.) M.Pimen. ex V.Tichomirov Növünün Köklərinin Kimyəvi Tədqiqi

**N.X. Mikayılova, S.V. Sərkərov**

*AMEA Botanika İnstitutu, Badamdar şossesi, 40, Bakı AZ1073, Azərbaycan; E-mail: s.serkerov@mail.ru*

***Bilacunaria microcarpa* (*Apiaceae*) bitkisinin köklərindən fərdi şəkildə 4 furokumarin törəməsi ($C_{12}H_8O_4$, ə.t. 188-190°C; $C_{16}H_{14}O_4$, ə.t. 108-109°C; $C_{16}H_{14}O_5$, ə.t. 141-143°C; $C_{16}H_{16}O_6$, ə.t. 136-137°C) alınmışdır. İQ-, $^1H$ NMR-spektrlərin aşkarlanmasından alınan nəticələr əsasında tədqiq olunan maddələrin kimyəvi quruluş formulları təyin edilmiş və sübut olunmuşdur ki, təyin edilmiş quruluş formulları uyğun olaraq berqapten, izoimperatorin, oksipeysedanin və oksipeysedanin hidratın quruluş formulları ilə eynidir.**

***Açar sözlər:*** *Bilacunaria microcarpa, kumarin törəmələri, İQ-, $^1H$ NMR-spektroskopiya, kimyəvi sürüşmə, spin-spin qarşılıqlı təsiri, daxili standart, tetrametilsilan*

## GİRİŞ

Azərbaycan florasına görə özündə 75 cins və 184 növ (Ахундов, 1955), S.C.İbadullayevanın məlumatlarına (İbadullayeva, 2005) görə isə 76 cins, 187 növü və 1 yarımnövü birləşdirən *Apiaceae* fəsiləsi tərkibindəki kumarin törəmələrinin tibbi praktikada əhəmiyyəti bitki mənşəli bioloji fəal maddələrin tədqiqi ilə məşğul olan tədqiqatçıların daim diqqəti mərkəzindədir. Qeyd etmək lazımdır ki, kumarin törəmələrinin bitkilər aləmində rolu hələ kifayət qədər aydın deyildir. Amma zənn etmək olar ki, o müxtəlifdir. Onlardan bəziləri boy inhibitorlarıdır, digərləri toxumların cücərməsini tənzimləyir. Bəzən bitkilərdə olan kumarin törəmələri bitkiləri mühafizə rolunu oynayır. Hələ qədim zamanlardan tərkibində kumarinlər olan bitkilərdən xalq təbabətində istifadə olunması məlumdur. Məsələn, *Peucedanum ostruthium* (L.) C.Koch. bitkisi köklərinin spirtli ekstraktı qida həzm orqanlarının xroniki pozulmalarının, qarın yatalağı qızdırmalarının və s. müalicəsində istifadə olunurdu. *Prangos pabullaria* köklərinin ekstraktı sidikqovucu vasitə kimi, həmçinin kənd təsərrüfatı heyvanlarının müalicəsində istifadə olunurdu.

Kumarin törəmələrinin antikoaqulyant, ağrıkəsici, şişlərə qarşı, fotosensibilizə edici, ürəyin tac damarlarını genişləndirici, pressor və s. xüsusiyyətlərə malik olması xüsusi maraq kəsb edir (Кузнецова, 1967; Абышев и др., 2003).

Kumarin törəmələrindən furokumarinlər fotodinamik fəallıqlarına görə xüsusilə tədqiqatçıların diqqət mərkəzindədir. Onlardan bəziləri güclü fotosensibilizə edici xüsusiyyətlərinə görə Vitiligo (it leykodermiyası) xəstəliyinə tutulmuş xəstələrin müalicəsində istifadə olunur. Hazırda bir sıra furokumarinli preparatlar – meladinin, meleksin, beroksan, ammifurin, psoralen tibbi praktikada geniş istifadə olunur (Qasımova və Sərkərov, 2011; Qurbanova və Sərkərov, 2011).

Ədəbiyyatda kumarin törəmələrinin xərçəng əleyhinə fəallığa malik olması haqqında məlumatlar da kifayət qədərdir (Никонов, 1959; Цетлин и др., 1965; Iranshahi et al., 2009).

## MATERİAL VƏ METODLAR

Tədqiqat obyekti olaraq Qonaqkənd rayonu Cək kəndi ilə Qələy Xudat kəndi arasındakı ərazilərdən çiçəkləmə fazasının əvvəllərində tədarük edilmiş, müvafiq qaydada qurudulmuş və xırda-xırda doğranılmış *Bilacunaria microcarpa* bitkisinin (535 q) asetonla ekstraksiya edilərək (3 dəfə, hər dəfə 3 gün) alınmış ekstraktiv maddələr cəmindən (35,0 q, çıxım 6,54%) istifadə edilmişdir. Bioloji fəal maddələr ekstraktiv maddələr cəminin (15,0 q) neytral, III-IV dərəcəli fəallığa malik $Al_2O_3$ ilə doldurulmuş şüşə sütununda ($h$=40 sm, $d$=3 sm) xromatoqrafiya metodundan istifadə edərək fərdi şəkildə alınmışdır. Hər fraksiyanın həcmi – 100 ml.

Xromatoqrafiya sütunun heksanla, heksan+ benzolla (2:1, 1:1), benzolla, benzol+xloroformla (3:1, 2:1), xloroformla və xloroform+spirtlə (95:5) elyuasiya edilmişdir. Maddələrin fərdiliyi Silufol UV 254 lövhələrdə nazik təbəqəli xromatoqrafiya metodu ilə, kristallik maddələrin ərimə temperaturu (ə.t.) Boytius masacığında təyin edilmişdir.

İQ-spektrlər vazelin yağında, Varian 640 İS spektrofotometrində, $^1H$ NMR-spektrləri Bruker 300 MHz spektrometrində $^1H$ üçün 300 MHz tezliyində çəkilmişdir. Həlledici kimi deyterixloroform ($CDCl_3$), daxili standart kimi TMS-dən (tetrametilsilandan) istifadə edilmişdir. Kimyəvi sürüşmələr δ-şkalada verilmişdir.

Şərti qeydlər: s – sinqlet, d – dublet, t – triplet, k – kvartet, m – multiplet.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Azərbaycan florasında yayılmış *Apiaceae* fəsiləsi növlərinin bioloji fəal maddələri üzrə kimyəvi pasportlaşdırılması istiqamətində tədqiqat işlərini davam etdirərək *Bilacunaria microcarpa* bitkisi köklərinin kumarin tərkibi öyrənilmişdir. Bitki materialından alınmış ekstraktiv maddələr cəmini sütunlu xromatoqrafiya edərək 4 fərdi maddə alınmış və onlar şərti olaraq Bk-1, Bk-2, Bk-3 və Bk-4 kimi işarələnmişdir.

**Maddə Bk-1.** Xromatoqrafiya sütununun benzolla elyusiya edilən 9-10-cu fraksiyalarından kristallik maddə alınmışdır. Maddənin element tərkibi $C_{12}H_8O_4$, ə.t. 188-190°C.

İQ-spektrdə δ-lakton tsiklinin karbonil (C=O) qrupunu (1700 $sm^{-1}$) və aromatik sistemin –C=C– rabitələrini (1622, 1579 $sm^{-1}$) səciyyələndirən udulma zolaqları mövcuddur.

Tədqiq etdiyimiz birləşmənin $^1H$ NMR-spektrində (Şəkil 1) qeyd olunmuş sahəsi 3 proton vahidinə bərabər olan sinqlet (4,20 m.h.) molekulda metoksi (–$OCH_3$) qrupun olmasını sübut edir. Spektrin zəif maqnit sahəsində aşkarlanan siqnallar (d., 6,26, J=10,0 Hz, 1H; d., 8,12 Hz, J=10,0 Hz, 1H; s., 7,12, 1H; d., 7,05, J=2,3 Hz, 1H; d., 7,62 m.h., J=2,3 Hz, 1H) metoksi qrupu xarakterizə edən siqnalla yanaşı, maddənin furokumarin berqaptenin quruluş formulu ilə eyni quruluşa malik olduğunu göstərir.

**Maddə Bk-2.** Xromatoqrafiya sütununun benzolla elyusiya olunmuş 14-cü fraksiyasından alınan kristallik maddənin etanoldan təkrar kristallaşdırıldıqdan sonra element tərkibi $C_{16}H_{14}O_4$, ə.t. 108-109°C olmuşdur.

İQ-spektrdə δ-lakton tsiklinin karbonil –C=O qrupunu (1730 $sm^{-1}$) və aromatik sistemin –C=C– rabitələrini (1630, 1615, 1580, 1550 $sm^{-1}$) xarakterizə edən udulma zolaqları mövcuddur ki, bu da birləşmənin furokumarinlər qrupuna aid olduğunu göstərir.

Maddənin $^1H$ NMR-spektrində aydınlaşan hər birinin sahəsi 3H olan iki sinqlet (1,62 və 1,73 m.h.), sahəsi 2H olan dublet (4,87 m.h., J=6,10 Hz) və sahəsi 1H olan triplet (5,52, J=6,10 Hz) uyğun olaraq iki vinil metil qrupunun (2$CH_3$–CH=), heteroatomlu (oksigenlə birləşmiş) metilen (–O–$CH_2$–) və olefin qruplu (–CH=) yan zəncirdən ibarət efir qrupunun (–O–$CH_2$–CH=C$(CH_3)_2$) olduğunu sübut edir.

Spektrin zəif maqnit sahəsində müəyyən olunan hər birinin sahəsi 1H olan iki dublet (6,23, J=10,0 Hz və 8,10 m.h., J=10,0 Hz), sinqlet (7,10 m.h., 1H), dublet siqnallar (6,93 və 7,58 m.h., J=2,1 Hz, hər biri 1H) uyğun olaraq molekulun H-4, H-3, H-8, H-2′ və H-3′ vəziyyətlərdəki protonlarına aid edilmişdir.

Beləliklə, tədqiq olunan maddənin (Bk-2) İQ- və $^1H$ NMR-spektrlərinin aşkarlanmasından alınan nəticələr birləşmənin izoimperatorinin quruluşuna malik olduğunu göstərir. Bk-2 maddəsinin İQ-spektri izoimperatorin nümunəsinin İQ-spektri ilə eynidir (Серкеров и Алескерова, 2006).

**Maddə Bk-3.** Xromatoqrafiya sütununun benzolla elyusiya olunan 16-cı fraksiyasından alınan kristallik maddənin spirtdən təkrar kristallaşdırıldıqdan sonra element tərkibi $C_{16}H_{14}O_5$, ə.t. 141-143°C olmuşdur.

İQ-spektri (1735, 1630, 1610, 1590 $sm^{-1}$) furokumarinlər qrupu birləşmələrin İQ-spektrlərinə çox oxşayır (Серкеров и Алескерова, 2006).

Tədqiq olunan birləşmənin $^1H$ NMR-spektrində iki metil qrupunun (s., 1,30 və s., 1,40 m.h.), epoksi tsiklin karbon atomuna birləşmiş protonu xarakterizə edən kvartet (3,20 m.h., $J_1$=4,14, $J_2$=6,43 Hz), hər birinin sahəsi 1H olan iki kvartet (4,40 və 4,60 m.h., $J_1$=4,14, $J_2$=11,03 Hz) oksigenlə rabitədə olan metilen qrupuna aid edilmişdir. Qeyd etdiyimiz siqnallar molekulda




şəklində sadə efir qrupundan ibarət yan zəncirin olmasını sübut edir.

Spektrin zəif maqnit sahəsində aydınlaşan hər birinin sahəsi 1H olan dublet siqnallar (6,25, J=9,50 Hz və 8,15 m.h., J=9,50 Hz; 6,95, J=2,10 Hz və 7,60 m.h., J=2,10 Hz) və sinqlet (7,15 m.h.) uyğun olaraq furokumarinin quruluşunun C-3, C-4, C-2′, C-3′ və C-8 vəziyyətlərinin protonlarına aid edilmişdir.

İQ- və $^1H$ NMR-spektrlərinin aşkarlanmasından alınan nəticələr tədqiq etdiyimiz maddənin (Bk-3) quruluş formulu oksipeysedaninin quruluş formulu ilə eyni quruluş formuluna malik olduğunu sübut edir.

**Maddə Bk-4.** Xromatoqrafiya sütununun benzol+xloform (3:1) qarışığı ilə elyusiya edilən 21-22-cı fraksiyalarından alınan kristallik maddənin sulu etanoldan təkrar kristallaşdırıldıqdan sonra element tərkibi $C_{16}H_{16}O_6$, ə.t. 133-135°C olmuşdur.

Maddənin İQ-spektrində hidroksil qruplarının (3400 $sm^{1}$), δ-lakton tsiklinin karbonil qrupunun (1720 $am^{-1}$) və furokumarin nüvəsinin (1620, 1610, 1585, 1555 $sm^{-1}$) udulma zolaqları aydınlaşmışdır.

Birləşmənin $^1H$ NMR-spektrində (Şəkil 2) aydınlaşan hər birinin sahəsi 3H olan iki sinqlet (1,30 və 1,40 m.h.), sahəsi 1H olan 2 kvartet (4,45, 1H və 4,55 m.h., $J_1$=3,22, $J_2$=11,03 Hz), dublet (3,95 m.h., J=3,22 Hz, 1H) və sahəsi 1H olan iki sinqlet (2,35 və 3,10 m.h.) tədqiq olunan maddənin molekulunda




şəklində sadə efir qrupundan ibarət yan zəncirin olmasını göstərir.

Spektrin zəif maqnit sahəsində aydınlaşan dörd dublet (6,30, J=9,65 Hz; 8,20, J=9,65 Hz, 1H; 7,00, J=2,10 Hz, 1H; 7,60 m.h., J=2,10 Hz) və sinqlet (7,15 m.h., 1H) siqnallar kimyəvi sürüşmələrin qiymətlərinə və həmçinin xarakterinə görə oksipeysedaninin furokumarin hissəsinin siqnallarına (uyğyn olaraq H-3, H-4, H-2′, H-3′ və H-8) olduqca yaxındır. Məhz buna görə də zənn etmək olar ki, tədqiq olunan maddə (Bk-4) oksipeysedaninin yan zəncirində olan epoksi-qrupuna 1 molekul suyu birləşdirərək alınmış hidroksilli törəməsidir, yəni oksipeysedanin hidrat ilə eynidir. Bu nəzəri müddəanı kimyəvi metodla sübut etmək üçün oksipeysedanini (Bk-3) 1%-li sulfat turşusunun sulu-spirtli məhlulunda su hamamı üzərində qaynadaraq oksipeysedaninin hidroksilli törəməsinə çevirmişik. Nəticədə element tərkibi $C_{16}H_{16}O_6$, ə.t. 133-135 olan törəmə – oksipeysedanin hidrat alınmışdır.

Törəmənin İQ-spektrində hidroksil qruplara (3400 $sm^{-1}$), δ-lakton tsiklinin C=O qrupuna (1720 $sm^{-1}$) və aromatik sistemin ikiqat rabitələrinə (1620, 1610, 1585, 1555 $sm^{-1}$) aid udulma zolaqları müəyyən edilmişdir.

Törəmənin $^1$H NMR-spektrində aydınlaşan sinallar: 1,30 (s.), 1,40 (s.) $2CH_3$–; 2,35 (s.), 3,05 (s.) 2OH–; 4,45 (k.), 4,55 (k.) $–CH_2–O–$; 3,95 (d.) –CH–OH; 6,30 (d.) –CH=; 8,20 (d.) –CH=; 7,00 (d.) –CH=; 7,60 (d.) –CH=; 7,15 (s.) m.h. –CH= Bk-4 maddəsi – oksipeysedanin hidratın $^1$H NMR-spektrindəki uyğun siqnallarla eynidir.

Beləliklə, Bk-4 maddəsinin İQ- və $^1$H NMR-spektrlərinin aşkarlanmasından alınan nəticələr, həmçinin oksipeysedanindən kimyəvi metodla oksipeysedanin hidratın alınması və sonuncunun spektral (İQ-, $^1$H NMR) parametrlərinin Bk-4 maddəsinin eyni parametrləri ilə müqayisəsi tədqiq etdiyimiz Bk-4 maddəsinin oksipeysedanin hidratla eyni quruluş formuluna malik olmasını göstərir. Maddə Bk-4-ün oksipeysedanin hidrat nümunəsi ilə qarışığının ərimə temperaturu depressiya vermir.

Hər bir növü tərkibində bitki orqanizmində gedən biosintez proseslərinin məhsulları olan, bir-birilə biogenetik qohumluq əlaqələri ilə bağlı ikinci sintez mənşəli bioloji fəal maddələr saxlayır. Bu qohumluq əlaqələri nəinki növ daxilində, hətta cins daxilində də mümkündür (Серкеров, 2005).

Tərkibindəki bioloji fəal maddələr arasında qarşılıqlı qohumluq əlaqələri *Bilacunaria microcarpa* növü furokumarinlərində aydın görünür. Belə ki, bitkinin tərkibində müəyyən olunmuş birləşmələr (berqapten, izoimperatorin, oksipeysedanin və oksipeysedanin hidrat) eyni karbon skeletli olub bir-birindən ancaq yan zəncirin xarakteri ilə fərqlənən oksidləşmə-reduksiya proseslərinin məhsullarının olmasını göstərir.

İzoimperatorin oksidləşdirici reagentlərin (perbenzoy turşusu, hidrogen peroksid və s.) təsirindən oksipeysedaninə, oksipeysedanin isə sulfat və xlorid turşuları (1:1) qarışığının təsirindən oksipeysedaninin hidratına çevrilir.




**Şəkil 1.** Bk-1 maddəsinin $^1$H NMR-spektri (həlledici $CDCl_3$)




**Şəkil 2.** Bk-4 maddəsinin $^1$H NMR-spektri (həlledici $CDCl_3$)

**_Bilacunaria microcarpa_ (Bieb.) M.Pimen. ex Tichomirov növü kumarin törəmələrinin qarşılıqlı biogenetik qohumluq əlaqələrini göstərən sxem**




Oksipeysedanini qatı sulfat və buzlu sirkə turşularının qarışığı ilə işlədikdə berqaptola çevrilir. Sonuncunun metanolda məhlulu sulfat turşusu mühitində qızdırıldıqda berqapten alınır (yuxarıdakı sxemə bax).

Beləliklə, sxemdə yer alan çevrilmələr *Bilacunaria microcarpa* bitkisinin tərkibindəki furokumarinlərin törəmələrinin arasında növdaxili biogenetik qarşılıqlı qohumluq əlaqələrinin olmasını sübut edir.

## ƏDƏBİYYAT

**İbadullayeva S.C.** (2005) Azərbaycan florasının Kərəvizkimilər – *Apiaceae* Lindl. fəsiləsi (bitki ehtiyatşünaslığı üzrə). Biol. elm. dokt. ... dis. avtoreferatı. 51 s.

**Qasımova G.Q., Sərkərov S.V.** (2011) *Heracleum pastinacifolium* C.Koch. növünün kumarin törə-

mələri. Azərbaycan Əczaçılıq və Farmaterapiya Jurnalı, **1:** 26-30.

**Qurbanova F.Q., Sərkərov S.V.** (2011) *Seseli transcaucasicum* (Schischk.) M.Pimen. et Sdobn. növünün bəzi komponentləri haqqında. Azərbay-can Əczaçılıq və Farmaterapiya Jurnalı, **№1:** 31-33.

**Абышев А.З., Агаев Э.М., Керимов Ю.Б.** (2003) Химия и фрамкология природных кумаринов. Баку: 112 с.

**Ахундов Г.Ф.** (1955) Род *Hippomaratum* Hoffm. et Link. В кН.: Флора Азербайджана. Изд. АН Азерб. ССР, **VI:** 413-415.

**Кузнецова Г.А.** (1967) Природные кумарины и фурокумарины. Л.: Наука, 248 с.

**Никонов Г.К.** (1959) Фурокумарины как группа веществ растительного происхождения с противораковой активностью. Труды ВНИИ Лекарственных и ароматических растений, **вып. XI:** 180-201

**Серкеров С.В.** (2005) Терпеноиды и фенолпроизводные растений семейств *Asteraceae* и *Apiaceae*. Баку. CBS Production: 312 с.

**Серкеров С.В., Алескерова А.Н.** (2006) Инфракрасные спектры и строение сесквитерпеновых лактонов и кумаринов. Баку. CBS Production: 223 с.

**Цетлин А.А., Никонов Г.К., Шварев И.Ф. и др.** (1965) К вопросу о противоопухолевой активности природных кумаринов. Растительные ресурсы, **вып. 4:** 507-511.

**Iranshahi M., Sahebkar A., Takasaki M., Konosima T., Tokuda H.** (2009) Cancer chemopreventive activity of prenilated coumarin, umbelliprenin *in vivo*. European Journal of Cancer Prevention, **18 (5):** 412-415.

## Химическое Исследование Корней Вида *Bilacunaria microcarpa* (Bieb.) M.Pimen. ex V.Tichomirov

**Н.Х. Микаилова, С.В. Серкеров**

*Институт ботаники НАНА*

Из корней растения *Bilacunaria microcarpa* (*Apiaceae*) в отдельности выделены четыре производных фурокумарина ($C_{12}H_8O_4$, т.пл. 188-190°C; $C_{16}H_{14}O_4$, т.пл. 108-109°C; $C_{16}H_{14}O_5$, т.пл. 141-143°C; $C_{16}H_{16}O_6$, т.пл. 136-137°C). Определены химические формулы исследуемых веществ на основе результатов расшифровки ИК- и $^1$H ЯМР-спектров, и доказано, что назначенные формулы совпадают с бергаптеном, изоимператорином, оксипеуцеданином и оксипеуцеданин гидратом, соответственно.

***Ключевые слова:*** *Bilacunaria microcarpa, кумариновые производные, ИК-, $^1$H ЯМР-спектроскопия, химический сдвиг, спин-спиновое взаимодействие, внутренний стандарт, тетраметилсилан*

## Chemical Study Of The Roots Of *Bilacunaria microcarpa* (Bieb.) M.Pimen. ex V.Tichomirov

**N.Kh. Mikailova, S.V. Serkerov**

*Institute of Botany, ANAS*

Four derivatives of furocoumarins ($C_{12}H_8O_4$, m.p. 188-190°C; $C_{16}H_{14}O_4$, m.p. 108-109°C; $C_{16}H_{14}O_5$, m.p. 141-143°C; $C_{16}H_{16}O_6$, m.p. 136-137°C) have been isolated from the roots of *Bilacunaria microcarpa* (*Apiaceae*). On the basis of the interpretation of IR- and $^1$H NMR spectra the were identified the chemical formulas of studied substances, and it was proved that these substances are bergapten, izoimperatorin, oxypeucedanin and oxypeucedanin hydrate, respectively.

***Key words:*** *Bilacunaria microcarpa, coumarin derivatives, IR-, $^1$H NMR-spectroscopy, chemical shift, spin-spin interaction, internal standard, tetramethylsilane*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 68, №3, səh. 131-136 (2013)*

# Динамика Процессов Гумусообразования И Запасов Энергии В Гумусе Разновозрастных Почв Крымского Полуострова

**Е.И. Ергина**

*Таврический национальный университет имени. В.И. Вернадского, Пр. Вернадского, 4, Симферополь, Украина; E-mail: YazcivLena@rambler.ru*

**Определены основные закономерности динамики содержания и запасов гумуса в разновозрастных педоэкосистемах. Установлено, что с возрастом скорости гумусонакопления уменьшаются и содержание гумуса в почвах после достижения ими возраста 1500 лет стабилизируется. Определены значения и практические результаты оценки энергетики гумуса почв, формирующихся на различных почвообразующих породах.**

***Ключевые слова***: *гумус, запасы гумуса, скорости гумусообразования, энергия гумуса*

## ВВЕДЕНИЕ

Взаимодействие факторов почвообразования при экспонировании на поверхность почвообразующих пород вызывает у них комплекс структурных, физических, химических превращений, среди которых ведущим процессом является формирование почвенного профиля и запасов в нем гумусового вещества. Благодаря этим специфическим педоморфным процессам диагностируется почвообразование в молодых педосистемах.

Очевидно, что на участках с вновь экспонированными почвообразующими субстратами необходимо время для начала процесса почвообразования – лаг запаздывания – это время, когда формируются первичные биоценозы с пионерными растительными группировками, а гумусового профиля еще нет. По нашим наблюдениям длительность этого времени незначительна, а порой процессы формирования растительного покрова и гумусового горизонта проходят параллельно, особенно в случаях, когда почвообразующий субстрат имеет первичное плодородие.

Мозаичность условий почвообразования на разных территориях приводит порой к противоречивым данным, которые диагностируют и описывают процесс формирования гумуса на начальных этапах почвообразования (Абакумов, 2008). Так, анализ литературы свидетельствует о том, что для двухлетних почв Приморья характерно отсутствие органогенных горизонтов, количество гумуса составляет 0,25 %, в почвах 5-летнего возраста также содержание гумуса незначительное до 0,95 % и резко уменьшается по профилю. Через 13 лет формируется гумусово-аккумулятивный профиль с содержанием гумуса 1,1 % (Комачкова, 2009). В зоне лесостепи отмечается, что содержание гумуса сильно отличается в зависимости от биолитологических условий почвообразования: имеет низкие значения в песчаных почвах, средние – в суглинистых и глинистых, высокие – в почвах на меловых породах, там же отмечается, что содержание гумуса в горизонтах $A_1$ и $A_1B$ новообразованных почв становится близким к фоновому уровню уже через 25 лет, но со значительными различиями в качественном составе гумуса (Голеусов и др., 2005). Мы объясняем этот факт термодинамическими свойствами почвообразующих пород молодых техногенных геосистем. Ведь минеральная часть породы характеризуется меньшей энергией кристаллической решетки, меньшим значением энтропии, большими запасами свободной энергии Гиббса, и, как следствие, большей энергией химических реакций, следовательно и почвообразовательной способностью в сравнении с полноголоценовыми аналогами (Ергина, 2013).

Г.И.Махонина в своих исследованиях обнаружила как количественные, так и качественные особенности в накоплении гумуса в зависимости от биологических характеристик опада. Больше его скапливается под злаками и бобовыми видами, и меньше – под разнотравьем. Под лиственными древесными породами гумуса образуется больше, чем под хвойными, при этом непосредственно у ствола дерева его больше, чем у края проекции крон, что связано с особенностями распределения массы опада (Махонина и др., 2001). На процессы гумусонакопления влияет и гранулометрический состав пород. С увеличением доли илистых частиц в почвах растет и содержание гумуса. Влияние химического состава пород в отвалах проявляется в большем накоплении гумуса (при прочих равных условиях) на породах, обогащенных кальцием, и наименьшим –

C.Mey. (= *C. meyeri*), *C. monogyna*), "Флора Кавказа" (11), "Флора Азербайджана" (1954) və "Azərbaycanın ağac və kolları" (1970) kitablarında isə altı (*C. orientalis* , *C. szovitsii* , *C. meyeri C. Caucasica,C. pseudoheterophylla* , *C. kyrtostyla* ) növünün yayılması haqqında məlumatlar verilmişdir. Eyni məlumatlar sonrakı dövrlərdə nəşr olunan əsərlərdə (Məmmədov və b., 2000, Асадов и др., 2001) də öz əksini tapmışdır.

Azərbaycan yemişanlarını tədqiq edən T.A. Qasımova (Касумова, 1991) Naxçıvan MR ərazisində 13 növ (*C. atrosanguinea, C. armena, C. caucasica, C. cinovskisii, C.curvisepala* (= *C.kyrtostyla*), *C. meyeri, C. pojarkovae, C. pontica, C. pseudoheterophylla, C. szovitsii, C. tournefortii, C. zangezura*) müəyyənləşdirmişdir ki, bu da Azərbaycan florasına daxil olan ümumi növlərin (19 növ) böyük əksəriyyətini təşkil edir.

*Crataegus* cinsinə daxil olan növlərin son sistematik tərkibi T.H. Talıbov və Ə.Ş. İbrahimov (2008) tərəfindən nəşr olunmuş "Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri" kitabında verilmişdir. Müəlliflər tərəfindən ərazidə yemişanın 20 növü qeyd edilmişdir ki, bunlardan da 15-nə - *C. armena, C. caucasica, C. cinovskisii, C. curvisepala, C. eriantha, C. meyeri, C. monogyna, C. orientalis, C. pallasii, C. pentagyna, C. pojarkoviae, C. pontica, C. pseudoheterophylla, C. szovitsii, C. zangezura* - yabanı halda, *C. chlorocarpa, C. ferganensis, C. sanguinea, C. songarica, C. turkestanica* kimi 5 növünə isə mədəni şəraitdə rast gəlinir. Lakin T.A. Qasımova tərəfindən ərazi üçün göstərilmiş *C. atrosanguinea* və *C. tournefortii* növləri taksonların təyinatındakı şübhəli cəhətlərə görə kitabda öz əksini tapmamışdır. Halbuki, bu növün muxtar respublika ərazisində yayılması haqqında T.H. Talıbovun "Naxçıvan MR-in flora biomüxtəlifliyi və onun nadir növlərinin qorunması" (Talıbov, 2001) kitabında ətraflı məlumat verilmişdir.

*Crataegus* cinsinin Cənubi Qafqazda yayılan yabanı növləri haqqında məlumat verən M.B. Sarkisyan (Саркисян, 2011) da Turnefor yemişanının (*C. tournefortii* ) yayılma zonasının Naxçıvam MR ərazisi olduğunu göstərir.

Göründüyü kimi müxtəlif vaxtlarda aparılmış tədqiqat işlərinin nəticələrində və ədəbiyyat məlumatlarında muxtar respublika ərazisində yayılmış *Crataegus* cinsinə daxil olan növlər haqqında məlumatların olmasına baxmayaraq, onların növ tərkibi hələ də dəqiqləşdirilməmiş olaraq qalmaqdadır.

Yemişanların Naxçıvan MR florasında hazırki vəziyyətini aydınlaşdırmaq məqsədilə AMEA Botanika İnstitutunun, AMEA Naxçıvan Bölməsi Bioresurslar İnstitutunun, Naxçıvan Dövlət Universitetinin herbari fondlarında saxlanılan herbarilərə diqqət yetirilmiş, internet saytlarında yerləşdirilmiş müxtəlif İnstitut və təşkilatlara aid herbari nümunələrinin şəkilləri müqayisəli təhlil edilmiş və 2004-2013-cü illərdə çöl tədqiqatları həyata keçirilməklə *Crataegus* cinsinin növ tərkibi dəqiqləşdirilmişdir.

*Crataegus* cinsinin R.A.Ufimov (Уфимов, 2011, 2013) tərəfindən verilmiş sistemində bölmələrin həcmi və tərkibi yenidən nəzərdən keçirilmiş və Naxçıvan Muxtar Respublikası ərazisində yayılmış yemişanların sistematik tərkibi müəyyənləşdirilmişdir.

Növlərin areallarının müəyyənləşdirilməsində "Ареалы деревьев и кустарников СССР" (1980) kitabından istifadə edilmişdir.

Beləliklə, müəyyən olunmuşdur ki, Muxtar Respublika ərazisində *Crataegus* cinsinə aid 17 növ məlumdur ki, onlar da əsasən *Crataegus, Pentagynae* və *Azaroli* şöbələrində cəmlənmişlər.

**Genus *Crataegus* L.,** L. 1753, Sp. Pl. 1: 475, p.p. – **Yemişan**

Typus: *Crataegus rhipidophylla* Gandoger (= *Crataegus oxyacantha* L., nom.rejic.)

**Sect. 1. *Crataegus*** - sect. *Oxyacantha* Loud. 1838, Arbor Fruit. Brit. 2: 829; Пояркова 1939, Фл. СССР 9: 436. - sect. *Oxyacanthae* Zabel ex C.K.Schneider 1906, Ill. Handb. Laubholzk 1:768.

Böyük olmayan ağac və ya koldur. Tikanları qısadır və ya tamamilə yoxdur. Yarpaqları yumurtavari, tərsyumurtavari və ya uzunsov-yumurtavari olub, bölümlü və ya nadir hallarda dilimlidir. Qaidəyə yaxın hissədən paz və ya rombvari daralmışdır. Yarpaq saplaqları ayadan 4 dəfə qısadır. Çiçək qrupu çox çiçəkli olub, qalxanlarda yerləşmişdir, bəzən isə sadə və ya dağınıqdır. Çiçək saplaqları çılpaq və ya tükcüklüdür, nadir hallarda sıx tükcüklüdür. Tozcuqları çəhrayı və ya tünd qırmızıdır. Çox da iri olmayan meyvələri ellipsvari və ya kürəşəkilli, bəzən silindr şəklində olub, açıq qırmızıdan tünd qırmızımtıl-qara rəngə kimi dəyişəndir, 1-2 (3) toxumludur. Toxumlar qarın tərəfdən nisbətən batıq olub, demək olar ki, hamar, üst tərəfdən isə dərin olmayan uzununa 1-3 şırımlıdır. Meyvə ləti sarımtıl olub, şirəlidir.

Тип: *C. rhipidophylla* Gand.

***C. atrosanguinea* Pojark.** 1939, Фл. СССР 9, Addenda 8: 504; Гроссгейм 1949, Опред. раст. Кав к.: 76; idem, 1952, Фл. Кавк. (2 изд.), 5: 43; Полетико 1954, Дер. и куст. СССР 3: 549; Федоров 1958, Фл. Арм. 3: 299; Прилипко 1965, Дендрофл. Кавк. 4: 149; Riedl 1969, Fl. Iran. 66: 59; Browicz 1972, Fl. Turk. 4: 142; Тахтаджян и Федоров 1972, Фл. Ерев.: 146; Khatamsaz 1992, Fl. of Iran 6: 256; - *C.*

*ambigua* subsp. *ambigua* (auct. non Meyer ex Becker) Christensen 1992, Syst. Bot. Monogr. 35: 73, p. min. p., excl. typ. – **Qanqırmızı yemişan**

Hündürlüyü 8-10 (12) m-ə çatan ağacdır. May-iyun aylarında çiçəkləyir, sentyabr-oktyabrda meyvələri yetişir. Meyvələri 1,2-1,8 sm diametrində olub, dəyirmidir, tünd-qırmızı rəngdədir. Lətli və şirəlidir. Meyvədə tumların sayı 2 ədəddir. 2n (3x) = 51.

Тип: «Армения, сел. Норк близ Еревана, 14.10.1937, n 380, А.Пояркова», holo.: LE., iso.: LE.

**Yayılması:** Kəngərli rayonunun Çalxanqala kəndi ətrafı, üzüm bağları arasındakı sahələrdə, Babək rayonunun Cəhri, Ordubad rayonunun Nüsnüs kəndləri ətrafındakı ərazilərdə, aşağı və orta dağlıq qurşaqlarda dəniz səviyyəsindən 800–1800 m hündürlükdə dağların yamaclarında, çayların kənarlarında və dərələrdə, kolluqlar arasında yayılmışdır.

**Ümumi yayılması:** Cənubi Qafqaz, Türkiyənin şərqi, Mərkəzi və Şimali İran.

K.İ. Kristensenin tədqiqatlarında (Christensen, 1992) *C. atrosanguinea* növü *C. ambigua* subsp. *ambigua* Meyer ex Becker növünün sinonimi kimi vermişdir. Lakin aparılan təhlillər nəticəsində məlum olmuşdur ki, bunlar müxtəlif növlər olub, bir-birlərindən aydın nəzərə çarpan əlamətlərinə görə fərqlənirlər. Belə ki, *C. atrosanguinea* növündə yarpaqlar iri olub, yaşılımtıldır, hamar kənarlıdır, yalnız yarpağın zirvəsində az miqdarda iri dişciklər yerləşmişdir. Meyvələri 2 toxumludur. *C. ambigua* növündə isə yarpaqlar tünd yaşıl olub, dişciklidir və dişciklər yarpaq ayasının ortasından başlayaraq zirvəsinədək davam edir. Ədəbiyyat materiallarında (Christensen, 1992) və Sankt-Peterburqda saxlanılan (LE) herbari nümunələrində *C. ambigua* növünün meyvələrində toxumların sayı 1-2 (3) ədəd göstərilir.

**2. *C. armena* Pojark.** 1939, Фл. СССР, 9, Addenda 8: 509 (*Crataegus meyeri*. *Crataegus rhipidophylla*); Федоров 1958, Фл. Арм. 3: 300; Полетико 1954, Дер. и куст. СССР 3: 552; Прилипко 1965, Дендрофл. Кавк. 4: 151; Riedl 1969, Fl. Iran. 66: 62; Khatamsaz 1992, Fl. of Iran 6: 266; Christensen 1992, Syst. Bot. Monogr. 35: 138. – **Erməni yemişanı**

Hündürlüyü 2-2,5 m olan kiçik ağac və ya koldur. İyun ayında çiçəkləyir, sentyabr-oktyabrda meyvələri yetişir. Meyvələri 1,0-1,2 sm diametrində olub, uzunsov ellipsvari, açıq qırmızı rəngli və şirəlidir. Meyvə ləti sarıdır, adətən bir, bəzən 2 toxumludur. 2n (3x) = 51.

Тип: «Армения, Мегринский район, с. Личк, на каменистом склоне с кустарниками, по краю Мегринской дороги. 01.10.1936, n 754. А.И. Пояркова», holo.: LE, iso.: LE.

**Yayılması:** Şahbuz rayonunun Qızıl Qışlaq kəndi ətrafı çınqıllı-daşlı yamaclarda və Bişənək meşəsində aşağı, orta və yüksək dağlıq qurşaqlarda dəniz səviyyəsindən 800 – 2000 (2200) m hündürlüklərdə,arid seyrək meşəliklərdə və kolluqlar arasında rast gəlinir.

**Ümumi yayılması:** Cənubi Qafqaz, Şimali İran.

*C. armena* növü Azərbaycan florasına T.A. Qasımova tərəfindən (Касумова, 1983) Şahbuz rayonunun Biçənək meşəsindən (20.X.1980) və Qızıl Qışlaq kəndi (10.X.1980, daşlı-çınqıllı yamaclar) ətrafından toplanılmış nümunələrə əsasən daxil edilmişdir.

A.İ. Poyarkovanın fikrincə (Пояркова, 1939) bu növ hibridogen mənşəli olub, *C. kyrtostyla* və *C. meyeri* növlərinin çarpazlaşmasından yaranmışdır. A.A. Qrossheym (Гроссгейм, 1949, 1952) də *C. armena* növünü müstəqil növ kimi qəbul etməyərək, onu hibrid növlər sırasına daxil edirdi. An.A. Fyodorov (Федоров, 1958) isə A.A. Qrossheymin fikirləri ilə razılaşmayaraq, "erməni yemişanının hibrid mənşəli olduğu tamamilə sübut edilməmişdir" ideyasını əsas gətirərək bu növü sərbəst növ kimi qəbul etməyi daha düzgün hesab etmişdir. A.İ. Kristensen (Christensen, 1992) də bu növü *C. meyeri* və *C. monogyna* növlərinin hibridləşməsindən əmələ gəldiyini hesab edirdi. Belə ki, erməni yemişanında çiçəkləyən zoğlarda aşağıda yerləşən yarpaqların dilimləri *C. monogyna* növündə olduğu kimi 1-5 dişciklidir. *C. kyrtostyla* növündə isə dişciklərin sayı 6-16 arasında dəyişilir.

Bundan başqa *C. armena, C. monogyna* və *C. meyeri* növlərinin çiçəkyanlıqlarında da çox böyük oxşarlıqlar vardır. Belə ki, erməni yemişanının çiçəkləyən zoğlarında çiçəkyanlığı daha çox biryuvali olub, Meyer yemişanının çiçəkyanlığına oxşayır.

M.V. Sarkisyan (Саркисян, 2011) tərəfindən aparılan araşdırmalar zamanı qeyd edilir ki, Ermənistan ərazisində *C. monogyna* növünə rast gəlinməmişdir və bununla əlaqədar ərazidə bu günə kimi heç bir introduksiya işləri də aparılmamışdır. Müəllif, həmçinin *C. monogyna* növünün Naxçıvan MR və İran ərazilərində də yayılmasına şübhə ilə yanaşır, bu səbəbdən də *C. monogyna* növünün *C. meyeri* ilə çarpazlaşması baş verə bilməz. Yarpaq dilimlərində dişciklərin sayı və çiçəkyanlıqlarının oxşar əlamətlərə malik olmasına gəldikdə isə, *C. armena* növünün hibrid mənşəli olduğunu nəzərə alsaq. dəyişilməsi normal qəbul edilməlidir. M.V. Sarkisyan da A.İ. Poyarkovanın fikirləri ilə razılaşaraq erməni yemişanının *C. meyeri* və *C. rhipidophylla (C. kyrtostyla)* növlərinin hibridi olmasını təsdiq edir.

**3. *C. caucasica* C. Koch** 1853, Verh. Ver.

Beford. Gartenb. Konigl. Preuss. Staaten, N. R. 1: 286; idem 1854, Crat. et Mespilus: 66; Пояркова 1939, Фл. СССР 9: 447; Сосновский 1949, Фл. Груз. 5: 360 (georg.); Гроссгейм 1949, Опред. раст. Кавк.: 76; idem, 1952, Фл. Кавк., изд. 2, 5: 42; Прилипко 1954, Фл. Азерб. 5: 73; Полетико 1954, Дер. и куст. СССР 3: 549; Федоров 1958, Фл. Арм. 3: 299; Кутателадзе 1964, Опред. раст. Груз. 1: 109 (georg.); Прилипко 1965, Дендрофл. Кавк. 4: 149; Riedl 1969, Fl. Iran. 66: 59; Мугбаниани 1980, Фл. Груз. 6: 89 (georg.); Christensen 1992, Syst. Bot. Monogr. 35: 69.- *C.oxyacantha* L. var. *caucassica* (K.Koch) Boiss. 1872, Fl. Or. 2: 664; Липский 1899, Фл. Кавк.: 297; Медведев 1919, Дер . и куст. Кавк.: 112.- *C. oxyacantha* auct. non L.: Ledeb. 1843, Fl. Ross. 2: 89.- **Qafqaz yemişanı**

Hündürlüyü 5-7 m olan ağac və ya koldur. May ayında çiçəkləyir, sentyabr-oktyabrda meyvələri yetişir. Meyvələri 1,0-1,3 sm diametrində olub, yumurtavari- dəyirmidir, yetişəndə qaramtıl - bənövşəyi rəngdə olub, üzərində açıq nöqtələr görünür. Meyvə ləti sarıdır, adətən 2 toxumludur. 2n (3x) = 51.

Тип: (Caucasus, Wilhelms s. n., утрачен).- Неотип был выделен Riedl, 1969, Fl. Iran. 66: 59: «Азебайджан, окр. г.Кировабада. Каменистый склон с редкими кустарниками, близ устья реки Мал. Кюрай-чай (пониже с. Чайкенд) 27.09.1937, leg. et det. Пояркова , № 288», LE!

**Yayılması:** AMEA Botanika İnstitutunun Herbari fondunda saxlanılan nümunələrdə Ordubad rayonunun Bist və Şahbuz rayonunun Biçənək kəndləri ətrafından toplanıldığı göstərilmişdir. Aparılan araşdırmalar zamanı bu növə Ordubad rayonunun Nəsirvaz, Nürgüt kəndləri ətrafında,aşağı və orta dağlıq qurşaqlarda dəniz səviyyəsindən 800 – 1800 m yüksəkliklərdə arid seyrək meşəliklərdə, çayların, dərələrin quru daşlı yamaclarında, meşə kənarlarına yaxın kolluqlar arasında tək-tək və ya qruplarla bitir

**Ümumi yayılması:** Cənubi Qafqaz, Talış, İran.

**4. *C. eriantha* Pojark.** 1939, Фл. СССР 9, Addenda 8: 500; Гроссгейм 1949, Опред. раст. Кавк.: 76; idem, 1952, Фл. Кавк. изд. 2, 5: 42; Прилипко 1954, Фл. Азерб. 5: 73; Полетико 1954, Дер. и куст. СССР 3: 546; Прилипко 1965, Дендрофл. Кав к. 4: 148. - *C.pectinata* auct. Non Bosc.: C.A.Mey. ex Hohen. 1838, Enum. Pl. Talysch: 330, p. p.; Ledeb.1843, Fl. Ross. 2: 91, p.p.- *C.melanocarpa* β *heterophylla* Boiss. 1872, Fl. Or. 2: 662, p. p.; Липский 1899, Фл. Кавк.: 297. - *C. meyeri* Pojark. Christensen 1992, Syst. Bot. Monogr. 35: 59 (p. min. p.) - **Tükcüklüçiçək yemişan**

3-5 m hündürlüyündə ağac və ya koldur. May-iyun ayında çiçəkləyir, sentyabr- oktyabr ayında meyvələri yetişir. Meyvələri 2, nadir hallarda isə bir toxumludur.

Тип: «In declvibus prope fluvium Gandscha, disrictus Airum, 01.05.1844. n˚ 1399 Flora Transcauc. Legit. Dr. Koilenati», holo.: LE.

**Yayılması:** Şahbuz rayonunun Biçənək, Kükü, Ayrınc, Ordubad rayonunun Nürgüt, Nəsirvaz və Bist kəndləri ətrafında, aşağı və orta dağlıq qurşaqlarda dəniz səviyyəsindən 800 – 1800 m yüksəkliklərdə dağların daşlı yamaclarında, kol bitkiləri pöhrəliklərində və arid seyrək meşəliklərdə bitir.

**Ümumi yayılması:** Qafqaz, Cənubi Qafqaz endemidir.

*C. eriantha* növü *C. meyeri* növünə yaxın olub, ondan az bölümlü, zəif tükcüklü yarpaqları, nisbətən iri, seyrək, sıx tükcüklü çiçək qrupları ilə fərqlənir. Növün hərtərəfli öyrənilməsinə ehtiyac vardır.

**5. *C. meyeri* Pojark.** 1939, Фл. СССР 9, Addenda 8: 500; Сосновский 1949, Фл. Груз. 5: 360 (georg.); Гроссгейм 1949, Опред. раст. Кавк.: 76; idem, 1952, Фл. Кавк. изд. 2, 5: 42; Прилипко 1954, Фл. Азерб. 5: 72; Полетико 1954, Дер. и куст. СССР 3: 546; Федоров 1958, Фл. Арм. 3: 299; Кутателадзе 1964, Опред. раст. Груз. 1: 109 (georg.); Прилипко 1965, Дендрофл. Кавк. 4: 148; Riedl 1969, Fl. Iran., 66: 58; Browicz 1972, Fl. Turk. 4: 140; Мугбаниани 1980, Фл. Груз. (georg.), 6: 88; Khatamsaz 992, Fl. of Iran 6: 253; Christensen 1992, Syst. Bot. Monogr. 35: 59 p. max p., incl. typ.- *C.pectinata* auct. non Bosc.: C.A.Mey. ex Hohen. 1838, Enum. Pl. Talysch: 130, nom. nud., p. p.; Ledeb. 1843, Fl. Ross. 2, 1: 91, p. p.; Boiss.1872, Fl. Or. 2: 663, p. p.; Гроссгейм 1934, Фл. Кавк. 4: 291. *C.pectinata* Bosc. Липский 1899, Фл. Кавк.: 297. - *C.oxyacantha* var. *pectinata* Schmalh. 895, Фл. Ср . Росс. 1: 350, p. p. - *C.tournefortii* auct. non Griseb.: C.Koch 1854, Crat. et Mesp.: 47. - *C. ambigua* var. *hohenackeri* C.K.Schneider, 1906, Illustr. Handb. Laubh. 1: 785, p. p.- **Meyer yemişanı**

Hündürlüyü 2- 6 (8) m olan ağac və ya koldur. May- iyun ayında çiçəkləyir, sentyabr- noyabr ayında meyvələri yetişir. Meyvələri ovalşəkilli, dəyirmi olub, 1,2- 1,8 sm uzunluqda, tünd qırmızı rəngdə olub, iki, az- az hallarda isə bir toxumludur. 2n (4x) = 68; 2n (3x) = 51.

Тип: «Ереванский р-н. Заросли кустарников на каменистых склонах монастыря Гехар т. 11.10.1936, № 792. А.Пояркова», holo LE.

**Yayılması:** T.A. Qasımova və Q.F. Axundovun tədqiqatlarında Meyer yemişanının yayılma zonası Kəngərli rayonunun Çalxanqala və Şahbuz rayonunun Külüs, Kükü, Kolanı, Güney Qışlaq,Biçənək kəndətrafı əraziləri göstərilmişdir. Aparılan araşdırmalar zamanı *C. meyeri* növünün

Şərur rayonunun Havuş, Şahbuz rayonunun Biçənək kəndləri ətrafında,aşağı, orta və yüksək dağlıq qurşaqlarda 800- 2000 (2200) m hündürlüklərdə daşlı -qayalı yamaclarda, arid seyrək meşəliklərdə və kol pöhrəliklərində tək-tək və ya qrup şəklində bitir. Muxtar respublikanın meşəlik ərazilərində ona bəzən dəniz səviyyəsində 2200 m yüksəkliklərdə meşə talalarında və yolların kənarlarında da rast gəlinir.

**Ümumi yayılması:** Cənubi Qafqaz, Talış, Türkiyə, İran.

Cənubi Qafqazda geniş yayılan bu növ A.A. Qrossheymin “Флора Кавказа“ (1952) kitabında *C. pectinata* C.A.Mey. kimi təsvir edilmişdir. A.İ. Poyarkovaya (Пояркова, 1939) görə bəzi müəlliflər *C. meyeri* növünü 2-3 toxumlu meyvələri olan *C. caucasica*, bəziləri isə hər iki tərəfi sıx tükcüklü yarpaqlara malik *C. orientalis* növləri ilə səhv salırlar.

**6. *C. monogyna* Jacq.** 1775, Fl.Austr. 3:50; Willd. Sp. pl. II, 1799, 2:1006; Ldb. Fl. Ross., II, 1, 89 (ex parte). - *Mespilus monogyna* Willd. Enum. Pl. berol. I (1809) 524. – *Mespilus oxycantha* var. *monogyna* Шмальг. Фл., (1895) 350 (ex parte); уч 1:89; Пoярк., 1939, Фл. СССР, 9:454; Полетико, 1954, Дер. и куст. СССР, 3:554; Franco, 1968, Fl. Europ. 2:429; Цин., 1971, Боярышник. Прибалт., : 95; Browicz 1972, Fl. Turk. 4: 145; Christensen 1992, Syst. Bot. Monogr. 35: 100; 38Fl. Iberica, 1998, 6: 412; Гроссгейм 1949, Опред. раст. Кавк.: 76, idem 1952, Фл. Кавк. изд. 2, 5: 41;

Ağac və ya koldur. İyun ayında çiçəkləyir, meyvələri sentyabrda yetişir. Meyvəsi enli yumurtaşəkilli və ya ellipsvari olub, qəhvəyi-qırmızı rənglidir. 2n= 34.

Tip: Austria, Jacquin s.n., lecto.: BM; isolecto: TO

**Yayılması:** Şahbuz rayonunun Biçənək, Ordubad rayonunun Nəsirvaz və Nürgüt kəndlərinin ətraf ərazilərində, orta və yüksək dağlıq qurşaqlarda 1200- 2000 m hündürlüklərdə arid seyrək meşəliklərdə, daşlı yamaclarda və meşə kənarlarında rast gəlinir.

**Ümumi yayılması:** Cənubi Qafqaz, Kaliningrad, Ukrayna, Krım, Moldaviya, Qərbi Avropa, Skandanaviya (cənubu), Aralıq dənizi.

Polimorfdur. A.İ. Poyarkovaya (Пояркова, 1939) görə rus və avropalı müəlliflər biryuvalı yemişanı *C. kyrtostyla* , növündən fərqləndirmirdilər. Halbuki, *C. kyrtostyla* kiçik, enli, tünd yaşıl yarpaqlarının bölümlülüyünə, kasa yarpaqlarının və dişiciyinin formasına görə *C. monogina* növündən kəskin fərqlənir. Müəllifə görə *C. kyrtostyla* ilə müqayisədə *C. monogina* növü daha dar areala malik olub, keçmiş Sovetlər İttifaqının Avropa hissəsinə (cənub və xüsusiylə şərq rayonlarına) uyğunlaşmışdır və Cənubi Qafqazda yayılması mümkün deyildir. Amma, Cənubi Qafqazda *C. kyrtostyla* x *C. monogina* hibridləşməsindən əmələ gələn növlər mövcuddur. *C. monogina* növünün yayılma zonaları A.A. Qrossheym (Гроссгейм, 1934) tərəfindən Gəncə, Lənkəran və Qarabağ əraziləri göstərilməsinə baxmayaraq, sonralar toplanılan herbari nümunələri *C. curvisepala* (*C. kyrtostyla*) olaraq təyin edilmişdir.

M.V. Sarkisyan (Саркисян, 2011) məlumatlarında *C. pentagyna* növünün Naxçıvan Muxtar Respublikası ərazisində yayılmadığını göstərir.

**7. *C. pallasii* Griseb.** 1843, Spicil. Fl. Rumel. et Bithyn. 1: 89; Trautvetter 1882, Fl. Ross. 1: 279; Пояркова 1947, Рефер . Научн.-иссл. работ Биол. отдел. за 1945г.: 7; idem, 1950, Бот. мат. (Ленингра д) 12: 111; Полетико 1954, Дер. и куст. СССР 3: 553; Вульф 1960, Фл. Крыма, 2: 30; Прилипко 1965, Дендрофл. Кавк. 4: 151; Franco 1968, Fl. Europ. 2: 75; Галушко 1980, Фл. Сев . Кавк. 2: 90; Christensen 1992, Syst. Bot. Monogr. 35: 80. - *C.monogyna* var. *nigra* Pall. 1784, Fl. Ross. 1, 1: 26, tab. XII. - *C. beckeriana* Pojark. 1939, Фл. СССР 9: 505, 453, nom. superfl.- **Pallas yemişanı**

Hündürlüyü 1,5- 3 m olan koldur. May ayında çiçəkləyir, sentyabr- oktyabr ayında meyvələri yetişir. Meyvələri 0,8- 1,0 sm uzunluqda olub, dəyirmidir, tünd qırmızıdır və 1-2 toxumludur.

Тип: «Sarepta, Pallas s. n.», holo.: LE.

**Yayılması:** Şərur rayonunun Axura, Havuş və Sədərək kəndləri ərazilərindəki daşlı-qayalı yamaclarda və seyrək meşəliklərdə tək-tək yayılmışdır. Aparılan araşdırmalar zamanı növə Şahbuz rayonunun Biçənək, Kükü, Ordubad rayonunun Nəsirvaz və Nürgüt kəndlərinin ətrafında, 1200-1800 m d.s. hündürlükdə orta dağlıq qurşaqda quru qayalı yamaclarda, meşə kənarlarında, kol bitkilərinin pöhrəliklərində və qayaların dibində tək-tək bitir.

**Ümumi yayılması:** Avropanın cənub - şərqi, Qafqaz, Dağıstan, Türkiyə.

**8. *C. pseudoheterophylla* Pojark.** 1939, Фл. СССР 9, Addenda 8: 506; Сосновский 1949, Фл. Груз. 5: 361 (georg.); Гроссгейм 1949, Опред. раст. Кавк.: 75; idem, Фл. Кавк. изд. 2, 5: 43; Прилипко 1954, Фл. Азерб. 5: 74; Полетико 1954, Дер. и куст. СССР 3: 556; Федоров 1958, Фл. Арм. 3: 303; Кутателадзе 1964, Опред. раст. Груз., 1: 108 (georg.); Прилипко 1965, Дендрофл. Кавк. 4: 152; Browicz 1972, Fl. Turk. 4: 145; Галушко 1980, Фл. Сев. Кавк. 2: 112 89; Khatamsaz 1992, Fl. of Iran 6:262; Christensen 1992, Syst.Bot. Monogr. 35: 96.- **Yalançı-müxtəlifyarpaq yemişan**

Hündürlüyü 3-6 m olan ağac və ya koldur. May

ayında çiçəkləyir, meyvələri sentyabrda yetişir. Meyvələri 0,7- 1,0 sm uzunluqda olub, enli, yumurtavari və ya enli ellipsvaridir, qəhvəyi-qırmızıdır və bir toxumludur. 2n (4x) = 68.

Тип: «Ереванский р-н, окр. монастыря Гехар т.каменистый склон с кустарниками. 11.10.1936, № 793. А. Пояркова», holo.: LE, iso.: LE.

**Yayılması:** Muxtar respublika ərazisində az yayılan növlərdəndir. T.A. Qasımova və Q.F. Axundovun məlumatında Şahbuz rayonunun Ayrınc, Biçənək, Güney və Qızıl Qışlaq, Babək rayonunu Cəhri, Kəngərli rayonunun Çalxanqala kəndlərin ərazilərində və Ordubad şəhəri ətrafındakı dağətəyi ərazilərdə yayıldığı göstərilmişdir. Araşdırmalar zamanı Şahbuz rayonunun Biçənək, Şərur rayonunun Axura, Havuş və Sədərək rayonunun ətraf ərazilərində, orta və yüksək dağlıq qurşaqlarda 1200- 2000 m hündürlüklərdə dağların daşlı yamaclarında, kol pöhrəliklərində, çayların sahillərində və enliyarpaqlı meşələrin kənarlarında, kolluqlarda da rast gəlinmişdir.

**Ümumi yayılması:** Şərqi Avropa, Qafqaz, Krım, Dağıstan, Türkiyə, Şimali İran, Əfqanıstan.

Gəncə ətrafından toplanılan ilkin nümunələrə əsasən R.Fr. Hokonaker tərəfindən (Пояркова, 1939) *C. pseudoheterophylla* növü kimi təsviri verilməsinə baxmayaraq, O.M. Poletikonun (Полетико, 1954) qeyd etdiyi kimi bəzən dendroloji ədəbiyyatlarda səhv olaraq *C. monogyna* və ya *C. heterophylla* adlandırılmışdır. Lakin, *C. heterophylla* növü yabanı halda İspaniyada yayılmışdır və keçmiş SSRİ məkanında rast gəlinmir. A.İ. Poyarkova qeyd edir ki, ədəbiyyat mənbələrində həm *C. pseudoheterophylla*, həm də *C. kyrtostyla* növləri Qafqaz florası tədqiqatçıları tərəfindən *C. monogyna* olaraq göstərilmiş, ona Krasnodar diyarının Tuapse və Ön Qafqazda rast gəlindiyi qeyd edilmişdir (Федоров, 1958).

Ədəbiyyat məlumatlarında (Саркисян, 2011) yemişanın *C. pseudoheterophylla x C. atrosanguinea = C.* x *C. razdanica* ; *C. pentagyna* x *C. pseudoheterophylla = C. x C. zangezura* növləri ilə hibridləşdiyi qeyd edilir.

**9. *C. rhipidophylla* Gand.** (=*C. curvisepala* Lindm.; *C. kyrtostyla* Pojark.) 1871, Bull. Soc. Bot. France 18: 447; Christensen 1992, Syst. Bot. Monogr. 35: 88; Цвелев 2000, Опр. сосуд. раст. С-З Росии: 457.- *C.oxyacantha* L. 1753, Sp. Pl.: 477, nom. rej. - *C.curvisepala* Lindm. 1918, Svensk Fanerogamfl.: 307 - idem, 1926: 332; Галушко 1980, Фл. Сев. Кавк. 2: 89.- *C. calicina* Peterm. subsp. *curvisepala* (Lindm.) Franco 1968, Feddes Repert. 79: 39; Wiedem. et Weber 1852, Fl. Balt.: 260. - *C. monogyna* var. *rubra* Pall. 1784, Fl. Ross. 1, 1: 26. - *C. laciniata* Steven ex Besser 1822, Enum. Pl. Volhyn.: 56, non *C. laciniata* Ucria, 1793.- *C. monogyna* var. *laciniata* (Besser) Ledeb. 1844, Fl. Ross. 2, 1: 89, non *C. monogyna* var. *laciniata* K. Koch 1853.- *C. kyrtostyla* Fingerh. 1829, Linnaea 4: 372; Rupr. 1860, Fl. Ingrica: 349; Пояркова 1939, Фл. СССР 9: 450; Полетико 1954, Дер. и куст. СССР 3:350; Федоров 1958, Фл. Арм. 3: 300.- *C. kyrtostyla* auct. non Fingerh.: Schmidt 1859, Arch. Naturk. Liv.-, Ehst.- u. Kurlands, ser. 2, 1: 210. - **Yelpikyarpaq yemişan**

Тип: France, Rhone, Liergues, a la Combe, 2 Oct. 1870, Gandoger, holo.: LY.

Neotype: Luxembourg, a 50 m de la frontiere belge, en face du pont de Romeldange surla Sure, 11 Aug 1960, Lawalree 11088 (BR).

3-8 m hündürlükdə ağac və ya koldur. May-iyun ayında çiçəkləyir, meyvələri sentyabr-oktyabrda yetişir. Meyvələri qırmızı, uzunsov ellipsvari olub, 1,2- 1,4 sm uzunluqdadır, bir toxumludur. 2n (2x) = 34; 2n (3x) = 51

**Yayılması:** Ədəbiyyat məlumatlarında yalnız Şahbuz rayonunun Kükü kəndi ərazisində yayıldığı göstərilməsinə baxmayaraq, T.A. Qasımova tərəfindən bu növ əlavə olaraq Biçənək kəndi ətrafından toplanılmışdır. Ekspedisiyalar zamanı bu növə Ordubad rayonunun Nəsirvaz, Nürgüt kəndləri ətrafında daşlı-qayalı yamaclarda, Culfa rayonunun Xəzinədərə və Şərur rayonunun Qaraquş dağı ərazilərində, dəniz səviyyəsindən 800-2000 m hündürlükdə tək- tək və ya kiçik qruplarla meşə kənarlarında, talalarda, işıqlı palıd meşələrində və arid seyrək meşəliklərdə bitir. Bəzən yemişanın digər növləri ilə birlikdə çay kənarlarında və dağların quru- daşlı yamaclarında pöhrəliklər əmələ gətirirlər.

**Ümumi yayılması:** Qərbi, Mərkəzi və Şərqi Avropa, Baltikyanı ölkələr, Krım, Qafqaz, Türkiyə.

Müasir ədəbiyyatlarda (Маевский, 2006; Силаева и др., 2007; Цвелев, 2001; Christensen et al., 2008; Donmez, 2004) *C. curvisepala* . (*C. kyrtostyla*.) növünün *C. rhipidophylla* . adlandırılmasına baxmayaraq S.K. Çerepanovun (Черепанов, 1995) əsərində göstərilməmişdir. M.V. Sarkisyanın da tədqiqatlarında *C. curvisepala* (*C. kyrtostyla* ) növü *C. rhipidophylla* olaraq qəbul edilmişdir.

A.İ. Kristensen (Christensen, 1992) tədqiqatlarında C. *curvisepala* növünü ondan daha üstün xüsusiyyətlərə malik olan *C. rhipidophylla* növünün sinonimi kimi göstərmişdir.

**10. *C. zangezura* Pojark.** 1939, Фл. СССР 9 Addenda 8: 508 (*Crataegus pentagyna x Crataegus pseudoheterophylla*); Федоров 1958, Фл. Арм. 3: 300; Прилипко 1965, Дендрофл. Кавк. 4: 144. - *C. zangezura* Pojark. nothosubsp. *zangezura* Christensen 1992, Syst. Bot. Monogr. 35: 134. **– Zəngəzur yemişanı**

1,5-2,5 м hündürlükdə, kol və ya ağacdır. May-

iyunda çiçəkləyir, sentyabr- oktyabr aylarında meyvələri yetişir. Meyvələri 0,6- 0,9 sm uzunluqda olub, tünd - gilənari rəngdədir, ləti şirəlidir, adətən iki, çox nadir hallarda isə 3 toxumludur. 2n (4x) = 68.

Тип: «Зангезур, окр. г. Горис. В кустарниковых зарослях в нижней части склона ущелья реки Горис-чай. 21.09.1936 г., № 540. А. Пояркова.», holo.: LE, iso.: LE.

**Yayılması:** Babək rayonunun Çalxanqala və Ordubad rayonunun Nüsnüs kəndlərinin ətraf ərazilərində daşlı yamaclarda və seyrək meşəliklərdə tək-tək yayılmışdır. Aparılan araşdırmalar zamanı növə Şahbuz rayonunun Biçənək və Şərur rayonunun Havuş kəndləri ətrafında, dəniz səviyyəsindən 800-2000 m hündürlüklərdə qayalıqlarda, seyrək meşəliklərdə, kolluqlar arasında və vadilərdə tək-tək bitir.

**Ümumi yayılması:** Cənubi Qafqaz.

Növ 1983-cü ildə T.A. Qasımova (Касумова, 1983) tərəfindən Babək rayonunun Çalxanqala və Ordubad rayonunun Nüsnüs kəndləri ətrafından toplanılan materiallara əsasən yeni növ kimi Azərbaycan florasına əlavə edilmişdir. A.İ. Poyarkova (Пояркова, 1939) belə hesab edirdi ki, *C. zangezura* hibridogen (*Crataegus pentagyna x C. pseudoheterophylla*) mənşəli olub, *C. pallasii* növünə yaxındır. Ona görə də Zəngəzur yemişanını Cənubi Qafqazda sadəcə olaraq *C. pallasii* növünü əvəz edən növ hesab etmək daha düzgün olardı. A.A. Qrossheym də (Гроссгейм, 1949, 1952) Zəngəzur yemişanını Qafqaz üçün adi hibridogen mənşəli növ hesab edərək onun *Crataegus pentagyna* və digər yemişanlardan əmələ gəldiyi fikrini irəli sürürdı. Lakin, A.İ. Poyarkovanın fikirlərinə əsaslansaq onda A.A. Qrossheym tərəfindən *C. zangezura* növünün müstəqil növ kimi verilməsi qəbul olunmazdır. L.İ. Prilipko "Флора Азербайджана" (Прилипко, 1954) kitabında bu növün Kiçik Qafqazda yaılma ehtimalını irəli sürmüşdür. O.M. Poletiko (32) "Деревья и кустарники СССР" kitabında Zəngəzur yemişanını *Pentagynae* şöbəsinə aid etməyi təklif etmişdir. Lakin müəllif qeyd edirdi ki, *C. zangezura* . növündə meyvələrinin tünd - gilənari, qaralan, meyvə lətinin sarımtıl (qırmızı yox) və toxum sayının 2 ədəd (3- 5 yox) olmasını nəzərə alaraq, onu *Crataegus* şöbəsinə salınması daha məqsədəuyğun olardı. Eyni fikir An.A. Fyodorov (Федоров, 1958) və Y.M. İsayev, T.A. Qasımovanın (Исаев, Касумова, 1976) işlərində də öz əksini tapmışdır.

A.İ. Kristensen (Christensen, 1992) tədqiqatlarında *C. zangezura* . növünü *C. pentagyna* və *C. pseudoheterophylla* növlərinin çarpazlaşmasından əmələ gələn hibrid mənşəli olduğunu göstərməklə, iki yarımnöv təklif edir: *C. zangezura* nothosubsp. *zangezura* (*C. pentagyna* subsp. *pentagyna x C. pseudoheterophylla* subsp. *pseudoheterophylla*) Ermənistan və *C. zangezura* nothosubsp *pseudoambigua* (Pojarkova) Christensen (*C. pentagyna* subsp. *Pseudomelanocarpa* x *C. pseudoheterophylla* subsp. *turkestanica*) Türkmənistan ərazisi üçün.

<u>**Sect. 2.**</u> ***Pentagynae*** C.K.Schneid. 1906, III. Handb. Laubh.1:768. -*Pentagynae* Zabel Пояркова 1939, Фл. СССР 9:430; - *Melanocarpae* Zabel 1903, Beissn., Schelle & Zabel Handb. Laubh.-Benenn.: 178, nom. nud.

Budaqları qısa tikanlarla örtülü ağacdır. Yarpaqları yumurtavari, enli yumurtavari və ya yumurtavari- rombşəkilli olub, çılpaqdır və ya alt səthi tükcüklüdür. Çiçək qrupu çılpaq və ya tükcüklüdür. Qaramtıl meyvələrinin ləti çox az miqdarda qırmızımtıl rənglidir. Toxumları 2- 5 ədəddir, yan tərəfdən hamar olub, arxa tərəfdən çətin hiss edilən şırımlıdır, qarın tərəfdən isə tillidir.

Тип: *C. pentagyna* Waldst. et Kit. ex Willd.

**11. *C. pentagyna* Waldst. et Kit.** ex Willd. 1800, Sp. Pl. 2, 2: 1006; Regel 1871, Acta Horti Petropol. I: 113; Trautvetter 1882, Fl. Ross., 1: 279; Гроссгейм 1934, Фл. Кавк. 4: 290; Пояркова 1939, Фл. СССР 9: 430; Сосновский 1949, Фл. Груз. 5: 358 (georg.); Гроссгейм 1949, Опред. раст. Кавк.: 75, idem, 1952, Фл. Кавк. 2 изд. 5: 40; Прилипко 1954, Фл. Азерб. 5:71; Полетико 1954, Дер. и куст. СССР 3: 537; Федоров 1958, Фл. Арм. 3: 296; Кутателадзе 1964, Опред. раст. Груз., 1: 108 (georg.); Прилипко 1965, Дендрофл. Кавк. 4: 144; Franco 1968, Fl. Europ. 2: 76; Browicz 1972, Fl. Turk. 4:135; Мугбаниани 1980, Фл. Груз. 6: 83; Галушко 1980, Фл. Сев. Кавк. 2: 89; Khatamsaz 1992, Flora of Iran 6: 246. - *C. pentagyna* subsp. *pentagyna* Christensen 1992, Syst. Bot. Monogr. 35: 53 - *C. melanocarpa* M. Bieb. 1808, Fl. Taur.-Cauc. 1: 386; Hohenacker 1836, Enum. Pl. Talysh: 130; Ledebour 1844, Fl. Ross. 2, 1: 89; Boissier 1872, Fl. Or. 2: 661 p. p. (excl. var. *heterophylla* et var. *atrofusca*); Липский 1899, Фл. Кавк.: 297; Медведев 1919, Дер. и куст. Кавк.: 110; Riedl 1969, Fl. Iran. 66: 53- *C. oliveriana* Bosc. 1825, in DC., Prodr. 2: 630; Hohen. 1838, Enum. Pl. Talysh: 130 - *C. oxyacantha* L. var. *oliveriana* (Bosc.) Lindl. 1837, Bot. Reg. 23 tab. 1933. - *C. elbursensis* Rech. f. 1942, Ann. Naturhist. Mus. Wien 53: 343. - *C. melanocarpa* subsp. *elbursensis* (Rech. f.) Riedl 1969, Flora Iran. 66: 54. - *Mespilus pentagyna* K. Koch in Шмальгаузен 1895, Фл. Средн. Южн. Росс. 1: 350. - *C. colchica* Grossh. 1934, Фл. Кавк. 4: 290.- **Beşyuvalı yemişan**

3-8 (12) m hündürlükdə ağac və ya koldur. May-

iyun aylarında çiçəkləyir, oktyabrda meyvələri yetişir. Meyvələrı kürə formasında olub, qara rəngdədir, üzərində göyümtül ləkələr vardır və 3-5 toxumludur. Lətli hissəsi qırmızımtıldır. 2n (2x) = 34.

Тип: «Hungary/Yugoslavia. In Dunato et Syrmio (Danube and Serbia), Kitaibel s. n.», holo.: B-W 9718.

**Yayılması:** Şahbuz rayonunun Biçənək, Ordubad rayonunun Nəsirvaz və Nürgüt kəndlərinin ətraf meşəliklərində və dağ yamaclarında, aşağı və orta dağlıq qurşaqlarda 800-1800 m hündürlükdə kol bitkilərinin pöhrəliklərində, meşə talalarında, seyrək palıd və qarışıq meşələrin işıqlı yerlərində bitir.

**Ümumi yayılması:** Şərqi və Qərbi Avropa, Ukrayna, Moldaviya, Krım, Qafqaz, Türkiyə, Şimali İran.

A.A. Qrossheym (Гроссгейм, 1934) bu növü digər növlərdən yarpaqlarının aşağı səthinin məxməri- keçəvari, çiçək oxunun isə bozumtul-keçəvari tükcüklü olması ilə fərqləndirmiş və onu *C. colchica* olaraq adlandırmışdır. *C. pentagyna* əsasən yemişanın digər növləri ilə asan hibridləşir və qırmızımtıl rəngli lətə malik tünd meyvələ əmələ gətirirlər (*C.* x *zangezura* = *C. pentagyna x C. pseudoheterophylla*).

**<u>Sect. 3.</u>** ***Azaroli*** Loud. 1838, Arbor. frutic. Brit. 2: 826. - Sect. *Orientales* Zabel 1903 in Beissn., Schelle & Zabel, Hand. Laubh.-Benenn.: 179, nom. nud; Schneid. 1906, Ill. Handbuch der Laubh. 1: 781, in clavem.

Böyük olmayan ağac və ya koldur. Tikanları qısadır və ya tamamilə yoxdur. Yarpaqları yumurtavari, uzunsov yumurtavari olub, tükcüklü və bölümlüdür. Qaidəyə yaxın hissədən paz və ya rombvari daralmışdır. Çiçək qrupu keçəvari tükcüklüdür. Tozcuqları ağdır. İri meyvələri sarımtıl, çəhrayı, qırmızımtıl- çəhrayı olub, yumrudur, hamardır və çox da dərin olmayan şırımlıdır.

Тип: *C. azarolus* L.

**12. *C. cinovskisii* Kassumova** Бот. журн. 1985, 70, 2: 266.- *C.pseudoazarolus* Popov 1929, Тр. прикл. бот. 22: 442, fig. 101 (*Crataegus azarolus* var. *pontica Crataegus pentagyna*); Christensen, 1992, Syst. Bot. Monogr., 35: 123, p.p. - **Çinovski yemişanı**

Hündürlüyü 5-6 m olan ağacdır. May ayında çiçəkləyir, sentyabr ayında meyvələri yetişir. Meyvələri tünd qırmızı rəngli olub, kürə formasında, 0,6- 1,5 sm uzunluqda, 0,5- 1,3 sm enindədir və 4-5 toxumludur.

Тип: «Азербайджан. Нахичевань, Бабекский р-он, сел. Азнабюрт, вдоль дороги, среди виноградников, 11.10.1973, пл., Т.А.Касумова», holo.: BAK, iso.: LE

T.A. Qasımovanın məlumatlarında qeyd edilir ki, Çinovski yemişanı *C. pontica* növünə yaxın olub, ondan tünd qırmızı rəngli meyvələrinin (sarımtıl yox) və 4-5 (2-3 yox) ədəd toxumlarının olması ilə fərqlənir.

**Yayılması:** Babək rayonu, Əznəburd kəndi, Kəngərli rayonunun Çalxanqala kəndi ətrafında dəniz səviyyəsindən 100-1200 m yüksəklikdə yol kənarlarında və üzümlüklər arasinda yayılmışdır. Naxçıvan endemidir.

Növün gələcəkdə əlavə tədqiqinə ehtiyac vardır.

**13. *C. orientalis* Pall. ex Bieb.** 1808, Fl. Taur. - Caucas. 1: 387.- Ibid., 1819, 3: 332; Медведев 1883, Дер. и куст. Кавк.: 112; Липский 1899, Фл. Кавк.: 297; Гроссгейм 1934, Фл. Кавк. 4: 290; Пояркова 1939, Фл. СССР 9: 433; Сосновский 1949, Фл. Груз. 5; 359 (georg.); Гроссгейм 1949, Опр. раст. Кавк.: 75; idem, 1952, Фл. Кавк. 2 изд. 5: 41; Прилипко 1954, Фл. Азерб. 5: 71; Поетико 1954, Дер. и куст. СССР 3: 538; Федоров 1958, Фл. Арм. 3: 296; Кутателадзе 1964, Опред. раст. Груз. 1: 108 (georg.); Прилипко 1965, Дендрофл. Кавк. 4: 145; Riedl 1969, Fl. Iran. 66: 55; Browicz 1972, Fl. Turk. 4: 136; Мукбаниани 1980, Фл. Груз. 6: 86; Khatamsaz 1992, Fl. of Iran 6: 249. - *C. orientalis* Pall. 1796, Ind. Taur.:107, nom. nud. - *C. orientalis* subsp. *orientalis* Christensen 1992, Syst. Bot. Monogr. 35: 41, p.p. - *C. laciniata* Ucria 1793, Nuovo Rocc. opusc. Aut. Sic. 6: 251; Franco 1968, Fl. Europ. 2: 77; Тахтаджяни Федоров 1972, Фл. Еревана: 146.- *C. tanacetifolia* auct. non Pers.: Ledeb. 1843, Fl. Ross. 2, 1: 90; Steven 1856, Bull. Soc. Nat. Moscou 29, 1: 248. - *C. tanacetifolia* var. *orientalis* Regel 1871, Acta Horti Petropol. 1:114; Schmalh.1895, Фл. Ср . Южн. Росс. 1: 350**. - Şərq yemişanı**

1,5-3 (5) m hündürlükdə ağac və ya koldur. İyun ayında çiçəkləyir, sentyabr- oktyabr ayında meyvələri yetişir. Meyvələrı kürə formasında olub, qara rəngdədir, üzərində göyümtül ləkələr vardır və 3-5 toxumludur. Lətli hissəsi qırmızımtıldır. 2n (4x) = 68.

Тип: «…frequens in Tauria meridionalis collibus Ponto euxino adjacentibus, Marshall von Bieberstein s. n.», holo BM.

**Yayılması:** AMEA Botanika İnstitutunun Herbari fondunda saxlanılan nümunələrdə Ordubad rayonunun Anaqut (8.V.1947, Rzazadə), Culfa rayonunun Xoşkeşin (13.VIII.1938, Novruzova) kəndləri ətrafından toplanıldığı göstərilmişdir. T.A. Qasımova və Q.F. Axundovun məlumatlarında ona Şahbuz rayonunun Kükü, Keçili, Kolanı, Güney Qışlaq, Yuxarı Qışlaq, Biçənək, Babək rayonunun Çalxanqala, Ordubad rayonunu Nüsnüs, Culfa rayonunun Ərəfsə kəndləri ətrafinda,dəniz

səviyyəsindən 800-2000 m hündürlükdə tək- tək və ya kiçik qruplarla meşə kənarlarında, talalarda, işıqlı palıd meşələrində və arid seyrək meşəliklərdə rast gəlindiyi göstərilmişdir Bəzən yemişanın digər növləri ilə birlikdə dağların quru- daşlı yamaclarında pöhrəliklər əmələ gətirirlər.

Ərazidə aparılan ekspedisiyalar zamanı ona həmçinin, Ordubad rayonunun Nəsirvaz, Nürgüt kəndləri ətrafında, Culfa rayonunun Xəzinədərə və **Ümumi yayılması:** Avropanın cənubu, Krım, Qafqaz, Türkiyə, İran, Orta Asiya.

**14. *C. pojarkoviae* Kossych,** 1964, Новости сист. высш. раст.: 147. - *C.laciniata* Ucria subsp. *pojarkovae* (Kossych) Franco 1968, Feddes Repert. 79: 37. - *C.orientalis* Pall. subsp. *pojarkovae* (Kossych) Byatt 1977, Contrib. Crataeg. Eur.: 89; Christensen 1992, Syst. Bot. Monogr. 35: 43- **Pojarkov yemişanı**

Hündürlüyü 3-6 m olan ağac və ya koldur. İyun ayında çiçəkləyir, meyvələri sentyabrda yetişir. Meyvəsi kürəşəkilli-yumurtavari və ya armudşəkillidir, 1,5-2,5 sm diametrindədir, qabırğalıdır, sarı rəngli və 5 toxumludur. 2n (3x) = 51

Тип: «Крым, Карадаг, в нижне й части южного склона хр . Сюрю-Кая, цв. 14. 06.1960, пл. 22. 09. 1960, В. М. Косых», holo.: YALT, iso.: LE

**Yayılması:** Şahbuz rayonunun Yuxarı Qışlaq kəndı ətrafı daşlı-çınqıllı yamaclarda, orta və yüksək dağlıq qurşaqlarda 1200-2000 m hündürlükdə arid seyrək meşəliklərdə tək-tək yayılmışdır.

**Ümumi yayılması:** Qafqaz, Krım.

Pojarkov yemişanı T.M. Qasımova tərəfindən Şahbuz rayonunun Qızıl Qışlaq kəndi ərazisindən (quru daşlı-çınqıllı yamaclar, 20.X.1980, T.A. Qasımova) toplanılmış nümunələrə əsasən Azərbaycan florasına daxil edilmiıdir. Ermənistan florasına isə M.V. Sarkisyan (Саркисян, 2009) tərəfindən 2009-cu ildə daxil edilmişdir. A.İ. Kristensen (Christensen, 1992) Poyarkov yemişanını *C. orientalis* növünün *C. orientalis* subsp. *pojarkoviae* (Kossych) Byatt. yarımnövü kimi qəbul etmişdir. Qeyd etmək lazımdır ki, Poyarkov yemişanı *C. orientalis* növündən sərt tikanlı budaqlarına, sarı rəngli (narıncı yox), dəyirmi- oval və ya armudvari (qabırğalı və qütblərdən sıxılmış yox) meyvələrinə görə fərqlənirlər. Bu səbəbdən də onun özünəməxsus əlamətləri nəzərə alınaraq müstəqil növ kimi qəbul olunması məqsədəuyğundur.

**15. *C. pontica* C.Koch** 1853, Verh. Ver. Beford. Gartend. Konigl. Preuss. N.R. 1: 269. - ejusd. 1854, Weissdorn: 49, Гроссгейм 1934, Фл. Кавк. 4: 290; Пояркова 1939, Фл. СССР 9: 435; Сосновский 1949, Фл. Груз. 5: 359 (georg.); Гроссгейм 1949, Опред. раст. Кавк.: 76, idem 1952, Фл. Кавк. изд. 2, 5: 41; Полетико 1954, Дер. и куст. СССР 3: 541; Кутателадзе 1964, Опред. раст. Груз. 1: 109 (georg.); Прилипко 1965, Дендрофл. Кавк. 4:147; Riedl 1969, Fl. Iran. 66: 57; Browicz 1972, Fl. Turk. 4: 138; Мугбаниани 1980, Фл. Груз. 5I: 87; Khatamsaz 1992, Fl. of Iran 6: 251.-*C.azarolus* var. *pontica* (C.Koch) Christensen 1992, Syst. Bot. Monogr. 35: 38. – **Pont yemişanı**

4-8 m hündürlükdə ağacdır. İyun ayında çiçəkləyir, sentyabr-oktyabrda meyvələri yetişir. Meyvələri sarımtıl və ya narıncı-sarımtıl rəngli olub, 3,0 sm diametrindədir, 2-3 toxumludur. Meyvə ləti ətirlidir. 2n (4x) = 68.

Тип: «Turkey, Prov. Coruh, in der Nahe von Ardanucz, 28.08.1843, K. Koch 187», holo.: B.

**Yayılması:** T.A. Qasımovanın məlumatlarında Şahbuz rayonunun Yuxarı Qışlaq kəndi ətrafında yayılması qeyd edilmişdir. Ərazidə aparılan tədqiqatlar zamanı məlum olmuşdur ki, Pont yemişanı həmçinin, Babək rayonunun Çalxanqala, Şahbuz rayonunun Aşağı Qışlaq, Güney Qışlaq, Kolanı kəndlərinin ətrafında və Lizbirt zonasında yayılmışdır. T.H. Talıbov "Naxçıvan MR-in flora biomüxtəlifliyi və onun nadir növlərinin qorunması" (Talıbov, 2001) kitabında Şahbuz rayonunun Nursu və Gecəzur (Ağbulaq) kəndləri ətrafında, aşağı və orta dağlıq qurşaq dəniz səviyyəsindən 800-1800 m hündürlüklərdə dağ çaylarının quru-daşlı yamaclarında və arid meşəliklərdə tək-tək yayılması haqqında məlumatlar verilmişdir.

**Ümumi yayılması:** Qafqaz, Türkiyə, İran, İraq, Orta Asiya.

*C. pontica* Azərbaycan florasına yeni növ kimi T.A. Qasımova (Касумова, 1981) tərəfindən muxtar respublika ərazisindən toplanılan nümunələrə əsasən daxil edilmişdir

**16. *C. szovitsii* Pojark.** 1939, Фл. СССР , 9, Addenda 8: 499. - Гроссгейм 1949, Опред. раст. Кав к.: 75, idem, 1952, Фл. Кавк. изд. 2, 5: 41; Полетико 1954, Дер. и куст. СССР 3: 540; Прилипко 1954, Фл. Азерб. 5: 72; Федоров 1958, Фл. Арм. 3: 297; Прилипко 1965, Дендрофл. Кавк. 4: 147; Riedl 1969, Fl. Iran. 66: 55; Browich 1972, Fl. Turk. 4: 138; Khatamsaz 1992, Fl. of Iran 6: 250. - *C.orientalis* Pall. subsp. *szovitsii* (Pojark.) Christensen 1992, Syst. Bot. Monogr. 35: 47. - *C.orientalis* var. *connecta* Diapulis 1934, Feddes Repert. 34: 56, p. p. - *Mespilus monogyna* var. *armeniaca* Wenzig 1874, Linnaea 38: 157 – **Şoviç yemişanı**

Hündürlüyü 2-3 m olan kiçik ağac və ya koldur. İyun ayında çiçəkləyir, sentyabr- oktyabrda meyvələri yetişir. Yetişmiş meyvələrinin rəngi tünd qırmızı olub, 3-4, bəzi hallarda isə 2 toxumludur.

Тип: «Karabagh orientalis, in collibus prope Schuscha, Hohenacker [1] 3423, fl.», holo.: LE.

**Yayılması:** Y.M. İsaev və T.A. Qasımovanın (Исаев, Касумова, 1976) məlumatlarında onun Şahbuz rayonunun Kolanı, Babək rayonunun Payız və Buzqov kəndləri arasındaki quru daşlı yamaclarda yayılması göstərilmişdir. Aparılan tədqiqatlar zamanı Culfa rayonunun Ərəfsə, Şahbuz rayonunun Kükü və Ayrınc kəndləri ətrafında, orta dağlıq qurşaqda 1200- 1800 m hündürlükdə dağların daşlı yamaclarında, qayalıqlarda, kol pöhrəliklərində, arid seyrək meşəliklərdə və meşə kənarlarında da yayıldığı müəyyən olunmuşdur.

**Ümumi yayılması:** Qafqaz, Türkiyə, İranın şimal-qərbi.

1976-cı ildə Y.M. İsayev və T.A. Qasımova tərəfindən Şahbuz rayonunun Kolanı (quru-daşlı yamaclar) və Babək rayonunun Payız, Buzqov kəndləri ətrafından toplanılan materialların təhlili zamanı yeni növ kimi Naxçıvan MR florasına əlavə edilmişdir. Müəllifə görə toplanılan herbarilər tipik nümunələrdən 3-5 (2-4 yox) ədəd toxumların olması ilə fərqlənir.

*C. szovitsii* növü A. Kristensen (Christensen, 1992) tərəfindən *C. orientalis* subsp. *szovitsii* (Pojark.) Christensen yarımnöv kimi qəbul edilmişdir. Lakin hər iki növ üzərində aparılan təhlillər zamanı müəyyən olunur ki, *C. szovitsii C. orientalis* növündən daha çox bölümlü yarpaqları, qırmızımtıl- sarı rəngli meyvələri və toxumların sayı 3 (2) - 4 (5 yox) ilə fərqlənir. Ümumiyyətlə, *C. szovitsii* bir çox əlamətlərinə görə digər yemişan növlərindən aydın seçilməsini nəzərə alınaraq sərbəst növ hesab etmək olar.

**17. *C. tournefortii* Griseb.** 1843, Spicil. Fl. Rumel. Et Bithyn. 1: 90. - Пояркова 1950, Бот. мат. (Ленинград) 12: 108; Полетико 1954, Дер. и куст. Кавк. 3: 539; Прилипко 1965, Дендрофл. Кавк. 4: 145. - *C. sanguinea* auct. Schrad. 1834, Index Sem. Hort. Gotting.: 2, non *C.sanguinea* Pall. - *C. orientalis* auct. non Pall.: Lindl. 1836, Bot. Reg. 22: t. 1852. - *C. orientalis* var. *sanguinea* (Schrad.) Loud. 1838, Arb. Brit. 2: 828. - *C.orientalis* var. *tournefortii* (Griseb.) Schneider 1906, Ill. Handb. Laubholzk. 1: 787. - *C.schraderiana* Ledeb. 1844, Fl. Ross. 2, 1: 91; Пояркова 1939, Фл. СССР 9: 464; Федоров 1958, Фл. Арм. 3: 299; Franco 1968, Fl. Europ. 2: 76. - *C. orientalis* Pall. subsp. *orientalis* Christensen 1992, Syst. Bot. Monogr.,35: 41,p.p.- **Turnefor yemişanı.**

Hündürlüyü 2-2,5 m olan az tikanlı ağac və ya koldur. Yarpaqları tünd - yaşıl olub, üst tərəfi qısa tükcüklərlə örtülüdür. Çiçəkləri çoxçiçəkli qalxanlarda yerləşmişdir. İyun ayında çiçəkləyir, sentyabr- oktyabrda meyvələri yetişir. Meyvələri açıq və ya tünd - gilənarı rəngdə olub, 1,0- 1,6 sm diametrindədir, 3-5 toxumludur. 2n (3x) = 51; 2n (4x) =68.

Тип: Tab. 1852 in Lindley, Bot. Reg. 22. 1836.

**Yayılması:** T.A. Qasımova tərəfindən Babək rayonunun Çalxanqala və Şahbuz rayonunun Bişənək meşəsindən toplanılmışdır. T.H. Talıbovun “Naxçıvan MR-in flora biomüxtəlifliyi və onun nadir növlərinin qorunması“ (Talıbov, 2001) kitabında Şərur rayonunun Xanbulağı ərazisində, orta və yuxarı dağlıq qurşaqda dəniz səviyyəsindən 1300- 1400 m yüksəklikdə meşələrin kənarlarında, daşlı yamaclarda tək-tək və ya qruplarla yayılması göstərilmişdir.

**Ümumi yayılması:** Avropa, Qafqaz, Krım, Yunanıstanın cənubu.

M.B. Sarkisyanın (Саркисян, 2011) tədqiqatlarında da bu növün Naxçıvam MR ərazisində yayılması haqqında məlumatlar verilmişdir.

Ədəbiyyat məlumatlarında (Пояркова, 1939) növün arealı Krım və Cənubi Qafqaz olaraq göstərilmişdir. “Флора Азербайджана“ kitabında L.İ. Prilipko tərəfindən *C. tournefortii* növü *C. schraderiana* adı altında verilmişdir və onun yaylma zonası Naxçıvan Muxtar Respublikası ərazisi göstərilmişdir. A.İ. Kristensen (Christensen, 1992) tədqiqatlarında *C. tournefortii* növünü *C. orientalis* növünün sinonimi kimi qəbul edərək, onu *C. orientalis* subsp. *orientalis* yarımnövünə aid edirdi. Lakin aparılan təhlillər nəticəsində məlum olmuşdur ki, hər iki növ təbiətdə çiçəyinə, yarpaqların formasına, tükcüklüyünə, meyvələrin ölçüsünə, formasına, rənginə və toxumlarının sayına görə bir- birindən kəskin fərqlənirlər. Güman etmək olar ki, *C. tournefortii* növü *C. orientalis* kimi tamamilə fərqli növdür və onun tədqiqinə əlavə ehtiyac vardır.

V.Y. Letuxova, İ.L. Potapenko (Летухова и др., 2011) isə Turnefor yemişanının hibridogen mənşəli olub, *C. orientalis* və *C. pentagyna* növlərinin hibridləşməsi nəticəsində yarandığını bildirirlər.

Beləliklə, 2004-2013-cü illərdə aparılan ekspedisiya zamanı toplanılan herbari materiallarının təhlili və ədəbiyyat məlumatlarına əsasən müəyyən edilmişdir ki, hazırda Naxçıvan MR florasında *Crataegus* cinsinə 22 növ daxildir. Bunlardan 17 növünə yabanı halda rast gəlinir. Bundan başqa ərazidə 5 növ *C. chlorocarpa C. ferganensis* , *C. sanguinea* , *C. songarica*,*C. turkestanica* isə introduksiya olunaraq mədəni şəraitdə park və bağların yaşıllaşdırılmasında istifadə olunur. (İbrahimov, 2012; Talıbov, İbrahimov, 2013) Bunlardan *C. pojarkoviae* və *C. tournefortii* növləri keçmiş SSRİ-nin “Qırmızı Kitabı“na (Красная книга СССР, 1984), *C. pontica* növü isə V.C. Hacıyev və S.H. Musayev tərəfindən nəşr edilən “Azərbaycanın qırmızı və

parasitus et infesta (latın).

S.I.Ojeqov terminlər haqqında yazır: "Həqiqətən, sözün əsil mənasında termin olan termin-söz birləşmələri müəyyən məna sistemindən ibarət mövcud fikri ifadə edən sərbəst söz birləşmələridir" (Ожегов, 1957).

Müasir azərbaycan dilində terminlərin müəyyən bir qisminin qoşa sözlər, şəklində əmələ gəlməsi ilə bağlı olaraq, onların mahiyyəti haqda qısa şərh verilir. Bu terminlər xarici dillərdən, o cümlədən, müqayisə etdiyimiz ingilis, rus və latın dillərindən alınmalar şəklində dilimizə keçir. Bu şəkildə olan genetika terminoloji vahidlərinin formalaşmasında *təcrübə-, cyto-, qan-,* və s.leksemlər iştirak edir (Kazımov, 2002), məs.: təcrübə-sınaq (azərb.) – research-experiment [rɪˈsə:tʃ ɪksˈperɪmənt] (ing.) – опыт-исследование (rus) – experimentum-investigatio (latın); sito-genetika (azərb.) – Cyto-genetics [ˌsaɪtədʒɪ ˈnetɪks](ing.) – цито-генетика (rus) – cyto-genetika (latın); qan-damar (sistemi) – blood-vascular (system) [ˈblʌdˈvæskjulə (ˈsɪst(ə)m)] (ing.) – кровяная-сосудистая (система) (rus) – (systema) haemato-vasculare (latın).

Azərbaycan dilində işlədilən genetika terminlərinin bir qisimini söz birləşməsi şəklində olan terminoloji vahidlər təşkil edir. Bunlar quruluş etibarı ilə iki və daha artıq terminin sintaktik üsulla birləşməsindən əmələ gəlir; belə termin birləşməsi vahidləri həm qrammatik, həm də ardıcıllıq baxımından bir-biri ilə əlaqədardır.

Söz birləşməsi şəklində olan terminlərin təsnifatı ilə S.Sadıqovanın fikirlərinə istinad etsək, genetika terminlərini terminoloji birləşmə kimi həm komponentlərin hansı əsasdan olmasına, həm də nitq hissələrinə görə qruplaşdırmağı məqsədə müvafiq hesab etmiş olarıq; bunlar aşaıdakılardır:

**1) hər iki komponent azərbaycan dilinə məxsus sözlərdən ibarət olanlar:** (genetik) məlumat əldə etmə (azərb.) – (genetic) data aqcuisition [ˈdeɪtə ækwɪˈzɪʃn] (ing.) – сбор (генетических) данных (rus); (genetik) məlumat toplama (azərb.) – (genetic) data collection [ˈdeɪtə kəˈlekʃ(ə)n](ing.)– сбор (генетических) данных(rus) – collecta informatio (latın); bitkilərin (süni) yayılması (azərb.) – plant dıstribution [ˈpla:nt dıstrıˈbjuʃ(ə)n] (ing.) – распространение растений (искусственным путем) (rus) – planta afugus artificiale (latın); bitkilərin təbii yolla yayılması (azərb.) – plant spreading [ˈpla:nt sprˈedıŋ] (ing.) – распространение растений (естественным путем) (rus) – planta afugus naturale (latın); müxtəlif cinslərin çarpazlaşdırılması (~ mələzləşdirilməsi, ~ hibridləşdirilməsi) (azərb.) – intercrossing [ˈɪntə:ˈkrosıŋ](ing.) *syn.*: intergeneric hybridization – скрещивание разных пород (rus); növlərarası mələzləş(dir)mə (~ hibridləş(dir)mə;

**2) hər iki komponent Avropa mənşəli sözlərdən ibarət olanlar:** adaptiv seleksiya (seçmə) (azərb.) – adaptive selection [əˈdæptɪv sɪˈlekʃ(ə)n] (ing.) – (адаптивный) приспособительный отбор (rus) – selectio adaptiva (latın); aqrotexniki kultivar (aqrotexniki üsulla becərilən mədəni bitki sortu) (azərb.) – agrotechnical cultivar [ˌægro(u) ˈteknık(ə)l ˈkʌltıˈvɑ:] (ing.) = agrotechnical cultivated variety – агротехнический культурный сорт растения (rus) – cultivar agrotechnicus latın); kompleks seleksiya (seçmə) (azərb.) – complex selection [ˈkompleks ˌsɪˈlekʃ(ə)n] (ing.) – комплексный отбор (rus) – selectio complexus (latın); hər üçü eyni zamanda alınmadır.

**3) komponentləri müxtəlif dillərə məxsus sözlərdən ibarət olanlar:** təcrübə mübadiləsi mexanizmi (azərb.) – practice sharing mechanizm [ˈpræktɪs ˈʃearıŋ ˈmekənɪzm] (ing.) – механизм обмена опыта (rus) – practicus commutatio modus (latın); toplanmış material (sort-nümunə) kolleksiyasının saxlanması (azərb.) – accession conservation [əˈkseʃ(ə)nˌ kənsə:ˈveɪʃ(ə)n] (ing.) – содержание накопленого материала (rus) – materia conservatio (latın); toplanmış material (sort-nümunə) kolleksiyasının mühafizəsi (azərb.) – accession protection [əˈkseʃ(ə)n prəˈtekʃ(ə)n] (ing.) – защита накопленного материала (rus) – materia protectio (latın); toplanmış material (sort-nümunə) kolleksiyasının dublikasiyası (azərb.) – accession duplication [əˈkseʃ(ə)n ˌdʌplɪˈkeɪʃ(ə)n] (ing.) – дубликация накопленного материала (rus) – materia duplicatio (latın); toplanmış material (sort-nümunə) kolleksiyasının çoxaldılması (azərb.) – accession multiplication [əˈkseʃ(ə)nˌmʌltıplıˈkeı ʃ(ə)n] (ing.) – размножение (увеличение) накопленного материала (rus) – materia multiplicatio (latın);

**4) birinci komponenet *adlıq halında olan isimdən,* ikinci komponent *I və III şəxslər üzrə mənsubiyyət şəkilçisi qəbul etmiş isim*dən ibarət olanlar**, məs.: səpin dövrü (azərb.) – sowing period [ˈsouwɪŋˈpɪərɪəd] (ing.) – период посева (rus) – seminatio periodus (latın); suvarma mexanizmi (azərb.) – irrigation mechanizm [ırı ˈgeɪʃ(ə)n ˈmekənɪzm] (ing.) – механизм орашения (rus) – modus irrigatio (latın); doydurma metodu (azərb.) – enrichment method [ın ˈrıtʃmənt ˈmeθəd] (ing.) – метод обогащения (rus) – methodus ampilificandi (latın); tədqiqat metodları (azərb.) – research methods [rɪˈsə:tʃˈmeθədz] (ing.) – методики исследования (rus) – investigatio methodi (latın); bitki məhsuldarlığı (azərb.) – crop productivity [krop ˌprodʌkˈtɪvɪtɪ] (ing.) – продуктивность культуры (rus) – cultura productivitas (latın); ətraf mühit amili (azərb.) – environmental factor [ın ˌvaɪər(ə)nˈment(ə)l fæktə] (ing.) – экологический

фактор (rus) – factor ecologicus (latın); Azərbaycanca “DNT elektroforezi” söz birləşməsi ingilis, rus və latın dillərində müvafiq olaraq: “DNA electrophoresis[΄dı΄en΄eığı΄lektro(u)fə΄rezıs] – электрофорез ДНК – DNA electrophoresis”dir.

**5) birinci komponent *sifət*dən, ikinci komponenti *adlıq halda olan isim*dən ibarət olanlar**, məs.: genoloji şəcərə (azərb.) – family tree, genealogical tree [ʤınıə΄lodʒık(ə)l trı:] (ing.) – генеалогическое древо (rus) – varianta biologica (latın); genetik material (azərb.) – genetic material [dʒı΄netık mə΄terıəl] (ing.) – генетический материал (rus) – materia geneticus (latın); genetik kod (azərb.) – genetic code [dʒı΄netık΄koud] (ing.) – генетический код (rus) – systéma signórum genéticum (latın);

**6) birinci komponent *feli sifət*dən, ikinci komponent *isim*dən ibarət sözlər**, məs.: tezyetişən (faraş) meyvə (azərb.) – early-ripened fruit [΄ə:lı΄raıp(ə)nd ΄fru:t] (ing.) – раннеспелый фрукт (rus) – fructus praecox (latın); gecyetişən sort (azərb.) – lateripened variety [leıt΄raıp(ə)nd və΄raıətı] (ing.) – позднеспелый сорт (rus) – cultivar tradimatirus (latın).

**7) birinci komponent *say*dan, ikinci komponent *isim*dən ibarət sözlər**, məs.: birinci yığım(azərb.) – first harvest [΄fə:st΄ha:vıst] (ing.)– первый урожай(rus) – proventus primus (latın); ikinci biçin (azərb.) – second cut [΄sek(ə)nd kʌt] (ing.) – второй сенокос (rus) – fenisicium secondarus (latın); birinci suvarma – first irrigation [΄fə:stırı΄geıʃ(ə)n] (ing.) – первое орашение (rus) – irrigatio primus(latın);

Bu növ termin-söz birləşmələrdə termin-sözlər də termin-sifətlər kimi, isimlərin əvvəlində heç bir dəyişikliyə uğramır, isimlərin növ və xüsusiyyəti onlara təsir etmir. Bu vəziyyətdə termin saylar heç bir formal əlamət-şəkilçi qəbul etmir. Terminologiyada saylar bilavasitə terminlərin yaranmasında fəal iştirak edir və başqa terminlərlə əlaqəli olur.

Azərbaycan dilində birinci komponent düzəltmə terminlərdən ibarət olan genetika termin-söz birləşmələri də üstünlük təşkil edirlər, məs.: işçi arı (azərb.) – working bee [΄wə:kıŋ bı:] (ing.) – рабочая пчела (rus); apis laborum (latın); – bu kimi termin-söz birləşmələri yanaşma əlaqəsi əsasında əmələ gəldiyindən I növə aiddir. II növ termin-söz birləşmələri şəklində olan genetika terminləri dildə nisbətən çoxluq təşkil edir; terminlərin biri digərini müxtəlif aspektdən təyin etdiyi üçün, bunları bir neçə tipə ayırmaq olar:

1) birinci komponent ikinci komponentin səciyyəvi xüsusiyyətlərini bildirir. Dolayısı ilə, birinci komponent ikincinin konkret olaraq növünü müəyyənləşdirir, məs.: toxum qutusı (qozası) (azərb.) – seedball [΄sı:d bo:l] (ing.) – семенная коробочка (rus); capsula seminalis (latın); göbələk xəstəliyi (azərb.) – fungus disease [΄fʌŋəs dı΄zı:z] (ing.) – грибковая болезнь (rus) – morbi fungus (latın); meyvələti – fruit flesh[΄fru:t fleʃ](ing.) – мякоть фрукта(rus); fructus pulpa(latın).

2) birinci komponent ikinci komponentin konkret növünü ifadə edir və asılı komponent xüsusi addan ibarət olur: Mendel nəzəriyyəsi (azərb.) – Mendel’s Theory [΄mendelz ΄θeorı] (ing.) – Теория Менделя (rus) – Theoria Mendelis (latın); Herkules böcəyi (azərb.) – Hercules beetle [΄hə:kjulı:z ΄bı:tl] (ing.) – жук-Геркулес (rus); Dynastes hercules (latın);

3) birinci komponent ikinci komponentin konkret növünü ifadə edir: kolleksiya bağı (azərb.) – collection garden [kə΄lekʃ(ə)n΄ga:dn] (ing.) – коллекционный сад (rus) – hortus collectaneus (latın); əmələgəlmə (yaranma) mənbəyi (azərb.) – source of origin [΄so:səvə΄rıgn] (ing.) – источник образования (rus) – formatio fons (latın);

Bu tip genetika termin-söz birləşmələri də çoxluq təşkil edirlər: mutasiyaların populyasiyada təsadüfi yayılması (azərb.) – genetic drift [dʒı΄netık΄drıft] (ing.) – случайное распространение мутаций в популяции (rus) – vagabundus geneticus (latın); eyni vaxtda iki bitkinin becərilməsi (azərb.) – double cropping [΄dʌbl΄kropıŋ] (ing.) – одновременное культивирование двух культур (rus) – biformis cultura simultaneus cultivatio (latın); nümunələrin səciyyələndirilməsi (azərb.) – accession characterization [ə ΄kseʃ(ə)n kærıktər(a)ı ΄zeıʃ(ə)n] (ing.) – характеристика поступлений (rus) – materia character (latın); biomüxtəlifliyin mühafizəsi(azərb.)– biodiversity protection [΄baıo(u)daı΄və:sıtı prə ΄tekʃ(ə)n](ing.)– защита биоразнообразия (rus) – protecto varitata biologica (latın).

Üçüncü tip termin söz birləşmələri özlərinə müxtəlif termin cəlb edərək öz tərkiblərini say etibarı ilə genişləndirirlər, məs.: biomüxtəlifliyin dayanıqlı istifadəsi (azərb.) – sustainable use of biodiversity [səs΄teınəbl΄ju:z əv ΄baıo(u)daı΄və:sıtı] (ing.) – рациональное использование биоразнообразия (rus) – varitata biologica usus rationalis (latın); bitki genetik ehtiyatlarının elmi araşdırılması (azərb.) – scientific investigation of plant genetic resources [saıən ΄tıfı kınvestı΄geıʃ(ə)nəv ΄pla:nt dʒı΄netık rı΄so:sız] (ing.) – научное исследование генетических ресурсов ратительностей (rus) – scientificus geneticae copiae vegetabiles (latın).

Termin-söz birləşməsi strukturlu terminlər üç cür olur:

**a) birinci növ təyini söz birləşməsindən ibarət olanlar**, məs.: faraş meyvə (azərb.) – early-ripend fruit [΄ə:lı ΄raıp(ə)nd ΄fru:t] (ing.) –

раннеспелый фрукт (rus) – fructus praecox (latın); yeni sort (azərb.) – recent variety [ˊrısənt və ˊraıətı] (ing.) – новый сорт (rus) – cultivar novus (latın);

**b) ikinci növ təyini söz birləşməsindən ibarət olanlar,** məs.: növlər+arası (azərb.) – interspecific [ˌıntə(:)spıˊsıfık] (ing.) – межвидовой (rus) – interspecıficus (latın); növ+daxili (azərb.) – intraspecific [ˌıntrəspıˊsıfık] (ing.) – внутривидовой (rus) – ıntraspecificus (latın); inbrid çarpazlaşma əmsalı (azərb.) – coefficient of inbreeding [ˌkəuıˊfıʃ(ə)nt əvˊınˊbrı:dıŋ] (ing.) – коэффициент инбридного скрещивания (rus) – hybridizatio inbreed coĕfficiens (latın); (bu, genetika termin birləşməsində "indbrid" – qohumlararası mənasını verən alınmadır);

**c) üçüncü növ təyini söz birləşməsindən ibarət olanlar,** məs.: biomüxtəlifliyin mühafizəsi (azərb.) – protection of biodiversity [prəˊteıkʃ(ə)n əvˊbaıo(u)daıˊvə: sıtı] (ing.) – защита биоразнообразия (rus) – varitata biologica protectio (latın); biomüxtəlifliyin (davamlı) istifadəsi (azərb.) – (sustainable) use of biodiversity [səsˊteınəbl ˊȷu:z əv ˊbaıo(u)daı ˊvə:sıtı] (ing.) – (рациональное) использование биоразнообразия (rus) – varitata biologica usus (rationalis) (latın); bitki genetik ehtiyatlarının elmi araşdırılması (azərb.) – scientific investigation of plant genetic resources [ˌsaıənˊtıfık ˌınvestıˊgeıʃ(ə)n əv ˊpla:nt dʒıˊnetık rıˊso:sız](ing.) – научное исследование генетических ресурсов растительностей (rus) – scientificus geneticae copiae vegetabiles (latın).

Tərəfləri ingilis mənşəli komponentlərdən ibarət olan terminlər də vardır ki, onlar digər struktura malikdirlər; həmin sözlər əsasən - *elektro, izo, metr, qrafiya* morfemlərinin iştirakı ilə əmələ gəlir, məs.: elektro+fiziologiya (azərb.) – electro-physiology [ıˊlektrəˌfızıˊolədʒı](ing.) – электрофизиология (rus) – electro-physiologia (latın); elektro+şok (azərb.) – electroshock (therapy) [ıˊlektrə ˊʃok] (ing.) – электрошок (rus) – electroaffectio (latın); izoxron (eyni vaxtda baş verən) (azərb.) – isochronous [aıˊsokrənəs] (ing.) = isochronic – изохронный, одно-временный (rus) – isochronus (latın); bio+metrik (azərb.) – biometric [baıə(u) ˊmıtrık](ing.) – био-метрический (rus) – biometricus (latın); geo+botanika (azərb.) – geobotany [dʒeo ˊbotənı] (ing.) – геоботаника (rus) – geobotanica (latın); digər misal: layering [ˊleıərıŋ] – *syn.:* propagation by layering – rusca "размножение отводками", azərbaycan dilində "qollarla çoxalma", latın dilində "ablactatio"; – bu mürəkkəb termin birləşməsinin birinci hissəsi "qollarla" sözü "qat, lay, sira, şitil, qələm (bitkidən qoparılaraq ayrıca əkilən gövdə və ya kök parçası)" və s. mənalarını verən ingilis mənşəli "layer" sözündən formalaşıb və termin birləşməsinin ikinci hissəsini təyin edir; **nitq hissəsi kimi düzəltmə sifət, yəni isim (qol) + cəm şəkilçisi (lar) + qoşma (la) + say(çox) + felin əmr şəklini əmələ gətirən şəkilçi(al) + düzəltmə isim əmələ gətirən şəkilçi(-ma).** Seminification [ˌsemınıfıˊkeıʃ(ə)n] – rusca "размножение семенами", azərbaycanca "toxumla çoxalma", latınca "seminificatio"; – istinad olunmuş lüğətdən göründüyü kimi (Даниленко,1986), latın mənbələrindən gələn "seminifikasiya" kimi terminlər beynəmiləl terminlərdir, lakin bu terminin istər rus, istərsə azərbaycan dillərində müvafiq variantı mövcuddur. Bu mürəkkəb termin birləşməsinin birinci hissəsi "toxumla" sözü termin birləşməsinin ikinci hissəsini təyin edir; nitq hissəsi kimi düzəltmə sifət, **yəni isim (toxum) + qoşma (la) + say (çox) + felin əmr şəklini əmələ gətirən şəkilçi (al) + düzəltmə isim əmələ gətirən şəkilçi (-ma)**. Double $F_1$ [ˊdΛblˊefˊwΛn] – потомок от скрещивания двух гибридов $F_1$ от разных родителей (потомок ($F_1$) от скрещивания двух разных гибридов)(rus) – ikiqat mələz/hibrid (iki $F_1$ hibridinin çarpazlaşmasından alınan nəsil); propagator [ˊpropəgeıtə] – a) производитель потомства (о животных) (rus); a) nəsil artıran (heyvanlar barədə), (döllük heyvan); b) фермер, сеятель (о человеке, занимающемся высаживанием и выращиванием растений) – b) fermer, əkinçi (bitki əkilməsi və becəreilməsi ilə məşğul olan adam).

Ingilis dilinə mənsub təksözlü terminoloji vahidin və anlayışla birlikdə çoxkomponentli terminin alınması hadisəsi zamanı, azərbaycan dilində yeni genetika termini yaranarkən, termindüzəltmənin iki üsulunun – leksik və sintaktik üsullarının özünəməxsus birləşməsini qeyd etmək lazımdır. Əgər təksözlü terminoloji vahid nominasiyanın ehtiyacını ödəməyə qabil deyilsə, onda mürəkkəb tərkibli anlayışlara müraciət olunur. Söz birləşmələrinə müraciət anlayışların sintaktik üsulla mənalandırılması işində əsas yer tutan müasir genetika terminologiyasında termin yaradıcılığıyla bağlıdır. Ona görə də o, istər tərkib baxımından, istərsə ifadəolunma baxımından azərbaycan, rus və ingilis dillərinin əsas səciyyəsindən ibarətdir. Bu, ingilis, rus və azərbaycan dillərinin termin sistemi üçün də səciyyəvidir. Göstərilən termin sistemlərinin terminoloji söz birləşmələrinin özünəməxsus xüsusiyyəti özünü onda göstərir ki, onlar ingilis leksemlərinin azərbaycan və rus termin sistemlərinə gətirilməsi nəticəsində bu dillər üçün ümumiləşirlər. Genetika termin söz birləşmələri nominasiyanın tamlığı xüsusiyyətinə malik olaraq (aşaıdakı kimi) genetikanı təqdim edən anlayışların möhkəm bir strukturudur, məs.: environmental effect resistance [ınˊvaıər(ə)n ment(ə)l ıˊfekt ˊrezıstəns] (ing.) – устойчивость к действию

окружающей среды (rus) – ətraf mühit təsirinə davamlılıq (azərb.) – resistantia ad cicumstantia (latın); symbiosis living beans [̧sımb(a)ı΄ousıs ΄lıvıŋ ΄bı:nz] (ing.) – живые организмы, живущие в симбиозе (rus) – simbioz (müştərək) həyat sürən canlılar (azərb.) – viva organisms in symbiosis (latın); amphibian [æm΄fıbıən] (ing.) – земноводное (rus) – suda-quruda yaşayanlar (azərb.) – amphibius (latın).

Terminoloji söz birləşmələri onların mürəkkəb daxili semantik strukturu olan əsas və asılı komponentlərdən və onların arasındakı əlaqədən ibarətdir.

Əsas komponent – **əsas məna daşıyan söz**, asılı komponent isə **əsas mənanı tamamlayan söz** formasından ibarətdir. Nominasiya vasitəsi kimi terminoloji söz birləşməsi əsas komponent adlanan hadisə, proses və hərəkət mənasını verir, ondan sonra asılı komponent vasitəsilə dəqiqləşdirilir, məs.: aktiv zəhərli heyvanlar (azərb.) – active poisonous animals [΄æktıv ΄poıʃnəs ΄ænıməlz] (ing.) – особо ядовитые животные (rus) – animale venonosus (latın); aseptik heyvanlar – micro-organismfree animals [΄maıkrə(u) ̧o:gə ΄nızm frı: ΄ænıməlz] (ing.) – асептические животные (rus) – animale asepticae (latın); inbred heyvanlar (yaxın qohum fərdlərin mələzləşdirilməsindən alınan) – inbred animals [΄ınbred΄ænıməlz] (ing.) инбредные животные(rus) – animale hybridizatio Helychrysum arenarium (latın).

Buradan belə nəticəyə gəlmək olar ki, genetika terminlərinin rus və ingilis dillərində yaradılmasında olduğu kimi, azərbaycan dilində də sintaktik üsul əsas üsullardan biridir.

## ƏDƏBİYYAT


**Dəmirçizadə Ə.M.** (1962) Azərbaycan dilinin üslubiyyəti, Bakı: Azərnəşr: 319 s.

**Qasımov M.Ş.** (1973) Azərbaycan dili terminologiyasının əsasları. Bakı, Elm: 186 s.

**Kazımov Q.S.** (2002) Müasir Azərbaycan dili. Bakı, Ünsiyyət: 420 s.

**Sadıqova S.A.** (2002) Azərbaycan dili terminologiyasının nəzəri problemləri. Bakı, Elm: 230 s.

**Sönməzoğlu F.** (2000) Uluslararası ilişkilər sözlüğü. Istanbul, Der yayınları: 774 s.

**Бируни и Теофраста.** (2011) О применении аконита/ http://www.nova.rambler.ru/search.

**Бреус Е.В.** (2000) Основы теории и практики перевода с русского языка на английский. М. http://www.englspace.com/dl/details/breus.zip.

**Городилова Г.Г.** (1989) 30 (см. Е.В.Бреус: http://www.englspace.com/dl/details/breus.zip)

**Гуляев Г.В, Мальченко В.В.** (1975) Словарь терминов по генетике, цитологии, селекции, семеноводству и семеноведению. М.: Россельхозиздат: 216 с.

**Даниленко,** (1986): 2, 21 (см. Е.В.Бреус: http://www.englspace.com/dl/details/breus.zip)

**Козловский В.Г, Ракипов Н.Г.** (1983) Англо-русский сельско-хозяйственный словарь. М.: Русский язык, 880 с.

**Лотте Д.С.** (1948): 154 (см. Е.В.Бреус: http://www.englspace.com/dl/details/ breus.zip)

**Ожегов С.И.** (1957) О структуре фразеологии лексикографического сборника. М.: вып.2, с.51-52.


## Генетические Термины, Созданные Синтаксическим Способом


**М.А. Наджафзаде**[1,2]

[1] *Институт ботаники НАНА*
[2] *Институт лингвистики НАНА*



Разъясняется, что синтаксический способ в терминообразовании генетики на азербайджанском (также как на русском и английском языках) – один из основных способов терминообразования; представляется их сопоставительно-лингвистический анализ на английском, русском, азербайджанском и латинском языках. Говорится о том, что при терминообразовании таким путем, обычно используются две и/или больше словосочетаний. Рекомендуется, не принимать терминообразования генетики на азербайджанском как определение эквивалентов для терминов, принадлежащих английскому и русскому языкам.



***Ключевые слова:*** *генетические термины, многокомпонентные термины, способ терминообразования, общетеоретическая деривация*

## Terms Of Genetics Derived By Syntactic Method

**M.A.Najafzadeh**

[1] *Institute of Botany, ANAS*
[2] *Institute of Linguistics, ANAS*

The syntactic way in term derivation of Genetics in the Azerbaijan language (like in Russian and English) is one of the basic ways; their comparative linguistic analysis in English, Russian, Azerbaijani and Latin is given here. Usually two and/or more word-combinations are used in term derivation by the syntactic way. It is recommended: not to accept the term derivation of Genetics in Azerbaijani like equivalent definition for English and Russian terms.

***Key words:*** *Terms of Genetics, Multicomponenet terms, Methods of term derivation, General theoretical derivation*

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 68, №3, səh. 172-176 (2013)

# Azərbaycanın Şirvan Zonası Çaylarının Makrozoobentosu

**S.İ. Əliyev**

AMEA Zoologiya İnstitutu, A.Abasov küç., 1128 döngə, Bakı AZ1073, Azərbaycan;
E.mail: alisaleh@rambler.ru

**Məqalədə Azərbaycanın Şirvan zonası çaylarının makrozoobentosu haqqında məlumat verilir. Tədqiqat zamanı çaylardan 15 sistematik qrupa daxil olan 102 növ makrobentik orqanizm aşkar olunmuşdur. Onlardan 11 növ xironomid sürfələrinə, hər biri 10 növ olmaqla molyuska və sərtqanadlı böcəklərə aiddir. Digər qruplar isə 2-9 növlə təmsil olunmuşdur. Bentik orqanizmlərin biokütləsi 0,29-0,69 q/m$^2$, sayı isə 76-182 fərd/m$^2$ arasında dəyişmişdir. Növlərin maksimal sayı Göyçayda (70 növ), minimal sayı isə Dəmiraparançayda (42 növ) müşahidə olunur.**

***Açar sözlər:*** *makrozoobentos, biokütlə, saprobluq, indikator*

## GİRİŞ

Azərbaycanın Şirvan zonası Böyük Qafqazın cənub yamacında yerləşir. Bölgənin çayları dağ əlamətlərinə xas olan - sürətli axara, oksigen zənginliyi, aşağı temperaturlu suya və s. xüsusiyyətlərə malikdir. Çayların mühüm iqtisadi əhəmiyyəti olub, onlardan əhalinin su təhcizatında, suvarma işlərində, enerji alınmasında, balıqçılıq təsərrüfatının inkişaf etdirilməsində geniş istifadə olunur. Şirvan zonası çaylarının hidrofaunası, onun mühüm tərkib hissəsi olan makrozoobentosu indiyə qədər tədqiq olunmamışdır. Məlumdur ki, makrobentik orqanizmlər su hövzələrinin bioloji məhsuldarlığının formalaşmasında mühüm rol oynayır. Eyni zamanda həmin orqanizmlər suyun təbii yolla bioloji təmizlənməsində fəal iştirak edir, bəzi növləri isə suyun üzvi maddələrlə çirklənmə dərəcəsinin göstəricisidirlər, ekosistemdə qida zəncirinin bir həlqəsini təşkil edirlər.

## MATERİAL VƏ METODLAR

2008-2009-cu illərdə ilk dəfə olaraq Böyük Qafqazın cənub yamacında yerləşən Şirvan zonasının Axoxçay, Axsuçay, Bumçay, Dəmiraparançay, Girdimançay, Göyçay, Vəndamçay, Turyançay çaylarının müxtəlif hissələri və biotoplarından makrozoobentosa dair nümunələr toplanıb təhlil olunmuşdur. Tədqiqat işləri V.Jadin (1956) metodu əsasında yerinə yetirilmişdir. Bölgənin çaylarından 15 sistematik qrupa daxil olan 102 növ bentik orqanizm aşkar olunmuşdur. Aşkar olunan növlərin 62 növü (61%) su həşəratlarının payına düşür. Su həşəratlarından isə 11 növü xironomid sürfələrinə, 10 növü sərtqanadlılara, 9 növü gündəcələrə, 7 növü isə iynəcə sürfələrinin payına düşür. Digər qruplar isə molyuskalar 10, azqıllı qurdlar 7 növlə təmsil olunmuşlar. Minimal sayda isə (3 növ) onayaqlı xərçənglərdə müşahidə olunur (Cədvəl 1).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Axoxçay Əyriçayın sağ qolu olub, başlanğıcını Böyük Qafqazın cənub yamacından (2000m) alır. Çayın uzunluğu 25 km, hövzəsinin sahəsi 691 km$^2$, İsmayıllı rayonu ərazisindən axır (Məmmədov, 2002; Müseyibov, 1998; Həsənov, 1973). Suyunun əsas hissəsini yağış suları təşkil edir. Çayda tez-tez sel hadisələri müşahidə olunur. Tədqiqat dövründə suyun temperaturu 9,6-22,4$^o$C, pH-ı 7.1-7,4, oksigen rejimi 8,6-8,8 mq/l olmuşdur. Çaydan toplanmış materialların təhlili nəticəsində 14 sistematik qrupa daxil olan 64 növ bentik orqanizm qeydə alınmışdır (Cədvəl 1). Növlərin sayına görə molyuskalar dominantlıq təşkil edir (8 növ). Minimal sayda növ onayaqlı xərçənglər və su gənələrində (hər biri 2 növ) müşahidə olunmuşdur. Növlərinin sayına görə ikinci yerdə gündəcə sürfələri durur (7 növ). Digər qruplar isə 2-6 növlə təmsil olunmuşlar. Aşkar olunan növlərin rastgəlmə intensivliyinə görə *Costatella acuta, Anisus spirorbis, Valvata pulchella, Corbicula cor, Sphaerium lacustre, Ephemella ignita, Baetis rhodani, Caenis macrura, Ordella macrura, Notonecta lutea, Bidessus pusillus, Ecnomus tenellus, Limnophilus flavicornis, Leptocerus tineiformis, Oecetis furva* və s. növlər fərqlənirlər.

Bentik orqanizmlərin ümumi biokütləsi 0,35 q/m$^2$, sayı isə 110 fərd/m$^2$ olmuşdur. Qruplar üzrə orqanizmlərin biokütləsi 0,02-0,08 q/m$^2$, sayı isə 8-22 fərd/m$^2$ arasında dəyişmişdir (Cədvəl 2).

Çayda say dinamikası və biokütləsinə görə bulaqçılar (22 fərd/m$^2$; 0,08 q/m$^2$) üstünlük təşkil edir. 2-ci yerdə isə molyuskalar (16 fərd/m$^2$; 0,04 q/m$^2$) durur.

Axsuçay başlanğıcını Böyük Qafqaz dağlarının

cənub yamacından alır. Uzunluğu 75 km, hövzəsinin sahəsi 631km$^2$-dir (Məmmədov, 2002; Müseyibov, 1998; Həsənov, 1973). Müşahidələr zamanı suyun temperaturu 14-25,2$^o$C, pH-ı 7,8-7,9, oksigen rejimi 8,9-9.1 mq/l olmuşdur. Çaydan 14 sistematik qrupa daxil olan 55 növ bentik orqanizm aşkar olunmuşdur. Aşkar olunan qruplar içərisində növlərin sayına görə bulaqçılar (8 növ) dominantlıq təşkil edir. Digər qruplar isə 2-6 növlə təmsil olunmuşlar (Cədvəl 1). Növlərin rastgəlmə intensivliyinə görə *Nais communis, Branchiura sowerbyi, Eiseniiella tetraedra, Piscicola geometra, Hydrobia longiscata, Ecnomus tenellus, Hydropsyche ornatula, Limnophilus flavicornis, Leptocerus tineiformis, Oecetis furva, Corixa punctata, Berosus spinosus, Procladius choerus* və s. növlər fərqlənirlər.

Çayda bentik orqanizmlərin biokütləsi 0,50 q/m$^2$, sayı isə 128 fərd/m$^2$ olmuşdur. Orqanizmlərin qruplar üzrə biokütləsi 0,01-0,12 q/m$^2$, sayı isə 6-30 fərd/m$^2$ arasındda dəyişmişdir. Say dinamikası və biokütləsinə görə gündəcə sürfələri (30 fərd/m$^2$; 0,12 q/m$^2$) dominantlıq təşkil etmişdir (Cədvəl 2).

Bumçay başlanğıcını Böyük Qafqaz dağ silsiləsinin cənub yamacından (3400 m yüksəklikdən) alır. Turyançayın sol qolu olub, uzunluğu 51 km, hövzəsinin sahəsi 450 km$^2$-dır. Qəbələ rayonunun ərazisindən axır (Məmmədov, 2002; Müseyibov, 1998; Həsənov, 1973).

Tədqiqat zamanı çaydan 10 sistematik qrupa daxil olan 56 növ bentik orqanizm qeydə alınmışdır.Aşkar olunan növlərin sayına görə 1-ci yerdə xironomid sürfələri (9 növ). 2-ci yerdə isə gündəcə sürfələri (8 növ) dominantlıq edir. Sonrakı yerləri yarımsərtqanadlılar (7 növ), azqıllı qurdlar (6 növ) tutur (Cədvəl 1). Digər qruplar isə 3-5 növlə təmsil olunurlar. Çayda növlərin rastgəlmə intensivliyinə görə *Branchiura sowerbyi, Lumbricillus lineatus, Eiseniella tetraedra, Costatella integra, Valvata pulchella Gammarus lacustris, Eylais hamata, Lestes sponsa, Baetis rhodani, Siphlonurus linnaenus, Cloeon dipterum, Corixa punctata, Sigara falleni, Berosus spinosus, Tabanus sp., Helius sp., Stempellina bausei, Micropsectra praecox, Chironomus thummi* və s. növlər dominantlıq təşkil edirlər.

Çayda bentik orqanizmlərin biokütləsi 0,28 q/m$^2$, sayı isə 76 fərd/m$^2$ olmuşdur. Qruplar üzrə orqanizmlərin biokütləsi 0,01-0,08 q/m$^2$, sayı isə 2-18 fərd/m$^2$ arasında dəyişmişdir (cədvəl 2).

Dəmiraparançay başlanğıcını Baş Qafqaz dağ silsiləsinin cənub yamacından (3850 m yüksəklikdən) alır. Bu çay Türyançayı əmələ gətirən əsas qollardan biri olub, Qəbələ rayonu ərazisindən axır. Uzunluğu 69 km, hövzəsinin sahəsi 596 km$^2$-dir. Tədqiqat dövründə suyun temperaturu 15,1- 24,2$^o$C, pH – 7,4-7.6, oksigen rejimi 8,6-8,8 mq/l olmuşdur.

Çaydan 12 sistematik qrupa daxil olan 42 növ bentik orqanizm qeydə alınmışdır. Aşkar olunan növlərin sayına görə bulaqçılar (7 növ) dominantlıq təşkil edir. Digər qruplar 1-5 növdən ibarət olmuşdur (Cədvəl 1).

**Cədvəl 1.** Şirvan zonası çaylarının makrozoobentosunun qruplar üzrə növlərinin sayı

| № | Qruplar | Çaylar | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | **Növlərin ümumi sayı** | **Axoxçay** | **Ağsuçay** | **Bumçay** | **Dəmiraparançay** | **Girdimançay** | **Göyçay** | **Vəndamçay** | **Türyançay** |
| 1 | *Oligochaeta* | 7 | 5 | 5 | 6 | 3 | 4 | 4 | 3 | 5 |
| 2 | *Hirudinea* | 6 | 5 | 2 | - | - | 1 | 2 | 2 | 3 |
| 3 | *Mollusca* | 10 | 8 | 4 | 3 | 2 | 3 | 8 | 6 | 4 |
| 4 | *Ostracoda* | 3 | 3 | - | - | - | 3 | 2 | 2 | - |
| 5 | *Amphipoda* | 7 | 4 | 3 | 2 | 3 | 5 | 4 | 3 | 2 |
| 6 | *Decapoda* | 3 | 2 | 2 | - | 2 | 2 | 2 | 1 | 3 |
| 7 | *Hydracarina* | 4 | 2 | 2 | - | - | 2 | 2 | 1 | 2 |
| 8 | *Odonata* | 7 | 4 | 5 | 6 | 4 | 4 | 7 | 6 | 8 |
| 9 | *Ephemeroptera* | 9 | 7 | 6 | 8 | 5 | 4 | 8 | 7 | 4 |
| 10 | *Trichoptera* | 8 | 6 | 8 | 5 | 7 | 5 | 8 | 7 | 3 |
| 11 | *Hemiptera* | 7 | 5 | 3 | 7 | 3 | 3 | 5 | 4 | 2 |
| 12 | *Coleoptera* | 10 | 4 | 4 | 6 | 4 | 5 | 6 | 7 | 5 |
| 13 | *Diptera* | 8 | 3 | 4 | 5 | 3 | 4 | 5 | 4 | 3 |
| 14 | *Chironomidae* | 11 | 6 | 5 | 9 | 5 | 4 | 9 | 5 | 2 |
| 15 | *Ceratopogonidae* | 2 | - | 2 | - | 1 | 2 | - | 2 | - |
| | Cəmi | 102 | 64 | 55 | 56 | 42 | 51 | 70 | 58 | 46 |

**Cədvəl 2.** Şirvan zonası çaylarının makrozoobentosunun sayı və biokütləsi ((fərq/q)·m$^2$)

| № | Qruplar | Çaylar | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | | **Axoxçay** | **Ağsuçay** | **Bumçay** | **Dəmiraparançay** | **Girdimançay** | **Göyçay** | **Vəndamçay** | **Türyançay** |
| 1 | *Oligochaeta* | 10/0,03 | 6/0,02 | 2/0,01 | 4/0,02 | 12/0,04 | 14/0,05 | - | - |
| 2 | *Mollusca* | 16/0,04 | 20/0,10 | 18/0,08 | 14/0,05 | 10/0,02 | 40/0,20 | 24/0,14 | - |
| 3 | *Amphipoda* | 8/0,03 | 16/0,05 | - | 20/0,08 | - | 26/0,08 | - | 20/0,05 |
| 4 | *Odonata* | 14/0,06 | 22/0,10 | - | 10/0,04 | - | - | 24/0,14 | 24/0,14 |
| 5 | *Ephemeroptera* | 14/0,04 | 30/0,12 | 18/0,05 | - | 13/0,03 | 30/0,12 | - | 20/0,06 |
| 6 | *Trichoptera* | 22/0,08 | 16/0,06 | 10/0,03 | 18/0,04 | - | 10/0,03 | 20/0,08 | - |
| 7 | *Hemiptera* | - | 12/0,04 | - | - | 16/0,06 | - | 10/0,02 | - |
| 8 | *Coleoptera* | 8/0,02 | 6/0,01 | 12/0,04 | - | 10/0,07 | 10/0,04 | 14/0,04 | 12/0,03 |
| 9 | *Diptera* | 10/0,03 | - | 16/0,07 | 20/0,08 | 6/0,01 | 36/0,10 | 8/0,01 | 11/0,02 |
| 10 | *Chironomidae* | 8/0,02 | - | - | - | 18/0,06 | 16/0,07 | 10/0,04 | 20/0,08 |
| | **Cəmi** | 110/0,35 | 128/0,50 | 76/0,28 | 84/0,34 | 95/0,29 | 182/0,69 | 102/0,36 | 111/0,30 |

Növlərin rastgəlmə intensivliyinə görə *Auloforus furcatus, Lymnaea stagnalis, Anisus spirorbis, Gammarus matienus, Agrion virgo, Anax imperator, Ecnomus tenellus, Hydropsyche ornatula, Leptocerus tineiformis, Oecetis furva, Hydrometra stagnorum, Velia rivulorum, Colymbetes fuscus, Limnochironomus tritomus, Endochironomus dispar* və s. növlər fərqlənirlər. Çayda bentik orqanizmlərin biokütləsi 0,34 q/m$^2$, sayı isə 84 fərd/m$^2$ olmuşdur (Cədvəl 2).

Girdimançay başlanğıcını Babadağ aşırımının 1 km cənub-şərqindən (2900 m yüksəklikdən) alaraq, süni kanal vasitəsilə Kür çayına sol tərəfdən birləşir. Uzunluğu 88 km, hövzəsinin sahəsi 727 km$^2$-dir. Suyu sulfatlı-natriumlu olmaqla minerallaşması 560 mq/l-dir.

Müşahidələr dövründə çaydan 51 növ bentik orqanizm aşkar edilmişdir. Aşkar olunan növlərin sayına görə bulaqçılar (7 növ) dominantlıq təşkil edir. Qalan qruplar 1-5 növdən ibarətdir (cədvəl 1). Rastgəlmə intensivliyinə görə isə *Nais elinguis, Lymnaea auricularia, Ancylus fluviatilis, Corbicula fluminalis, Pontogammarus robustoides, Ecnomus tenellus, Hydropsyche ornatula, H.instabilis, Leptocerus tineiformis, Oecetis furva, Gyrinus minutus* və s. növlər dominantlıq təşkil edir.

Çayda bentik orqanizmlərin biokütləsi 0,29 q/m$^2$, sayı isə 95 fərd/m$^2$ arasında dəyişmişdir (Cədvəl 2).

Göyçay çayı başlanğıcını Böyük Qafqazın cənub yamacından (1980 m yüksəklikdən) alıb, sol tərəfdən süni kanal vasitəsilə Kür çayına birləşir. Cənub yamacdan axan çaylar arasında ən çox sululuğa malik olması ilə fərqlənir.

Tədqiqat dövründə çayın suyunun temperaturu 12,3-21,8°C, pH 7,4-7,5, oksigen rejimi 8,1-8,4 mq/l olmuşdur.

Çaydan 14 sistematik qrupa daxil olan 70 növ bentik orqanizm aşkar olunmuşdur (cədvəl 1). Növlərin sayına görə xironomid sürfələri (9 növ), molyuskalar, gündəcə sürfələri, bulaqçılar, sərtqanadlılar hər biri 8 növlə dominantlıq təşkil edir. Sonrakı yerləri iynəcə sürfələri (7 növ), yarımsərtqanadlılar (5 növ) tutur. Növlərin rastgəlmə intensivliyinə görə *Lymnaea auricularia, Costatella acuta, Corbicula cor, Coenagrion scitulum, Lestes sponsa, Agrion virgo, Ecnomus tenellus, Hydropsyche ornatula, H. instabilis, Oecetis furva, Notonecta lutea, Gerris lacustris, Hydroporus planus, Tabanus sp., Tipula sp., Cryptochironomus defectus, Ch.thummi, Einfeldia pagana, Limnochironomus nervosus, Endochironomus tendens, Microtendipes chloris* və s. növlər fərqlənirlər.

Çayda bentik orqanizmlərin biokütləsi 0,69

q/m$^2$, sayı isə 182 fərd/m$^2$ olmuşdur. Miqdarca inkişafına görə molyuskalar (40 fərd /m$^2$; 0,20 q/m$^2$) üstünlük təşkil edir. Qruplar üzrə orqanizmlərin biokütləsi 0,03-0,20 q/m$^2$, sayı isə 10-40 fərd/m$^2$ arasında dəyişmişdir (Cədvəl 2).

Vəndamçay Göyçay çayının sağ qolu olub, Kür çayına birləşir. Uzunluğu 98 km, hövzəsinin sahəsi 629 km$^2$-dir.

Tədqiqat dövründə suyun temperaturu 13,4-19,6$^o$C, pH-ı 7,1-7,2, oksigen rejimi 8,9-9,0 mq/l olmuşdur (Məmmədov, 2002; Müseyibov, 1998; Həsənov, 1973).

Çaydan 15 sistematik qrupa daxil olan 58 növ bentik orqanizm qeydə alınmışdır. Aşkar olunan qruplardan xironomid sürfələri (8 növ), gündəcə sürfələri, bulaqçılar, sərtqanadlılar (hər biri 7 növlə) dominantlıq təşkil etmişdir. Qalan qruplar isə 1-6 növdən ibarətdir. Növlərin rastgəlmə intensivliyinə görə *Auloforus furcatus, Lymnaea auricularia, Corbicula cor, Valvata pulchella, Gammarus lacustris, Palaemon elegans, Sympucna fusca, İschnura elegans, Ephemerella ignita, Caenis macrura, Cloeon dipterum, Laccophilus hyalinus, Gyrinus minitus, Hydrous piceus, Lymnophilia sp., Ephydra sp., Procladius choerus* və s. növlər fərqlənirər.

Çayda bentik orqanizmlərin biokütləsi 0,36 q/m$^2$, sayı isə 102 fərd/m$^2$ olmuşdur. Saya görə gündəcə sürfələri (30 fərd/m$^2$), biokütləyə görə molyuskalar 0,20 q/m$^2$ üstünlük təşkil edir (Cədvəl 2).

Türyançay Kür çayının sol qolu olub, Baş Qafqaz silsiləsinin cənub yamacından axaraq Qəbələ, Ucar, Ağdaş və Zərdab rayonlarının ərazisindən axır. Uzunluğu 180 km, hövzəsinin sahəsi 1840 km$^2$-dir (Məmmədov, 2002; Müseyibov, 1998; Həsənov, 1973). Başlanğıcını Bazardüzü dağının cənub-qərb yamacından (3680 m yüksəklikdən) götürür.

Müşahidələr zamanı çaydan 46 növ bentik orqanizm aşkar edilmişdir. Növlərin rastgəlmə intensivliyinə görə *Nais communis, N.elinguis, Lymnaea auricularia, Corbicula cor, Coenagion concinnum, C.scitulum, Agrion virgo, Ephemerella ignita, Baetis rhodani, Ecnomus tenellus, Hydropsyche ornatula, Leptocerus tineiformis, Chironomus thumnu* və s. növlər fərqlənirlər.

Çayda bentik orqanizmlərin miqdarca inkişafı müxtəlif olmuşdur. Orqanizmlərin qruplar üzrə biokütləsi 0,02-0,08 q/m$^2$, sayı isə 11-26 fərd /m$^2$ arasında dəyişmişdir. Bentik orqanizmlərin ümumi biokütləsiu 0,30 q/m$^2$, sayı isə 111 fərd/m$^2$ olmuşdur.

Bentik orqanizmlərin saprob zonalar üzrə yayılması da araşdırılmışdır (Макрусин, 1974, Семерной, 2002, Танкевич, 2008). Məlum olmuşdur ki, çaylardan aşkar olunan 102 növün 80-i oliqosaproblar, 12 növü β-mesosaproblara, 10 növü isə digər qruplara (ʆ-mesosaprob, polisaproblara) aiddir.

Məlumdur ki, çaylarda bentik orqanizmlər fəsillərdən asılı olaraq, eyni zamanda suyun axın sürətindən asılı olaraq dəyişir. Cədvəl 1-dən göründüyü kimi çaylarda molyuskalar (12 növ), gündəcə sürfələri (10 növ), sərtqanadlılar (10 növ) digər qruplar isə 2-8 növlə təmsil olunmuşlar. Qeyd etmək lazımdır ki, alınan nəticələr bölgədə balıqçılıq (forel balıqlarının) təsərrüfatının inkişaf etdirilməsində istifadə olunacaqdır.

## ƏDƏBİYYAT


**Məmmədov M.A.** (2002) Azərbaycanın hidroqrafiyası. Bakı: Nafta-pressa: 169 s.

**Müseyibov M.A.** (1998) Azərbaycanın fiziki coğrafiyası. Bakı: Maarif: 398 s.

**Həsənov M.A. və b.** (1973) Azərbaycanın çayları, gölləri və su anbarları. Bakı: Azərb. Dövlət nəşriyyatı: 135 s.

**Жадин В.И.** (1956) Методика изучения донной фауны водоемов и экологии донных безпозвоночных. *В кн: Жизнь пресных вод СССР,* **4 (часть I):** 226-288

**Макрушин А.В. (**1974**)** Биологический анализ качества вод. Л., ЗИН АН ССР: 60 с.

**Семерной В.П.** (2002) Санитарная и техническая гидробиология. Ярославский государственный университет: 150 с.

**Танкевич П.Б.** (2008) Санитарная и техническая гидробиология. Керченский ГМТУ: 80 с.

**Макрозообентос Рек Ширванской Зоны Азербайджана**

**С.И.Алиев**

*Институт зоологии НАНА*

В статье дана информация о макрозообентосе рек Ширванской зоны Азербайджана. В ходе исследования было выявлено 102 вида макробентических организма, относящихся к 15 систематическим группам. Из них 11 видов относятся к личинкам хирономид, каждый из которых представлен 10 видами моллюсков и жесткокрылых насекомых. Остальные группы представлены 2-9 видами. Биомасса бентических организмов составила 0,29-0,69 г/м$^2$, а количество колебалось от 76 до 182 экз./м$^2$. Максимальное количество видов наблюдается в Гейчае (70 видов), а минимальное количество в Демирапаранчае (42 вида).

***Ключевые слова:*** *макрозообентос, биомасса, сапробность, индикатор*

**Macrozoobenthos Of Shirvan Zone Rivers Of Azerbaijan**

**S.I. Aliyev**

*Institute of Zoology, ANAS*

The article provides information on macrozoobenthos of the rivers of Shirvan area of Azerbaijan. İn the study there were identified 102 species of makrobentic organisms belonging to 15 taxonomic groups. 11 species of organisms are larvae of chironomids, each represented by 10 species of mollusks and coleopteran insects. Other types of groups are presented by 2-9 species. Biomass of benthic organisms was 0.29-0.69 g/m$^2$, and their number ranged from 76 to 182 ind./m$^2$. Maximum number of species was observed in Geychai (70 species), and the minimum number in Demiraparanchai (42 species).

***Key words:*** *makrozoobentos, biomass, saprobe, indicator*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 68, №3, səh. 177-183 (2013)*

# Eymerioz (*Eimeria Tenella*) Zamanı Oksidreduktaza və Transferaza Siniflərindən Olan Bəzi Fermentlərin Aktivliyinin Dinamikası

**E.İ.Əhmədov**

*AMEA Zoologiya İinstitutu, A.Abasov küç., 1128 döngə, Bakı AZ1073, Azərbaycan;*

**Yerli cinsdən olan qara toyuq cücələrinin eymeriozu və onun baykoksla müalicəsi zamanı qanın eritrositlərində qlutationreduktaza (QR) (EC.1.6.4.2) və qlukozo-6-fosfatdehidrogenazanın (Q-6FDH) (EC.1.1.1.49), qan zərdabında laktatdehidrogenazanın (LDH) (EC.1.1.1.27), qara ciyərdə, beyin və əzələlərində isə aspartataminotransferaza (AST) (EC.2.6.1.1) və alaninaminotrasferazanın (ALT) (EC.2.6.1.2) aktivliyi öyrənilmişdir. Müəyyən edilmişdir ki, 2,5%-li baykoksun 2ml/litr dozası (2 ml preparat 1 litr suda həll edilmişdir) ilə yoluxdurulmuş quşların müalicəsi orqanizmdə baş verən patoloji proseslərin qarşısını alır, qanın hematoloji göstəricilərinin və QR-in aktivliyinin normada saxlanılmasına səbəb olur. Q-6FDH-nın aktivliyi yoluxdurulmuş quşların eritrositlərində kontrolla müqayisədə azalır, müalicə olunanlarda isə əksinə onun aktivliyi artır. Baykoks eritrositlərdə Q-6FDH aktivliyində əlavə dəyişikliklərə səbəb olur. LDH-nın aktivliyi isə yoluxdurulmuş quşlarda invaziyanın prepatent dövründə azalır. Müalicə məqsədilə tətbiq edilən baykoks LDH-nın aktivliyinin bərpa olunmasına səbəb olmur. Yoluxdurulmuş quşların əzələlərində ALT-nin aktivliyinin dəyişməsi qara ciyər və beyində olduğu kimi baş verir. AST-nin ən yüksək aktivliyi beyin, qara ciyər və əzələlərdə, ALT–nin ən yüksək aktivliyi isə əzələlərdə olur. Qara ciyər və beyində AST-nin aktivliyi eynidir, qara ciyərdə isə ALT-nin aktivliyi beyindəkindən yüksəkdir.**

***Açar sözlər:*** *ALT, AST, eritrosit, eymerioz, ferment, hemoqlobin, koksidioz, Q-6FDH, LDH*

## GİRİŞ

Koksidiozun 100 ildən artıq bir müddətdə öyrənilməsinə və ona qarşı müxtəlif yeni mübarizə və profilaktika tədbirlərinin tətbiq edilməsinə baxmayaraq koksidioz hələ də dünyanın quşçuluq təsərrüfatlarına iqtisadi zərər vurmaqda davam edir (Maxwell, 1997; Julian, 1993; Maxwell, Robertson, 1997; Dallouil, Lillehoj, 2006; Guo et al., 2007; Kraljevi et al., 2009). Fermentlərin öyrənilməsi parazitar xəstəliklər zamanı patoloji proseslərin mexanizmlərinin aydınlaşdırılmasında böyük əhəmiyyət kəsb edir. Belə ki, fermentlərin iştirakı ilə sahibin toxumalarında və parazitdə mürəkkəb biokimyəvi proseslər həyata keçirilir. Parazitar xəstəliklər, o cümlədən də koksidioz, sahibin orqanizmində fermentlərin aktivliyinin dəyişməsinə səbəb olur (Wirz et al., 1990; Jaff et al., 1996; Zantop, 1997; Prat, Kaplan, 2000; Sabatakou et al., 2007; Topchiyeva, Ahmadov, 2011).

Fermentlərin öyrənilməsi xəstəliklərə qarşı müalicə və profilaktika tədbirlərinin aparılmasında və effektiv seçici xüsusiyyətə malik, sahibin orqanizminə təsir etməyən yeni dərman preparatlarının yaradılması və sınaqdan keçirilməsində böyük əhəmiyyət kəsb edir.

Ədəbiyyat məlumatlarının təhlili göstərir ki, koksidiozun müalicə və profilaktikasında tətbiq edilən preparatların qan, beyin, qara ciyər, əzələ kimi toxumalarda fermentlərin aktivliyinə təsirinin öyrənilməsi istiqamətində aparılan tədqiqatlar çox azdır (Gokhan et al., 2004). Bu tədqiqatların hamısı broyler cücələri üzərində aparılmışdır. Digər cinslərdən olan cücələr üzərində bu istiqamətdə aparılan tədqiqat işlərinə təsadüf etmədik.

Tədqiqatlarda məqsəd, yerli cinsdən olan qara toyuq cücələrinin eymeriozu və onun baykoksla müalicəsi zamanı qanın eritrositlərində QR və Q-6FDH, qan zərdabında LDH, qara ciyər, beyin və əzələlərdə AST və ALT aktivliyinin dinamikasının tədqiqidir.

## MATERİAL VƏ METODLAR

Tədqiqatlar AMEA Zoologiya İnstitutu Parazit-sahib münasibətlərinin biokimyəvi əsasları laboratoriyasında 2010-2013-cü illərdə yerli cinsdən olan 80 baş toyuq cücələri üzərində aparılmışdır. Sutkalıq cücələr institutun vivariumunda steril şəraitdə 20 günlük yaşa qədər böyüdülmüşdür. Bu zaman quşlar standart broyler təsərrüfatlarında istifadə edilən tərkibində antikoksidiostatik əlavələr və antibiotiklər olmayan yemlə qidalandırılmışdır. 20 günlük cücələr kontrol (20 cücə) və təcrübə qrupu olmaqla (60 cücə) iki qrupa ayrılmışdır. Təcrübə qrupunun cücələri *Eimeria tenella* parazitinin 20000 sporlaşmış oosistasını cücələrin çinədanına pipetka vasitəsilə daxil edilməklə yoluxdurulmuşdur.

İkinci qrupun cücələri yoluxdurmadan 1 sutka sonra yenidən iki qrupa ayrılmışdır. Birinci qrupa baykoks (2,5%-li baykoksun 2 ml–ni 1L suda həll etməklə) verilmiş, ikinci qrup isə yoluxdurulmuş kontrol qrup kimi saxlanılmışdır.

Biokimyəvi analizlər üçün yoluxdurma və müalicənin 3, 5, 7 və 10-cu günləri 5 cücə kəsilmişdir. Eritrositlərdə QR aktivliyini təyin etmək üçün 1:10 nisbətində distillə suyu ilə yuyulmuş eritrositlərdən 0,05ml götürərək, içərisində 1,8 ml 0,1M kalium fosfat buferi (pH 7,0) 1mM EDTA və 0,1 ml oksidləşmiş qlutation olan (optiki yolu 10 mm) küvetə əlavə edilmişdir. Sonra məhlulun üzərinə 0,1 ml NADF·H əlavə edilərək 3 dəqiqə müddətində 340 nm dalğa uzunluğunda optiki sıxlığı ölçülmüş, fermentin aktivliyi mkmol/dəqiqə·*l* ifadə edilmişdir (Карпищенко, 2013).

Eritrositlərdə Q-6FDH aktivliyi spektrofotometrik metodla öyrənilmışdir. Bu metod Q-6FDH fosfoqlükolaktona oksidləşməsi zamanı NADF·H-ın miqdarının spektrofotometrik üsulla təyininə əsaslanır. Bu metoda görə qan 10 dəqiqə 3000 dövr/dəqiqə (BioSan LM-3000) sentrifuqa edildikdən sonra plazma atılıb, çöküntü soyuq fizioloji duz məhlulunda yuyulmuşdur (antikoaqulyant kimi natrium sitratdan istifadə edilmişdir). Sınaq şüşələrindən birinə 4,7 ml fizioloji duz məhlulu, digərinə isə 4,7 ml inisiator mühiti (4,1 ml buferləşdirilmış fizoloji duz məhlulu (136 q $KH_2PO_4 \cdot 2H_2O$+70q NaON+1 litrə qədər distillə suyu)+0,5 ml askorbin turşusu məhlulu +0,05 ml dəmir sulfat məhlulu+0,05 ml $D_3$ vitaminin spirtdə məhlulu) əlavə edilmişdir. Sonra sınaq şüşələrinin hər birinə 0,3 ml yuyulmuş eritrosit əlavə edilərək 30 dəqiqə 37°C-də inkubasiya olunmuşdur. Eritrositlərin hemolizatı isə aşağıdakı qaydada hazırlanmışdır. 0,3 ml eritrosit çöküntülərinin hər birinin üzərinə 1,2 ml soyuq distillə suyu əlavə edilərək (0,02% diqitonin məhlulunun iştirakı ilə) 4°C-də 30 dəqiqə saxlanıldıqdan sonra 3000 dövr/dəqiqə sürətlə 10 dəqiqə müddətində sentrifuqa edilib. Sentrifuqatdan tədqiqatlarda istifadə olunmuşdur.

Fermentin aktivliyini təyin etmək üçün spektrofotometrin küvetinə 2,9 ml trietanol buferi, 0,02 NAD və 0,02 ml hemolizat əlavə edilib qarışdırılmışdır, otaq temperaturunda (25°C) 5 dəqiqə saxlanıldıqdan sonra onun üzərinə qlükozo-6-fosfat əlavə edilmişdir. Substrat məhlulu əlavə edilən kimi nümunənin 340 nm dalğa uzunluğunda 5 dəqiqə müddətində, hər dəqiqədən bir optiki sıxlığı ölçülmüşdür. Q-6FDH-nın aktivliyi, mkmol/saat·qHb ilə göstərilmişdir (Карпищенко, 2013).

Qan zərdabında LDH aktivliyi 2,4-dinitrofenilhidrazin reaksiyasına (Sevel-Tovareka metodu) görə öyrənilmişdir (Кондрахина, 2004).

LDH-nın aktivliyini təyin etmək üçün 1:2 nisbətində duruldulan 0,1 ml qan zərdabı 0,3 ml NAD məhlulu ilə qarışdırılıb, 5 dəqiqə 37°C temperaturda saxlandıqdan sonra üzərinə 0,8 ml 0,03 mol/l natrium pirofosfat və əvvəlcədən $37^0$C-yə qədər qızdırılmış 0,02 ml 0,45mol/l natrium laktat əlavə edilib 37°C-də 15 dəqiqə müddətində inkubasiya olunmuşdur. İnkubasiyadan həmən an sonra onun üzərinə 0,5ml 2,4-dinitrofenilhidrazin əlavə edilərək otaq temperaturunda 20 dəqiqə saxlanılmış, sonra onun üzərinə 5ml 0,4mol/l natrium hidroksid məhlulu əlavə edilərək 10 dəqiqə gözlədikdən sonra spektrofotometrdə optiki yolu 1 sm olan küvetdə, 500nm dalğa uzunluğunda optiki sıxlığı ölçülmüşdür. Fermentin aktivliyi kalibrovka qrafikinə görə hesablanmışdır. LDH aktivliyi nmol NAD/saat·l ilə göstərilmişdir (Кондрахина, 2004).

ALT və AST-nin aktivliyi dinitrofenil-hidrazin (Raytman və Frenkel metodu) metodu ilə təyin edilmişdir (Колб, Камышников, 1976).

Quşlar dekapitasiya olunduqdan sonra tez bir anda çıxarılan orqandan 1q toxuma götürülərək üzərinə 1:9 nisbətində 0,25M saxaroza məhlulunda hazırlanan 0,1 mM ETDA əlavə edilərək soyuq mühitdə şüşə homogenizatorda əzilmişdir. Alınan homogenat 10 dəqiqə 5000 dövr/dəqiqə sürətlə K24 sentrifuqasında çökdürülmüşdür. Supernatant saxaroza məhlulunda 1:50 nisbətində duruldulmuşdur. AST-nin aktivliyini təyin etmək üçün sınaq şüşəsinə 0,5 ml substrat məhlulu əlavə edilmiş və onun da üzərinə 0,1ml homogenat əlavə edilərək sınaq şüşəsi 1 saat müddətində 37°C-də termostatda saxlanılmışdır. 1 saatdan sonra sınaq şüşəsinə 0,5 ml dinitrofenilhidrazin əlavə edilib 20 dəqiqə müddətində otaq temperaturunda saxlanılmış, vaxt tamam olandan sonra məhlulun üzərinə 5 ml 0,4 N NaOH məhlulu əlavə edilərək otaq temperaturunda 10 dəqiqə rəngin intensivləşməsi üçün saxlanılmışdır. Nümunənin optiki sıxlığı 530 nm dalğa uzunluğunda ölçülmüşdür.

AST-nin aktivliyini təyin etmək üçün sınaq şüşəsinə əlavə edilən 0,5 ml substratın üzərinə 0,1 ml homogenant əlavə edilərək termostatda 30 dəqiqə müddətində 37°C temperaturda inkubasiya edilmişdir. Analizin sonrakı mərhələsi ALT-nin aktivliyinin müəyyən edilməsi zamanı istifadə olunan üsulda olduğu kimi olmuşdur. Aminotrasfera-zanın aktivliyinin hesablanması piroüzüm turşusuna görə qurulan kalibrovka əyrisi əsasında hesablanmışdır. Fermentlərin aktivliyinin hesablanmasında homogenatın duruldulması nəzərə alınmış, hesablamalarda 1 q toxumaya (mq zülal) görə ifadə edilmişdir. ALT və AST-nin aktivliyi mkmol/ml·saat ilə ifadə edilmişdir.

Alınan məlumatların statistik işlənilməsin-də

İBM Statistics 20 proqramından istifadə edilmişdir. P<0,05 olduqda baş verən dəyişikliklərin statistik dürüst olduğu qəbul edilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Alınan nəticələrin təhlili göstərdi ki, yoluxdurulmuş cücələrdə hemoqlobinin miqdarı azalır. Hemoqlobinin və hematokritin ən az miqdarına invaziyanın 7-ci günü təsadüf olunur (müvafiq olaraq P<0,01 və P<0,05) (Ахмедов, 2012).

Yoluxdurulmuş cücələrin baykoksla müalicəsi qanda hemoqlobinin və hematokritin miqdarının azalmasının qarşısını alır. Onların miqdarının kontrol qrupun göstəricilərindən az olmasına baxmayaraq, invaziyanın 7-ci günü istisna olmaqla (müvafiq olaraq P<0.01 və P<0.05) statistik dürüst deyil (cədvəl 1).

2 saylı cədvəldə verilən məlumatlardan məlum olur ki, sağlam 23 günlük qara cücələrin qan zərdabında LDH aktivliyi quşların yaşı artdıqca artır.

*E.tenella*-nın 20000 oosistası ilə yoluxdurulan qrupda LDH-nın aktivliyi azalır. İnvaziyanın 3-cü günü yoluxdurulan qrupun göstəricisi kontrol qrupun göstəricisindən 0,188 nmol/saat·l aşağı olur (P<0,001). Baykoksla müalicə olunan qrupun göstəriciləri isə həm kontrol, həm də yoluxdurulan qrupun göstəricisindən müvafiq olaraq 0,276 və 0,088 nmol/saat·l az olmuşdur. Göründüyü kimi baykoksun müalicə məqsədi ilə tətbiqinin ilk günləri preparat LDH-nın aktivliyinin yoluxdurulan qrupun göstəricilərinə nisbətən daha da azalmasına səbəb olur ki, bu preparatın əlavə təsiri ilə izah edilə bilər. Çünki preparatın verilməsi dayandırıldıqdan sonra (invaziyanın 5-ci günü) LDH-nın aktivliyi yoluxdurulan qrupun göstəricisinə nisbətən artmağa başlayır.

Yoluxdurulan qrupdan olan cücələrin qan zərdabında LDH-nın aktivliyi invaziyanın 7-ci günü invaziyanın 5-ci gününə nisbətən artmağa başlayır. Lakin, LDH-nın aktivliyi kontrol qrupun göstəricisindən 0,018 nmol/saat·l çox olmasına baxmayaraq statistik dürüst deyil (P>0,05). İnvaziyanın 7-ci günü müalicə olunan qrupda LDH aktivliyi kontrol və yoluxdurulan qrupun göstəricisindən aşağı, invaziyanın 5-ci gününün göstəricisindən isə 0,186 nmol/saat·*l* çox olur. Bu preparatın təsirindən LDH-nın aktivliyinin bərpa olunmağa başladığını göstərir. İnvaziyanın 10-cü günü həm yoluxdurulan və həm də müalicə olunan qrupda LDH-nın aktivliyi normaya qayıdır.

Beləliklə, müalicə məqsədilə baykoksun 2ml/l dozada tətbiqi merontların 1 və 2-ci generasiyası zamanı LDH-nın aktivliyinin bərpa olunmasına səbəb olmur.

Sağlam qara toyuq cücələrin eritrositlərində QR-ın aktivliyinin öyrənilməsi göstərdi ki, cücələrin yaşı artdıqca fermentin aktivliyi azalır. *E.tenella* ilə yoluxdurulan cücələrin eritrositlərində QR-ın aktivliyinin artması invaziyanın 3-cü günündən başlayır və bu proses invaziyanın 7-ci günü də davam edir. İnvaziyanın 3-cü və 5-ci günləri QR-in aktiv-liyi tədricən artsa da, 7-ci gün onun aktivliyi sürətlə artaraq 8,586 mkmol/dəqiqə·*l*-ə qədər yüksəlir (kontrol qrupda 6,688 mkmol/dəqiqə·*l*). İnvaziyanın 10-cu günü QR-in aktivliyi əvvəlki

**Cədvəl 1.** Qara toyuq cücələrinin qanında hemoqlobinin və hematokritin miqdarının dəyişməsi (M±m, n=5)

| Günlər | Kontrol cücələrin göstəriciləri | | Yoluxdurulmuş cücələrin göstəriciləri | | Müalicə edilən cücələrin göstəriciləri | |
|---|---|---|---|---|---|---|
| | **Hemoqlobin, q%** | **Hematokrit, %** | **Hemoglobin, q%** | **Hematokrit, %** | **Hemoglobin, q%** | **Hematokrit, %** |
| 3 | 8,622±0,07 | 20,2 | 8,610±0,05 | 20,0 | 8,608±0,04 | 20,1 |
| 5 | 8,482±0,37 | 21,2 | 8,400±0,03 | 21,0 | 8,478±0,05 | 21,0 |
| 7 | 8,620±0,02 | 21,4 | 8,280±0,05** | 19,1* | 8,600±0,19 | 21,3 |
| 10 | 8,700±0,11 | 21,6 | 8,600±0,06 | 21,0 | 8,607±0,05 | 21,2 |

**Qeyd: * - P<0.05, ** - P<0.01**

**Cədvəl 2.** Qara toyuq cücələrinin eymeriozu və onun baykoks ilə müalicəsi zamanı qan zərdabında QR-ın və eritrositlərdə LDH-nın aktivliyinin dinamikası

| Günlər | QR, mkmol/dəqiqə·*l*, M±Sd | | | LDH, nmol/saat·*l*, M±Sd | | |
|---|---|---|---|---|---|---|
| | **Kontrol** | **Yoluxdurulan** | **Müalicə edilən** | **Kontrol** | **Yoluxdurulan** | **Müalicə edilən** |
| 3 | 6,692±0,14 | 7,378±0,14<br>P<0,05 | 6,490±0,14<br>P>0,05 | 0,784±0,01 | 0,596±0,02<br>P<0,001 | 0,508±0,01<br>P<0,001 |
| 5 | 6,690±0,14 | 7,294±0,14<br>P<0,05 | 6,498±0,14<br>P>0,05 | 0,788±0,01 | 0,506±0,01<br>P<0,001 | 0,512±0,01<br>P<0,01 |
| 7 | 6,688±0,13 | 8,586±0,14<br>P<0,01 | 6,884±0,13<br>P>0,05 | 0,788±0,02 | 0,806±0,02<br>P>0,05 | 0,698±0,03<br>P<0,05 |
| 10 | 6,686±0,14 | 6,796±0,14<br>P>0,05 | 7,788±0,14<br>P>0,05 | 0,812±0,01 | 0,802±0,01<br>P>0,05 | 0,800±0,01<br>P>0,05 |

günə nisbətən 1,790 mkmol/dəqiqə·*l* azalaraq kontrol qrupun göstəricisinə yaxınlaşır (P<0,05).

Müalicə olunan qrupun cücələrinin eritrositlərində isə invaziyanın bütün günləri baş verən dəyişkənlik statistik dürüst deyil (P>0,05) (cədvəl 2).

Beləliklə, alınan nəticələrin təhlili göstərir ki, cücələrin eymeriozunun baykoksun 2 ml/*l* dozası ilə müalicəsi quşların orqanizmində baş verən patoloji proseslərin qarşısını alır, QR-ın aktivliyinin fizioloji norma hüdudunda saxlanılmasına səbəb olur.

Müəyyən edilmişdir ki, kontrol qrupda sağlam cücələrin yaşı artdıqca eritrositlərdə Q-6FDH nın aktivliyi də artır (cədvəl 3). *E.tenella* ilə yoluxdurulmuş cücələrin eritrositlərində Q-6FDH aktivliyinin öyrənilməsi göstərir ki, fermentin aktivliyi invaziyanın 5 və 7-ci günləri azalır, 10-cu gün isə yenidən yüksəlir (P<0,05).

**Cədvəl 3.** Qara toyuq cücələrinin eymeriozu və onun baykoks ilə müalicəsi zamanı qanda Q-6FDH aktivliyinin dinamikası

| Günlər | Q-6FDH, mkmol/saat·q Hb, M±Sd | | |
|---|---|---|---|
| | Kontrol | Yoluxdurulan | Müalicə edilən |
| 3 | 2,800±0,01 | 2,688±0,01<br>P>0,05 | 3,300±0,01<br>P<0,01 |
| 5 | 2,814±0,03 | 2,398±0,01<br>P<0,05 | 3,398±0,01<br>P>0,05 |
| 7 | 2,800±0,01 | 2,392±0,01<br>P<0,05 | 2,694±0,01<br>P>0,05 |
| 10 | 2,804±0,02 | 2,596±0,01<br>P<0,05 | 4,200±0,01<br>P<0,001 |

Müəyyən edilmişdir ki, invaziyanın 3-cü günü Q-6FDH-nın aktivliyinin azalması statistik dürüst deyil (P>0,05). İnvaziyanın 5, 7 və 10-cu günləri də fermentin aktivliyi kontrol qrupun göstəricilərindən müvafiq olaraq 0,146, 0,406 və 0,208 mkmol/saat·q Hb az olur (P<0,05).

Baykoksla müalicə olunan qrupda kontrol və yoluxdurulmuş cücələrin göstəricisinə nisbətən Q-6FDH-ın aktivliyinin artdığı (P<0,01) müəyyən edilmişdir (cədvəl3).

Parazitin endogen inkişaf mərhələsinin sona çatmasına baxmayaraq (10-cu gün) Q-6FDH-nın aktivliyi nə yoluxdurulan, nə də müalicə olunan qrupda normaya qayıtmır.

Beləliklə, Q-6FDH-nın aktivliyi yoluxdurulmuş cücələrin eritrositlərində bir qədər azalır, müalicə olunanlarda isə, əksinə, artır. Bununla yanaşı preparatın 2ml/litr dozası eritrositlərdə Q-6FDH aktivliyində əlavə dəyişikliklərə səbəb olur ki, bu da preparatın Q-6FDH aktivliyinə mənfi təsiri ilə izah edilə bilər.

Yoluxdurulmuş quşların qara ciyər, beyin və əzələlərində AST və ALT-in aktivliyinin öyrənilməsi istiqamətində əldə edilən nəticələr cədvəl 4-də verilir.

Yoluxdurulmuş cücələrin qara ciyər və beynində AST-nin aktivliyi invaziyanın prepatent dövründə statistik dürüst dəyişikliyə uğramır. Patent dövrünün əvvəlində bu fermentin aktivliyi yüksəlməyə başlayır. 10-cu gün qara ciyərdə onun aktivliyi kontrol qrupun göstəricilərinə yaxınlaşır (P<0,01), beyində isə əksinə AST aktivliyində baş verən dəyişkənlik geriyə istiqamətdə gedir, yəni bu fermentin aktivliyinin azalması onun iştirakı ilə baş verən transaminləşmə proseslərinin inaktivləşməsinə səbəb olur (cədvəl 4).

Beyin və qara ciyərdən fərqli olaraq əzələlərdə AST-nin aktivliyində dəyişkənliyin baş verməsi, prepatent dövründə onun aktivliyin azalması ilə xarakterizə olunur.

İnvaziyanın 3-cü və 5-ci günləri AST-in aktivliyi normaya nisbətən, müvafiq olaraq 13,688 və 13,698 mkmol/q·saat azalır. 7-ci gün AST-nin aktivliyinin bərpa olunması qısamüddətli xarakter daşıyır və invaziyanın 10-cu günü yenidən azalaraq 61,260 mkmol/q·saat təşkil edir (kontrol qrupda 102,218 mkmol/q·saat).

Qara ciyər, beyin və əzələlərdə AST-nin aktivliyinin müqayisəli öyrənilməsi göstərir ki, sağlam və yoluxdurulmuş cücələrin digər orqanlarına nisbətən əzələlərdə normada bu fermentin aktivliyi çox olur. Yoluxdurulmuş cücələrin əzələlərində isə AST-in aktivliyi əhəmiyyətli dərəcədə azalır (cədvəl 4).

**Cədvəl 4.** Qara toyuq cücələrinin eymeriozu zamanı qara ciyər, beyin və əzələ toxumalarında AST və ALT-nin dinamikası

| Günlər | AST, mkmol /q·saat, M±Sd | | | ALT, mkmol /q·saat, M±Sd | | |
|---|---|---|---|---|---|---|
| | Qara ciyər | Beyin | Əzələ | Qara ciyər | Beyin | Əzələ |
| **3** | 90,732±1,97<br>P<0,05 | 89,364±2,01<br>P>0,05 | 88,530±2,00<br>P<0,001 | 83,630±0,21<br>P<0,05 | 82,260±0,26<br>P>0,05 | 81,400±0,22<br>P<0,01 |
| **5** | 98,890±1,99<br>P>0,05 | 85,530±2,00<br>P<0,05 | 88,520±2,00<br>P<0,001 | 91,366±0,16<br>P>0,05 | 77,808±0,21<br>P<0,01 | 81,410±0,23<br>P<0,01 |
| **7** | 105,490±2,01<br>P<0,01 | 98,226±1,99<br>P<0,01 | 100,334±1,99<br>P>0,05 | 98,310±0,22<br>P<0,01 | 91,080±0,22<br>P<0,01 | 93,228±0,21<br>P>0,05 |
| **10** | 87,474±2,01<br>P<0,05 | 79,268±2,00<br>P<0,01 | 61,260±2,01<br>P<0,001 | 80,330±0,24<br>P<0,01 | 72,160±0,23<br>P<0,05 | 54,13±0,22<br>P<0,001 |
| **Kontrol** | 95,738±1,99 | 95,140±2,00 | 102,218±1,99 | 88,604±0,22 | 88,016±0,22 | 93,112±0,23 |

Yoluxdurulmuş cücələrin əzələlərində AST-in aktivliyinin dəyişməsi, toxumalarda başqa bir fermentin ALT-in iştirakı ilə baş verən transminləşmə reaksiyaların da pozulmasına səbəb olur.

Qara ciyərdə invaziyanın 3-cü günü, şizontların 1-ci generasiyası zamanı ALT-in aktivliyi əhəmiyyətli dəyişikliklərə məruz qalmır (P>0,5).

Parazitin sonrakı inkişaf mərhələlərində, şizontların ikinci generasiyası zamanı ALT-nin aktivliyi artır. Qara ciyərdə ALT-nin aktivliyinin artması invaziyanın 7-ci gününə qədər davam edir, 10-cu gün isə normaya yaxınlaşır.

İnvaziyanın 3-cü günü beyin toxumasında ALT-nin aktivliyi azalsa da bu dəyişkənlik statistik dürüst deyil. Kontrol cücələrdə bu göstərici 88,016 mkmol/q·saat təşkil etdiyi halda yoluxdurulmuş cücələrdə 88,260 mkmol /q·saat -a qədər yüksəlir.

İnvaziyanın 5-ci günü ALT-nin aktivliyi azalmaqda davam edir, invaziyanın 7-ci günü isə onun aktivliyi kəskin artır və hətta kontrol qrupun göstəricilərindən 3,064 mkmol/q·saat yüksək olur (P<0,01). İnvaziyanın 10-cu günü ALT-nin aktivliyi yenidən kontrol qrupun göstəricilərinə yaxınlaşır (P<0,05). Əldə edilən məlumatlardan aydın olur ki, beyində ALT-nin aktivliyinin dəyişməsi parazitin sahibin bağırsağında inkişaf mərhələlərindən asılıdır.

Yoluxdurulmuş quşların əzələlərində ALT-nin aktivliyinin azalmasına invaziyanın 3-cü və 5-ci günləri təsadüf edilir. Bu zaman əzələlərdə ALT-nin aktivliyi müvafiq olaraq 81,400 və 81,410 mkmol /q·saat olur Bu qrupdan olan cücələrin əzələlərində ALT-nin aktivliyi invaziyanın 7-ci günü normaya yaxınlaşaraq 93,228 mkmol /q·saat təşkil edir (normada 93,112 mkmol /q·saat). İnvaziyanın 10-cu günü ALT-nin aktivliyi yenidən kəskin azalır bu zaman onun aktivliyi kontrol qrupun göstəricilərindən 38,982 mkmol /q·saat az olur (P<0,001).

Alınan məlumatların müqayisəli analizi göstərir ki, normada tədqiq edilən toxumalarda AST və ALT-nin ən yüksək aktivliyi əzələlərdə olur. Qara ciyər və beyin eyni AST aktivliyinə malikdir, qara ciyərdə ALT-nin aktivliyi isə beyindəkindən yüksəkdir (cədvəl 4).

Yoluxdurulmuş quşlar arasında AST-nin ən yüksək aktivliyinə qara ciyərdə invaziyanın 7-ci günü, ən az aktivliyinə isə yoluxdurmanın 10-cu günü əzələlərdə təsadüf olunur. ALT-nin ən yüksək aktivliyinə yoluxdurulmuş cücələrin öyrənilən orqanlarında invaziyanın 7-ci günü beyində, ən az aktivliyi isə invaziyanın 10-cu günü əzələlərdə təsadüf edilir.

Beləliklə, tədqiqatın nəticələrinə əsasən qeyd etmək olar ki, quşların eymeriozu (*Eimeria tenella*) zamanı LDH, QR, AST və ALT-nin aktivliyində nəzərə çarpacaq dəyişikliklərə səbəb olur.

## NƏTİCƏLƏR

1. *Eimeria tenella*-nın 20 min sporlaşmış oosistası ilə yoluxdurulmuş 20 günlük cücələrin 2,5%-li baykoksun 2ml/L dozası ilə müalicəsi qara toyuq cücələrinin orqanizmində baş verən patoloji proseslərin qarşısını alır, eritrositlərdə hematoloji göstəricilərin və qlutationreduktazanın aktivliyinin normada saxlanılmasına səbəb olur.
2. Yoluxdurulmuş cücələrin əzələlərində, qara ciyər və beyində AST və ALT-nin aktivliyi parazitin inkişaf mərhələlərindən asılı olaraq eyni istiqamətdə dəyişir. AST-nin ən yüksək aktivliyi beyin və qara ciyərdə, ALT–nin ən yüksək aktivliyi isə əzələlərdə olur.
3. Yoluxdurulmuş yerli cinsdən olan qara cücələrin 2,5%-li baykoksun 2ml/L dozası ilə müalicəsi orqanizmdə baş verən patoloji proseslərin qarşısını alır, qanın hematoloji göstəricilərin və QR-in aktivliyinin normada saxlanılmasına səbəb olur.
4. Q-6FDH-nın aktivliyi yoluxdurulmuş quşların eritrositlərində kontrolla müqayisədə azalır, müalicə olunanlarda isə əksinə onun aktivliyi artır. Baykoks ilə müalicə eritrositlərdə Q-6FDH aktivliyində əlavə dəyişikliklərə səbəb olur. LDH-nın aktivliyi isə yoluxdurulmuş quşlarda invaziyanın prepatent dövründə azalır. Müalicə məqsədilə tətbiq edilən baykoks LDH-ın aktivliyinin bərpa olunmasına səbəb olmur.

## ƏDƏBİYYAT


**Ахмедов Э.И.** (2012) Гематологические показатели цыплят местных черных пород при экспериментальных эймериозах – *Eimeria tenella*. *Вiсник Запорiзького Нацiонального Унiверсiтету, Бiологiчнi науки, Запорiжжя*, **2:** 29-35.

**Колб В.Г., Камышников В.С.** (1976) Клиническая биохимия. Беларусь: Минск, 5-112.

**Карпищенко А.И.** (2013) Медицинские лабораторные технологии. Руководство по клинической лабораторной диагностике в 2 томах. Том 2. М.: ГЭОТАР-Медиа: 792 с.

**Кондрахина И.П.** (2004) Методы ветеринарной клинической лабораторной диагностики: Справочник. М.: Колос, 520 с.

**Dalloul R.A., Lillehoj H.S.** (2006) Poultry coccidiosis: recent advancements in control measures and vaccine development. *Exp. Rev.*

*Vaccines,* **5:** 143-163.

**Gokhan E., Yucel C., Meryem E., Bilal C.** (2004) Changes in malondialdehyde level and catalase activity and effect of toltrazuril on these parameters in chicks infected with *Eimeria tenella*. *Bull. Vet. Inst. Pulawy,* **48:** 251-254.

**Guo J.L., Zheng Q.H., Yin Q.Q., Cheng W., Jiang Y.B.** (2007) Study on mechanism of ascites syndrome of broilers. *Am. J. Anim. Vet. Sci.,* **2:** 62–65

**Jaffe A.S., Landt Y.A., Parvin C.A., Abendschein D.R. et al.** (1996) Comparative sensitivity of cardiac troponin I and lactate dehydrogenase isoenzymes for diagnosing ascute myocardial infarction. *Clin. Chem.,* **42:** 1770-1776.

**Julian J.R.** (1993) Ascites in poultry. *Avian Pathol.,* **22:** 419-454.

**Kraljevi P., Vili M., Miljani S., Impraga M.** (2009) Body weight and enzymes activities in blood plasma of chickens hatched from eggs irradiated with low level gamma rays before incubation. *Acta Veterinaria (Beograd),* **59(5-6)**: 503-511.

**Maxwell M.H., Robertson G.W.** (1997) World broiler ascites survey. *Poult. Int.*, **36:** 16–30.

**Maxwell M.H., Robertson G.W., Spence S.** (1986) Studies on an ascitic syndrome in young broilers. 1. Haematology and pathology. *Avian Pathol.,* **15:** 511–524.

**Pratt D.S., Kaplan M.M.** (2000) Evaluation of abnormal liver- enzyme results in asymptomatic patients. *N. Engl. J. Med.*, **4**: 1266–1271.

**Sabatakou O., Paraskevakou E., Tseleni-Balafouta S., Patsouris E.** (2007) Histochemical study of alkaline phosphatase activity in the chicken intestine. *Bulgarian Journal of Veterinary Medicine,* **10(2):** 83-93

**Topchiyeva Sh.A., Ahmadov E.I.** (2011) The activity of phosphatase in the jejunum of coccidiosis (*Apicomplexa, Eimeriidae, Eimeria tenella*). *Proceeding of the WSEAS International Conference. Recent Researches in Chemistry, Biology, Environment and Culture*. Switzerland: Montreux, 115-118.

**Wirz T., Brandle U., Soldati T., Hossle J.P., Periarrd J.C.** (1990) A unique chicken B-creatine kinase gives rise to two Bcreatine kinase isoproteins with distinct N-termini by alternative splicing. *J. Biol. Chem.,* **265:** 11656–11666.

**Zantop D.W.** (1997) Biochemistries. In: Avian Medicine: Principles and Applications (B.W.Ritchie, G.J.Harrison and L.R.Harrison, eds.) Lake Worth, FL.: Wingers Publishing Inc., 115–129

## Динамика Активности Некоторых Ферментов Класса Оксиредуктаз и Трансфераз при Эймериозе *(Eimeria Tenella)*

**Э.И.Ахмедов**

*Институт Зоологии НАНА*

Изучена активность глутатионредуктазы (ГР) (КФ.1.6.4.2) и глюкозо-6-фосфатдегидрогеназы (Г-6-ФДГ) (КФ.1.1.1.49) в эритроцитах крови, лактатдегидрогеназы (ЛДГ) (КФ.1.1.1.27) в сыворотке крови, аспартатаминотрансферазы (АСТ) (ЕС.2.6.1.1) и аланинаминотрансферазы (АЛТ) (КФ.2.6.1.2) в печени, мозге и мышцах цыплят местных черных пород при эймериозе и лечении 2,5% байкоксом. Установлено, что лечение зараженных птиц байкоксом в дозе 2 мл/л предотвращает патологические процессы, происходящие в организме, является причиной сохранения гематологических показателей крови и активности ГР в норме. У зараженных птиц по сравнению с контрольными, активность Г-6-ФДГ в эритроцитах понижается, а у леченных, наоборот, возрастает. У зараженных цыплят активность ЛДГ в препатентный период инвазии понижается. Байкокс, применяемый в лечебных целях, восстанавливает активность ЛДГ. Изменение активности АЛТ в мышцах, зараженных птиц происходит также, как в печени и мозге. Наиболее высокая активность АСТ наблюдается в мозге, печени и мышцах, а АЛТ – в мышцах. Активность АСТ в печени и мышцах одинакова, активность же АЛТ в печени выше, чем в мозге.

***Ключевые слова***: *АЛТ, АСТ, Г-6-ФДГ, гемоглобин, кокцидиоз, ЛДГ, фермент, эймериоз, эритроцит*

**The Dynamics Of The Activities Of Some Oxidoreductase And Transferase Class Enzymes At Eimeriosis (*Eimeria Tenella*)**

**E.I.Ahmadov**

*Institute of Zoology, ANAS*

Activities of glutathione reductase (GR) (EC. 1.6.4.2) and glucose-6-phosphate dehydrogenase (G-6FDH) (EC.1.1.1.49) in erythrocytes, lactate dehydrogenase (LDH) (EC.1.1.1.27) in serum, aspartate aminotransferase (AST) (EC.2.6.1.1) and alanine aminotransferase (ALT) (EF 2.6.1.2) in the liver, brain and muscles of chickens of the local black breed during eymeriosis and treatment by 2,5% Baycox have been studied. It was found that treatment of infected birds by Baycox with dose of 2 ml/l prevents the pathological processes occurring in the body, maintainingnormalhematological parameters of blood and activity of GR. In infected birds in comparison with the control birds the activity of G-6FDH in erythrocytes decreases, and in treated chickens increases. In infected chickens activity of LDH decreases in prepatentperiod of the invasion. Baycox used for medicinal purposes, restores the activity of LDH. The change of activity in the muscles of infected birds is the same as in the liver and brain. The highest activity of AST is in the brain, liver and muscles, and ALT activity in the muscles. AST activity in liver and muscles is the same, while ALT activity in the liver is higher, than in the brain.

***Key words:*** *ALT, AST, G-6FDH,hemoglobin, coccidiosis, LDH,enzyme, eymeriosis,erythrocytes*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 68, №3, səh. 184-188 (2013)*

# Beynin Şərti Reflektor Fəaliyyətinin Emosiogen Tənzimlənməsində Serotoninergik Sisteminin Sinaptik Mexanizmləri

**X.Y.İsmayılova, A.L.Cəlilova**

*AMEA A.İ.Qarayev adına Fiziologiya İnstitutu, Şərif-zadə küç.2, Bakı AZ 1100, Azərbaycan; E-mail: Hismailova@azdata.net*

**Serotoninin presinaptik sinir hüceyrələrinə geri qaytarılmasının selektiv inhibitoru olan fluoksetini qəbul etmiş heyvanlar "davranış kontrast" modelində müsbət-emosional və mənfi-emosional təsirlər şəraitlərində şərti reaksiyanın icrasında baş verən müvafiq dəyişilmələr qeyd olunur. Belə ki, qida miqdarının kəskin azalması şəraitində reaksiya sürətinin zəifləməsi fonunda şərti reaksiyanın icra olunmaması (frustrasiya) və eləcə də davranış parametrlərinin (qruminq, şaquli) sayının artması emosional gərginliyin güclənməsi ilə təşkil olunur. Mənfi-emosional vəziyyətinin fonunda alınan həyəcanlılıq mexanizmlərində fluoksetinin sinaptik dəlikdə serotoninin qatılığının artmasına və serotoninergik sisteminin 5-NT1A və 5-NT2A reseptorlarının fəallaşmasına təsiri güman edilir.**

***Açar sözlər:*** *"davranış kontrast" modeli, müsbət-emosional və mənfi-emosional vəziyyətlər, fluoksetin, şərti reflektor qida reaksiyası*

## GİRİŞ

Məlumdur ki, serotonin (5-NT) emosional vəziyyətlərin tənzimlənməsində, hərəki fəaliyyətdə, qida davranışında, təcavüzdə və s. mühüm rol oynayır. Bununla yanaşı, 5-NT mərkəzi neyromediator kimi göstərilir və onun mübadiləsi zamanı alınan pozuntular psixi pozuntularının və digər vəziyyətlərinin (patoloji həyəcanlıq, sinir anoreksiya, bulemiya və s.) əsasını təşkil edir.

Göstərilib ki, monoaminlərin, bilavasitə, serotoninin çatışmazlığı mərkəzi sinir sisteminin neyronlarında sinaptik ötürmənin pozulmasına gətirir və həyəcanlıq vəziyyətini formalaşdırır (Шишкина и др., 2006). Bununla əlaqədar olaraq, həyəcanlılığın neyrokimyəvi mexanizmlərinin tədqiqi ilə bağlı olan təcrübələr, əsas etibarilə, psixotrop preparatların yeridilməsindən sonra intakt heyvanların davranışının analizinə əsaslanır (Rolgers, Cole, 1994). Müalicə praktikasında istifadə olunan bir çox anksiolitiklərin və antidepressantların təsiri serotonin neyrotrans-missiyasının yüksəldilməsinə yönəldilmişdir.

Digər tərəfdən, məlumdur ki, 5-NT qida ilə daxil olan aminturşusu- triptofandan əmələ gəlir və sinaptik dəliyə ifraz olunandan sonra aktiv geri nəqliyyata, sonra isə oksidləşdirici dezaminləşməyə məruz qalır. Sinaptik dəliklərdən monoaminləri çıxartmaq qabiliyyətinə malik olan bütün preparatlar, adətən, neyromediatorların miqdarını artırmaqla, onların fəaliyyətini gücləndirir (Шутов, Быстрова, 2008). Belə ki, serotoninin intrasinaptik mübadiləsinə müdaxilə edən preparatların arasında aparıcı rol fluoksetinə verilir (Wong et al., 2005). Preparat spesifik zülal olan serotonin daşıyıcısı ilə birləşərək selektiv qabiliyyəti ilə serotoninin presinaptik sinir hüceyrələrinə geri qaytarılması prosesini blokada edir və bu öz tərəfindən, sinaptik dəlikdə neyromediatorun miqdarını artırır. Təxminən bir saatdan sonra fluoksetin beynin müxtəlif şöbələrində ekstrahüceyrələrinin serotoninin səviyyəsini artırır (Шишкина, 2007). Beləliklə, işin əsas məqsədi – beynin şərti reflektor fəaliyyətinin emosiogen tənzimlənməsində 5-NT-ergik sistemin sinaptik mexanizmlərini öyrənməkdən ibarət olmuşdur.

## MATERİAL VƏ METODLAR

Təcrübələr çəkisi 200-220 q olan 18 yetkin erkək sıçovullar üzərində aparılmışdır. Müxtəlif emosional vəziyyətləri yaratmaq üçün "davranış kontrast" eksperimental kamera üsulundan istifadə olunur. Start və məqsədli şöbələrdən ibarət olan bu kamerada erkək sıçovullar üzərində şərti reflektor qida reaksiyasının (ŞRQR) təlimi aparılmışdır. Təlim yaratmaq üçün istifadə olunan hazırki metodun üstün cəhəti ondan ibarətdir ki, heyvanların ilkin bədən çəkisinin 10%-ini itirməsinə baxmayaraq qida motivasiyasını sabit səviyyədə saxlamağa imkan verir. Sabit qida motivasiyası şəraitində saxlanılan heyvanlar kameranın start şöbəsinə yerləşdirilir və onlarda məqsədli şöbəsində yerləşən rəfə doğru qaçma şərti refleksi yaradılır. Heyvanlar hər gün 5 dəfə yüyürməyə məruz edilmişdir. Vərdişin qazanılma səviyyəsi şərti reaksiyanın icra olunmasının ümumi vaxtının dəyişməsi ilə müəyyən edilmişdir. Bütün proseduraya 1 dəqiqə ayrılmışdır. Heyvanlarda qida

əsasında (50 mq çörək) şərti reaksiya əmələ gəldikdən sonra (1-ci mərhələ), eyni modallı möhkəmləndirmə şəraitində müxtəlif emosional vəziyyətləri (mənfi və müsbət) meydana gətirmək üçün qidanın miqdarını 500 mq qədər artırılmış (2-ci mərhələ) və sonra yenidən 50 mq qədər azaldılmışdır (3-cü mərhələ).

"Davranış kontrastı"modelində qidanın miqdarının kəskin dəyişilməsi (azalması və artması) ilə bağlı olaraq ŞRQR –nın yerinə yetirmə vaxtının dəyişməsinə gətirir. Buna yerinə yetirilən reflektor reaksiyanın sürətinin dəyişilməsi, heyvanlarda verilən qıcığa qarşı reaktivliyin dəyişilməsinin göstəricisi kimi baxılır. Bunun əsas səbəbi heyvanlarda emosional vəziyyətin dəyişilməsidir. Bu emosiyaların informasiya nəzəriyyəsinə əsasən (Симонов, 1981), alınan təcrübələrdə qida miqdarının kəskin şəkildə azaldılması şəraitində ŞRQR–ın icra olunmasının ləngimə dərəcəsi müəyyən şəraitində heyvanlarda gərginlik halının yaranmasına gətirib çıxarır və bu mənfi-emosional hal kimi qəbul edilə bilər (Хананашвили, 1981). Bundan fərqli olaraq, qida miqdarının kəskin artırılması şəraitində reaksiya sürətinin artmasına emosional-müsbət durumun davranış təzahürü kimi baxmaq olar.

Aparılan tədqiqatlarda ŞRQR–nın gedişini müşayət edən davranış reaksiyalarının komponentlərinin: heyvanın kameranın məqsədli bölməsində rəfə doğru yaxınlaşmaları zamanı, eləcə də, qruminq (qaşınma, yalama və yuyunmaların), rearing (şaquli) və ŞRQR–nın icra olunmaması (frustrasiya) sayları vizual olaraq qeyd edilmişdir.

Heyvanlarda qida əsasında (50 mq çörək) şərti reaksiya əmələ gəldikdən sonra, onlara fluoksetin (25 mq/kq) zond ilə mədəyə yeridilib və 1 saatdan sonra möhkəmləndirici stimulun ehtimalından aslı olaraq yaranmış müxtəlif emosional vəziyyətlərə preparatın təsiri öyrənilib. Təcrübələrin nəticələrarası fərqlərin etibarlılığı Studentin t-kriterisi üzrə aparılıb.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Hazırki metodun vacib şərtlərindən biri təlimin ilkin dövrü uzun müddətli olmamasıdır (5 qaçış olmaqla, 5gün). Təlimin sonuna yaxın reaksiyanın icra etmə müddəti ilkin səviyyədən 30%-dən çox olmamaqla azalmalıdır. Belə ki, həmin göstəricinin minimum səviyyəyə kimi endirilməsi şəraitində qidanın miqdarının artırılması ilə qaçışın davametmə müddətinin sonrakı qısaldılması mümkün olmazdı (Семенова, 1982). 1-ci seriyada alınan nəticələr göstərir ki, heyvanlarda qida qıcıqlandırıcısına qarşı (50 mq çörək-tədqiqatın 1-ci mərhələsi) şərti refleksin icra olunma müddəti orta hesabla 15-18 san təşkil etmişdir. Qida qıcıqlandırıcısının miqdarının kəskin şəkildə artması şəraitində (500 mq - 2-ci mərhələ) heyvanlarda ŞRQR–nın ümumi icra olunma müddəti azalaraq orta hesabla 9-11 san təşkil edir. Təcrübənin 3-cü mərhələsində qidanın miqdarının kəskin azalması şəraitində isə (50 mq), ŞRQR–nın ümumi icra olunma müddəti tədqiqatın 1-ci mərhələsində qeydə alınan ilkin müddətdən fərqlənməmişdir (18-30san).

Təcrübələrin 2-ci seriyasında heyvanlarda qida əsasında (50 mq çörək) şərti reaksiya əmələ gəldikdən sonra onlarda möhkəmləndirici stimulun etimalından asılı olaraq şərti reaksiyanın icra olunmasına fluoksitenin təsiri öyrənilib. Preparat təcrübənin 1-ci mərhələsində (50 mq) şərti refleksin ümumi icra olunma müddəti orta hesabla 20-23 san təşkil etmişdir. 2-ci mərhələdə qidanın miqdarının kəskin artırılması (500 mq) şəraitində ŞRQR –nın ümumi icra olunma müddəti 11-15 san, təcrübənin 3-cü mərhələsində isə fluoksetin fonunda qidanın miqdarının kəskin azalması şəraitində (50mq) ŞRQR –nın ümumi icra olunma müddəti 22-43 san təşkil etmişdir. Qeyd etmək lazımdır ki, kontrol heyvanlardan fərqli olaraq, fluoksetin fonunda alınan reaksiyanın zəifləməsi 16-18 qaçışdan başlayır və sonra reaksiyanın ümumiyyətlə icra olunmaması (frustrasiya) qeyd olunur (Şəkil 1). Bununla bərabər, təcrübə heyvanlarda kontrol heyvanlardan fərqli olaraq davranış reaksiyasının parametrlərinin güclənməsi (qruminq 8-9, şaquli 4-5 və 3-4 frustrasiya reaksiyalar) aşkar edilib. Başqa sözlə fluoksetin fonunda qidanın miqdarının kəskin azaldılması zamanı alınan frustrasiya reaksiyası, eləcə də davranış proseslərinin parametrlərinin artması ilə müşahidə olunur (Şəkil 2). Bu kimi proseslərin güclənməsi vasitəsilə emosional gərginliyin güclənməsi müşahidə olunur.

Təcrübələrdən alınan göstəricilər əsasında belə bir nəticəyə gəlmək olar ki, fluoksetinin fonunda qidanın miqdarının kəskin azaldılması şəraitində yaranan emosional gərginlik reaksiyasının icra olunma müddətinin uzanması, eləcə də frustrasiya və davranış reaksiyalarının komponentlərinin güclənməsi müşahidə olunur. Güman edilir ki, sıçovullarda ŞRQR–nın ləngiməsi və emosional gərginlik xüsusiyyətlərinin artması beynin 5-NT-ergik sisteminin fəallaşmasının yüksəlməsi ilə həyata keçir. Ədəbiyyat məlumatlarına görə, beyində serotoninin miqdarının artması fonunda gərginliyin yüksək olması müşahidə olunur (Смулевич, 2001).




**Şəkil 1.** "Davranış kontrast" modelində qida miqdarının dəyişməsi şəraitində ŞRQR –nın realizasiyasına fluoksetinin təsiri. Absis– reaksiyanın zamanı (san); Ordinat –qaçışların sayı. Qara rəng – kontrol; Qırmızı rəng – təcrübə




**Şəkil 2.** "Davranış kontrast" modelində qida miqdarının dəyişməsi şəraitində davranış reaksiyanın parametrlərinə fluoksetinin təsiri. Qara rəng – kontrol; Boz rəng – təcrübə. 1. qruminqin sayı; 2. şaqulinin sayı; 3. frustrasiya reaksiyanın sayı. Styudentin t - kriterisi üzrə nəticələrarası fərqlərin etibarlığı: *p<0,05

Digər tərəfdən məlumdur ki, serotoninin presinaptik sinir hüceyrələrinə geri qaytarılması prosesini blokada edən fluoksetinin təsir müddətinin ilkin mərhələsində hərəki fəallığın azalmasına, eləcə də həyacanlılıq səviyyəsinin yüksəlməsini təstiq edən qruminq reaksiyalarının artmasına gətirib çıxarır (Саркисова, Фоломкина, 2010). A.V. Kaluyevin (1998) mülahizələrinə görə hərəki fəallığın azalması fonunda şaqulinin sayının artması "axtarış strateqiyasının" saxlanılmasını sübut edir və bu öz tərəfindən yüksək həyacanlılığını əks etdirir. İrəli sürülən bu fikirlə fluoksetinin təsiri altında aşağı fluoksetinin təsiri altında hərəki fəallığının həyacanlılığın yüksək səviyyəsinin göstəricisi olduğunu iddia edən digər tədqiqatçılar da (Prut, Belzunq, 2003) razılaşırlar və tədqiq olunan preparatların anksiogen xassəyə malik malik olduğunu təsdiq edirlər. Fluoksetinin birdəfəlik inyeksiyasının davranışa anksiogen təsiri Borsininin (Borsini et al., 2002) icmalında da öz əksini tapmışdır. Bununla belə, həyacanlılıq mexanizmlərində baş beynin 5-HT-ergik siteminin

(Handley, Mcblune, 1993) xüsusilə də serotonin 5-HT1A və 5-NT2A reseptorlarının da (Sharp, Hjorth, 1992) iştirak etdiyi göstərilir. Ola bilsin ki, fluoksetininin anksiogen effektinin mexanizmi sinaptik delikdə neyromediatorların qatılığının artması və 5-HT-sisteminin 5-HT1A və 5-HT2A reseptorlarının fəallaşması ilə əlaqədardır (Salchner, Singeüald, 2006). Buna bənzər fikirlərə, hərəki fəallıq mexanizmlərində 5-HT-nin ləngidici təsiri haqqında məlumatlara da rast gəlinir (Герштейн, 2000).

Digər tərəfdən də qeyd etmək lazımdır ki, fluoksetini qəbul etmiş heyvanlar möhkəmlətmə səviyyəsinin dəyişməsinə adekvat cavab verməlıəri ilə xarakterizə olunurlar. Emosional - müsbət və emosional - mənfi təsirlər şəraitində şərti reaksiyanın icrasında baş verən müvafiq dəyişikliklər qeyd olunur. Belə ki, təcrübələrimizdə müzakirə olunan qida möhkəmənləndirilməsinin kəskin artmasına cavab olaraq reaksiyanın sürətinin artması ola bilsin ki, fluoksetinin anksiolitik təsiri ilə əlaqədardır. Qida miqdarının kəskin azalması şəraitində isə sürətinin zəiflənməsi preparatın anksiogen təsiri təsiri ilə əlaqədar ola bilər. Göstərilən məlumatlar fluosetinin həm anksiogen, həm də anksiolitik təsirə malik olması haqqında tədqiqatçıların söylədikləri fikirləri təsdiq dirlər (Саркисова, Фоломкина, 2010).

## ƏDƏBİYYAT

**Герштейн Л.М., Сергутина А.В., Худоерков Р.М.** (2000) Морфохимическая характеристика мозга крыс, генетически предрасположенных (Август) и устойчивых (Вистар) к эмоциональному стрессу. *Нейрохимия,* **17(2):** 135-139.

**Калуев В.В.** (1998). Стресс, тревожность, поведение. Актуальные проблемы моделирования тревожного поведения и животных. Киев.

**Саркисова К.Ю., Фоломкина А.А**. (2010) Влияние селективного ингибитора обратного захвата серотонина флуоксетина на симптомы депрессивного подобного поведения у крыс линии WAG/Rij. *Журн. высш. нервн. деят.,* **60(1):** 98-108.

**Семенова Т.П., Ли О.Н.** (1982) Методики оценки эмоционально различных состояний у животных М.: *Деп. в ВИНИТИ,* **2992-82**: 6 с.

**Симонов П.В.** (1981) Эмоциональный мозг. М., Наука: 223 с.

**Смулевич А.Б.** (2001) Депрессии в общей медицине. М.:Медицинское информационное агентство, 782 с.

**Хананашвили М.М**. (1978) Информационные неврозы. Л., Медицина: 255.

**Шишкина Г.Т., Юдина А.М., Дыгало Н.Н. (**2006) Влияние флуоксетина на двигательную активность: возможное участие дофамина. Журн. высш. деят. **56(4):** 523-528.

**Шишкина Г.Т., Булыгина В.В., Юдина А.М., Толстикова Н.Н., Дыгало Н.Н., Дыгало Н.Н.** (2007) Вовлечение серотонина полосатого тела в эффекты флуоксетина на адренокортикальную функцию и поведение. Росс. физ. журн. **93(7):** 769-776.

**Шутов А.А., Быстрова О.В.** (2008) Содержание серотонина в сыворотке крови как маркер тяжести панических атак и эффективности их лечения. Журнал неврологии и психиатрии **108(10):** 49-54.

**Borsini F., Podhorma J., Marazziti D.** (2002) Do animal models of anxiety predict anxiolytic-like effects of antidepressants. Psychopharmacology (Berl.) **163 (2):**121-141.

**Handley S.L., McBlune J.W.** (1993) Serotonin mechanisms in animal models of anxiety. Brasil J. Med.Biol.Res. **26:** 1-15**.**

**Prut L., Belzung C.**(2003) The open field as a paradigm to measure the effects of drugs on anxiety-like behaviours: a review. Eur. J. Pharmacol. **463**:3-33.

**Rolgers R.J., Cole J.C**. (1994) The elevated plus-maze: pharmacology, methodology and ethology. In: Ethology and Psychopharmacology. Eds S.J. Cooper, C.A. Hendrie Chichester. John Wiley & Son Ltd.: 9-14.

**Salchner P., Singewald N.** (2006) 5-HT receptor subtypes involved in the anxiogenic- like action and associated Fos response of acute fluoxetine treatment in rats. *Psychopharmacology,* **185:**282-288.

**Sharp T., Hjorth S.** (1992) In Vivo Neurochemical Stydies of 5-HT1A Autoreceptor Function Serotonin CNS Receptors and Brain Function. Ed. P.B.Bradley et al. Oxford-New York-Seoul-Tokyo:Pergamon Press Ltd. **85:** 297.

**Wong D.N., Perry K.W., Bymaster F.P.** (2005) The discovery of fluoxetine hydrochloride (prosac). *Nature Rev.,* **4(9):** 764-774.

**Синаптические Механизмы Серотонинергической Системы Мозга в Эмоциогенной Регуляции Условнорефлекторной Деятельности**

**Х.Ю.Исмайлова, А.Л.Джалилова**

*Институт Физиологии им. А.И. Караева НАНА*

У животных, получавших флуоксетин - селективный ингибитор обратного захвата серотонина пресинаптическими окончаниями, отмечаются соответствующие изменения в исполнении условного рефлекса на фоне эмоционально-положительного и эмоционально-отрицательного воздействий в модели “поведенческого контраста”. В частности, препарат на фоне резкого снижения величины пищевого подкрепления снижает скорость выполнения условной реакции, что приводит к устранению реализации ранее сформированного навыка (фрустрация), а также к увеличению числа поведенческих параметров (груминг, рearинг), что свидетельствует о повышении уровня тревожности. Предполагается, что возможным механизмом повышения уровня тревожности, отмечаемого на фоне эмоционально-отрицательного состояния животного, является повышение препаратом в синаптической щели концентрации нейромедиатора и активация *5-HT1A и 5-HT2A* рецепторов серотонинергической системы.

***Ключевые слова:*** *модель “поведенческого контраста”, эмоционально-положительные и эмоционально-отрицательные воздействий, флуоксетин, условнорефлекекторная реакция на пищу*

**Synaptic Mechanisms of Brain Serotonergic System Involved in Emotiogenic Regulation of Conditioned Activity**

**Kh.Yu.Ismailova, A.L.Jalilova**

*Institute of Physiology named after A.I.Karaev, ANAS*

In “behavioral contrast” model under emotionally-positive and emotionally-negative effects appropriate changes in the performance of conditioning reflex were observed in animals that had received fluoxetine - selective inhibitor of serotonin reuptake by presynaptic terminals. This drug particularly slowed the rate of the performance in conditioning reflex when food reinforcement was reduced sharply that eliminated realization of the formed skills (frustration), increased the number of behavioral parameters (grooming, rearing), testifying the elevation of anxiety level. The possible mechanism of increase of anxiety level registered under emotionally-negative state of animals is supposed to be the result of concentration increase of the neurotransmitter in the synaptic cleft and activation of *5-HT1A* and *5-HT2A* receptors of serotoninergic system.

***Key words:*** *model of "behavioral contrast", emotionally-positive and emotionally-negative effects, fluoxetine, conditioned reflex reaction on food*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 68, №3, səh. 189-193 (2013)*

# Нарушение Регуляции Циркадианного Ритма Гликемических Реакций На Сахарную Нагрузку При Долгосрочной Освещенности И Темноте

**Ф.А. Алиева[1], Т.М. Агаев[2]**

[1] *Бакинский государственный университет,* ул. *акад. Захид Халилова, 23, Баку AZ 1148, Азербайджан*

[2] *Институт физиологии им. А.И.Караева НАН Азербайджана, ул. Шариф-заде, 2, Баку AZ 1100, Азербайджан*

**Экспериментально было установлено, что у кроликов, находившихся в удлиненном до 10 суток режиме освещенности и темноты, дневные колебания уровня концентрации глюкозы в крови приобретают иную конфигурацию, имеющую пики её повышения и снижения, отличные от нормальных показателей суточной динамики гликемии. После сахарной нагрузки циркадианный ритм гликемических реакций активизировался чаще в утренние и вечерние часы, что указывает на его нарушения, и это зависит от того в каком возрасте был подопытное животное, и находилось ли он долго в световом или темновом режиме.**

***Ключевые слова:*** *гликемическая реакция, суточный ритм, освещенность, темнота, сахарная нагрузка*

## ВВЕДЕНИЕ

Физиологические нормы глюкозы в крови человека и животных, это один из наиважнейших показателей общего гомеостаза в организме и мобильности его энергоснабжения как в обычных, так и в экстремальных условиях.

Исследованиями было установлено, что регуляция содержания глюкозы в крови, как и многие другие функциональные и метаболические характеристики организма (активность и покой, питание, гормональные сдвиги, сопряженность обменных реакций и т.д.), подчиняется в известной степени околосуточным (циркадианным) биоритмам исходящих от центральных (мозговых) ритмоорганизующих нервных и нейроэндокринных структур (Əliyev, Zülfüqarova, 2013; Алиев, 1994; Анисимов, 2008; Гончарова, 2010; Губина-Вакулик и др., 2007, Aliyeva, 2001). Особое значение в генерации таких регулярных ритмов имеют так называемые супрахиазматические ядра (СХЯ) гипоталамуса и тесно связанная с ними многочисленными сенсорными афферентами мозговая эпифизарная железа, секретирующая гормона мелотонина, и отчасти, нейроэндокринные нейронные популяции гипоталамуса, вырабатывающие пептидные нейрогормоны, которые в комплексе способны оказывать регулирующие действия на многие вегетативные, висцеральные и поведенческие функции организма. Активность выше названных ритмогенераторов (или ритмопейсмекеров) обусловлена, как показали хронобиологические и экспериментальные наблюдения, сенсорной зрительной информацией о долготе и интенсивности естественной освещенности во внешней среде, т.е. о периодичности смены дня и ночи (Əliyeva, 2013; Məmmədova və b., 2008; Алиев, Алиева, 2003; Батурин и др., 2003; Комаров и др., 2000; Лебедев, 1971).

Есть экспериментальные доказательства в пользу того, что гликемические реакции, отражающие изменения концентрации сахара (глюкозы) в крови, в известной степени зависимы от внешних нагрузок и регулярных суточных физиологических ритмов в вегетативной сфере организма и во многих случаях извращаются как при повреждении функций главных ритмоводителей, так и при содержании подопытных животных в необычных условиях освещенности и темноты (Əliyev, Zülfüqarova, 2013; Əliyeva, 2013; Алиев и др., 1996; Aliyeva, 2001; Diaz, 1986; La Fleur et al., 2001).

Известно, что в некоторых отраслях промышленности, в практике длительных космических полетов и подводной службы, к примеру, долгосрочные ночные вахтенные пребывания могут оказаться, и по-видимому оказываются у лиц фактором извращающим – смещающим обычные ритмичные характеристики на уровне метаболизма и функции их организма, на воздействия которых их рабочая активность долго и трудно.

Исходя из таких соображений, нам показалось важным изучение в аспекте возрастной физиологии характера изменения гликемических реакций у разновозрастных экспериментальных животных, содержащихся в условиях длитель-

ной освещенности и темноты. После таких режимов содержания, животные подвергались сахарным нагрузкам для того, чтобы выяснить, насколько реакции гликемии могут изменять свою ритмичность при подобных воздействиях.

## МАТЕРИАЛЫ И МЕТОДЫ

Эксперименты были выполнены на кроликах 3-х- 6-ти месячного и годовалого возраста. Для контроля, животных каждой возрастной группы содержали в режиме обычной смены дня и ночи, а для опыта, группы животных каждого возраста помещали отдельно в специальные комнаты, где в течении 10 суток они находились в режиме постоянной освещенности и темноты.

По истечении этих сроков у контрольных и опытных групп кроликов в утреннее, дневное и вечернее время (соответственно, в 8-12, 13-17 и 18-22 ч.) из краевой ушной вены взяли кровь для определения концентрации глюкозы в ней. Те животные, которые служили для контроля и опытов после их тестирования в обычных и необычных условиях освещенности и темноты, в течении дня трижды (в утренние, дневные и вечерние часы) подвергали сахарным нагрузкам. С этой целью приготавливали сахарный раствор из расчета 3 г/кг массы животного, и каждое животное получало его специальной пипеткой в per os в назначенные сроки. Сахарная нагрузка, как показали наши предыдущие исследования, вызывает гликемию в крови только в течении 3-4 часов (Əliyeva, 2013). После сахарной нагрузки у контрольных и опытных групп животных тем же способом взяли кровь для анализа. Содержание глюкозы в крови определяли высокочувствительным глюкометром (производства «Bayer Corporation»ç USA), согласно инструкции, приложенной к его техническому паспорту. Содержание глюкозы выражено, как принято во многих гемотологических анализах физиологического и клинического значения, в мг% на 100 мл крови.

Полученные цифровые данные обрабатывали параметрическим способом (Лакин, 1980) и с помощью компьютерной программы для статистической обработки экспериментальных данных (Программа Exsell 7.0).

## РЕЗУЛЬТАТЫ И ИХ ОБСУЖДЕНИЕ

Цифровые данные этого экспериментального исследования приведены в таблице 1. Как видно из представленных нами данных, содержание глюкозы в крови неоднократно изменяется в течении дня, и в этой динамике прослеживается более или менее выраженная дневная ритмичность. К примеру, у 6-ти месячных кроликов, которые находились в обычном режиме смены дня и ночи, содержание глюкозы в крови составило в утренние часы 118 мг%, дневные – 131 мг%, а вечерние – 114 мг% 100 мл крови. Такая же динамика, с иными показателями, наблюдается как у 3-х месячных, так и у годовалых животных, и это свидетельствует о том, что такой важный гомео-, гемостатический фактор, каким является уровень глюкозы в крови, регулируется механизмами суточной (циркадианной) периодики, другими словами, его изменения осуществляется ритмично под влиянием центральных ритмозапускающих нервных и нейроэндокринных механизмов.

Далее, мы обнаружили, что у животных разного ворзраста гликемические реакции (или гликемия) на сахарные нагрузки при нормальных условиях смены дня и ночи вызывают более выраженные изменения в утренние и дневные часы. К примеру, у годовалых кроликов в утренние часы содержание глюкозы в крови после сахарной нагрузки повышается от 124 мг% (в норме) до 143 мг% ($p<0,001$), в дневные часы – от 130 мг% до 138% ($p<0,001$), что происходит достаточно сильно выраженная гликемия.

Изменение суточной периодики и нахождение животных в условиях длительной (10-ти суточной) и постоянной освещенности и темноты вносит определенные коррекции в колебаниях содержания глюкозы в крови. Так, 10-ти дневная освещенность приводит, к примеру, у 3-х месячных животных, к повышению содержания глюкозы в крови, по сравнению с нормой (82 мг%) до 107 мг% ($p<0,01$) (в утренние часы) и до 114 мг% ($p<0,001$) (в дневные часы), а 10-ти дневная темнота, наоборот, приводит к значительному уменьшению этих же показателей. Подобное происходит также у 6-ти месячных и годовалых животных.

Сахарные нагрузки, которые были применены после завершения тестирования животных в режиме длительной постоянной освещенности или темноты, оказывали на дневные ритмические колебания глюкозы в крови воздействия совсем иного характера. Опыты показали, что постоянный и длительный световой режим и последующая сахарная нагрузка в утренние часы способствовала существенному повышению ее содержания в крови у всех исследованных нами возрастных групп животных. У 3-х месячных уровень глюкозы в крови повышался до 128 мг%, 6-ти месячных – до 150 мг%, у годовалых – до 177 мг%, при контрольных показателях 114

мг%, 140 мг% и 143 мг% соответственно. Сахарные нагрузки в дневные и вечерние часы также вызвали достоверного увеличения количества глюкозы в крови у этих же животных. Другая картина наблюдалась у подопытных животных подвергавшихся сахарным нагрузкам, после длительного пребывания в темновом режиме. У них, по сравнению с контрольными показателями, концентрация глюкозы в крови после сахарной нагрузки оказалась пониженной особенно в утренние и вечерние часы.

На основании установленных нами экспериментальных фактов можно прийти к следующим выводам. Во-первых, количественные изменения глюкозы (сахара) в крови подчинены суточным физиологическим ритмам, которые более выражены в течение светового дня, т.е. когда животные активны в поведенческих, и особенно в локомоторных реакциях. Во-вторых, длительное изменение естественной периодики освещенности и темноты вызывает у животных определенное извращение дневного ритма колебания концентрации глюкозы в крови. В третьих, в зависимости от воздействия фактора длительной освещенности или темноты реакции гликемии на сахарные нагрузки приобретают иные динамические характеристики.

Касаясь механизмов таких сдвигов уровня концентрации глюкозы в крови, мы на основании собственных данных и некоторых литературных материалов, можем отметить следующее. В таких гомеостатических реакциях, в первую очередь важная регуляторная роль принадлежит гипоталамо - эпифизарным ритмогенераторным и гипоталамо-гипофизарным нейроэндокринным регуляторным механизмам (Алиев, 1994; Алиев, 1996; Гаибов и др., 1987). Существуют убедительные экспериментальные данные, свидетельствующие о том, что эпифизарный гормон мелотонин экссекретируется в кровь с очень строгим суточным ритмом, и он способен оказывать регулярные ритмические воздействия на многие физиологические и биохимические (в основном,

**Таблица 1.** Влияние 10-ти дневного светового и темнового режима (СР и ТР) на колебания содержания глюкозы в крови у разновозрастных кроликов до и после сахарной нагрузки (СН) (конц. глюкозы выражена в мг%/100 мл крови, M±m, n=6 для каждой серии анализов)

| Возраст животных | Условия опыта | Утренное время (8-12 ч) | Дневное время (43-17 ч) | Вечерное время (18-22 ч) |
|---|---|---|---|---|
| **3-ч месячные** | Норма | 89±1,22 | 97±0,73 | 85±0,93 |
| | Сах.наг. (СН) | 114±1,22 | 126±0,50 | 105±2,44 |
| | P | <0,001 | <0,002 | <0,001 |
| | СР-10 дней | 107±1,12 | 114±1,21 | 98±1,70 |
| | P | <0,001 | <0,001 | <0,001 |
| | ТР-10 дней | 74±1,03 | 81±0,75 | 72±0,91 |
| | P | <0,001 | <0,001 | <0,001 |
| | СР+СН | 128±1,11 | 131±4,66 | 120±0,53 |
| | P | <0,001 | <0,001 | <0,001 |
| | ТР+СН | 90±1,08 | 104±0,62 | 92±0,75 |
| | P | <0,001 | <0,001 | <0,01 |
| **6-ти месячные** | Норма | 118±0,87 | 131±1,20 | 114±1,13 |
| | Сах.наг. (СН) | 143±0,96 | 153±1,32 | 134±0,7 |
| | P | <0,001 | <0,001 | <0,001 |
| | СР-10 дней | 134±0,90 | 1455±1,19 | 127±1,30 |
| | P | <0,01 | <0,01 | <0,001 |
| | ТР-10 дней | 103±0,47 | 111±1,71 | 97±2,17 |
| | P | <0,01 | <0,01 | <0,01 |
| | СР+СН | 150±1,03 | 158±0,80 | 159±1,30 |
| | P | <0,001 | <0,001 | <0,001 |
| | ТР+СН | 120±0,60 | 136±1,08 | 119±0,83 |
| | P | <0,001 | <0,001 | <0,001 |
| **годовалые** | Норма | 124±0,67 | 138±0,62 | 114±0,58 |
| | Сах.наг. (СН) | 143±1,15 | 138±2,78 | 131±0,60 |
| | P | <0,01 | <0,01 | <0,01 |
| | СР-10 дней | 147±2.17 | 150±1,30 | 133±0,96 |
| | P | <0,001 | <0,001 | <0,01 |
| | ТР-10 дней | 104±0,80 | 109±2,07 | 100±1,07 |
| | P | <0,001 | <0,001 | <0,001 |
| | СР+СН | 177±1,81 | 172±1,11 | 155±1,54 |
| | P | <0,001 | <0,001 | <0,001 |
| | ТР+СН | 120±0,62 | 126±1,43 | 117±0,60 |
| | P | <0,001 | <0,001 | <0,001 |

метаболические) параметры внутренней среды организма человека и животных (Алиев, Алиева, 2003; Комаров и др., 2000; Arendt, 2006). Сопряженно с эпифизом, гипоталамо-гипофизарный нейроэндокринный регуляторный комплекс также контролирует эти параметры в соответствии с дневным ритмом смены дня и ночи (La Fleur, 2001; Гаибов и др., 1987; Гончарова, 2010). Таким образом, можно заключить, что гликемические реакции - есть один из тех физиологических показателей, которые в зависимости от возраста организма и его активности постоянно корректируются и настраиваются ритмично, соответственно физиологическому статусу в организме в каждый данный момент суточной периодики.

## ЛИТЕРАТУРА

**Əliyev Ə.H., Zülfüqarova P.Ə.** (2013) Mərkəzi sinir sisteminin müxtəlif funksional vəziyyətlərində fiziki yük şəraitində interoseptik stimulyasiyanın qanda lqikemik reaksiyaların səviyyəsinə təsiri. *AMEA-nın A.İ.Qarayev ad. Fiziologiya İnstitutunun və Azərbaycan Fizioloqlar Cəmiyyətinin elmi əsərlərinin külliyatı*, **31:** 80-87.

**Əliyeva F.Ə.** (2013) Şəkər yükünün quşlarda gündüz və gecə sirkad bioritmlərində qanda qlikemik reaksiyalarının tənzimlənməsində rolu. *AMEA-nın A.İ.Qarayev ad. Fiziologiya İnstitutunun və Azərbaycan Fizioloqlar Cəmiyyətinin elmi əsərlərinin külliyyatı*, **31:** 55-63.

**Məmmədova Ç.Y., Əliyev Ə.H., Musayev A.A.** (2008) Postnatal ontogenezin erkən mərhələlərində ətraf mühit faktorlarının iki gecə və iki gündüz ritmində saxlanmış yapon bildirçinlərində qlikemik reaksiyanın sirkad ritminin tənzimində rolu. *AMEA-nın A.İ.Qarayev ad. Fiziologiya İnstitutunun və Azərbaycan Fizioloqlar Cəmiyyətinin elmi əsərlərinin külliyyatı*, **26**: 135-159.

**Алиев А.Г.** (1994) Возрастные особенности изменения суточной гликемической реакции после эпифизэктомии и нарушении функции анализаторов в период постнатального онтогенеза. *Вестник Бакинск. ГУ, сер. естест. Наук*, **1**: 42-50.

**Алиев А.Г., Джафаров А.И., Алиева Ф.А. и др.** (1996) Изменение циркадного ритма гликемиической реакции на физическую нагрузку в постнатальном онтогенезе при нарушении функции эпифиза и анализаторов. *Материалы 1-ого Росс. Конг. по патофизиолог. Тез. докл.,* М.: 249.

**Алиев А.Г., Алиева Ф.А.** (2003) Роль различных условий освещенности в нейроэндокринной регуляции циркадного ритма гликемической реакции в период постнатального онтогенеза. *Мат. Всеросс. конф. по нейроэндокринологии.* Санкт-Петербург: 42.

**Анисимов В.Н.** (2008) Эпифиз-биоритмы и старение организма. *Успехи физиологических наук,* **39(4):** 40-65.

**Батурин Э.Б., Попов А.В.** (1988) Супрахиазматические ядра гипоталамуса как регулятор циркадной системы млекопитающих. *Успехи физиологических наук*, **19(32):** 67-68.

**Батурин Д.А. и др.** (2003) Постоянное освещение. Гормональные нарушения. *Тез. докл. Всеросск. конф. по нейроэндокринологии.* Санкт-Петербург: 13-15.

**Гаибов Т.Д., Гусейнов Г.А., Алиев А.Г. и др.** (1987) Влияние эпифиза на гипоталамо-гипофизарную систему регуляции обменно-вегетативных функций. *Мат. XV съезда Всесоюз. Физиол. Общ. им И.П.Павлова АН СССР,* Л.: Наука, **2:** 315-316.

**Гончарова Н.Д.** (2010) Гипоталамо-гипофизарно-адреналовая система у лабораторных приматов: циркадные ритмы стресс-реактивности. Т*ез. докл. XIII Всеросск.конф. по нейроэндокринологии.* Санкт-Петербург: 52-54.

**Комаров Ф.И., Малиновская Н.К., Рапопорт С.И.** (2000) Мелотонин и биоритмы организма. Хронобиология и хрономедицина. Триада– Х: 82-91.

**Губина-Вакулик Г.И., Бондаренко Л.А., Сотник Н.Н.** (2007) Длительное круглосуточное освещение как фактор ускоренного старения пинеальной железы. *Успехи геронтологии,* **20(1):** 92-95.

**Лакин Г.Ф.** Биометрия. (1980) М.: Высшая школа, 96-110.

**Лебедев Д.Д.** (1971) О биологических ритмах. *Вестник АМН СССР* **7:** 68-73.

**Aliyeva F.A.** (2001) Epiphase as a regulation of cyrcade rhythm on a bask-ground of physical load in 1-st intera. *Mat. Int. Cong.,*Tehran: 105-106.

**Arendt I.** (2006) Melatonin and human rhythms. *Chronbiol. Int.,* **1:** 21-37.

**Diaz Bladirs E.** (1986) Effect of pinealectomy on plasma qlucose, insylin and glycaqon level in the rat. *Hormone and Meal. Res.,* **14:** 225-229.

**La Fleur S.E., Kalsebeek A., Wortel I. et al.** (2001) Role for the pineal and melatonin in glucose homeostatic; pinealektomy increases a glucose consentrations. *J. Neuroendocrinol.,* **13 (12)B** 1025-1032.

## Uzumüddətli İşiqlılıq Və Qaranlıq Zamanı Şəkər Yükünə Qlikemik Reaksiyaların Sutkalıq (Sirkadron) Ritmin Tənziminin Pozulmasi

**F.Ə. Əliyeva[1], T.M. Ağayev[2]**

*[1] Bakı Dövlət Universiteti*
*[2] AMEA A.İ.Qarayev adına Fiziologiya İnstitutu*

Təcrübi olaraq müəyyən edilmişdir ki, 10 sutkaya qədər işıqlılıq və qaranlıq rejimdə saxlanılmış dovşanlarda qanda qlükozanın qatılıq səviyyəsinin gün ərzində tərəddüdləri qlikemiyanın sutkalıq normal dinamikası göstəricilərindən fərqli artma və azalma zirvələri olan konfiqurasiya kəsb edir. Şəkər yükündən sonra qlikemik reaksiyanın sirkadian ritmi daha çox səhər və axşam saatlarında fəallaşır və bu, heyvanın hansı yaşda olmasından və işıqlıqda və ya qaranlıqda olma müddətindən asılıdır.

***Açar sözlər:*** *qlikemik reaksiya, sutkalıq ritm, işıqlılıq, qaranlıq, şəkər yükü*

## A Disturbance In The Regulation Of Circadian Rhythms Of Sugar-Load-Induced Glycemik Reactions Under Long-Term Illumination And Darkness

**F.A. Aliyeva[1], T.M. Agayev[1]**

*[1] Baku State University*
*[2] Institute of Physiology named after A.I.Karayev, ANAS*

According to the results of our experiments, in rabbits which were kept in light-dark cycle for 10 days, daily fluctuation in the blood glucose level acquired another configuration different from normal parameters of daily dynamics with increasing and decreasing peaks. Circadian rhythms were activated often in the morning and evening hours and it depended on the age of animals and whether they were in the light or dark regime.

***Key words:*** *glycemic reaction, circadian rhythm, illumination, darkness, sugar load*

# Qarğıdalı Hibridlərində Quraqlığa Davamlılıqla Əlaqəli Xromosom Hissələrinin Və SSR Markerlərin Müəyyən Edilməsi

**R.T.Əliyev[1], M.Ə.Abbasov[1], M.Şiri[2]**

[1]*AMEA Genetik Ehtiyatlar İnstitutu, Azadlıq prospekti, 155, Bakı AZ 1106, Azərbaycan,*
*E-mail: mehraj_genetic@yahoo.com*
[2]*Ərdəbil Tədqiqat Stansiyası, Iran*

**Müəyyən edilmişdir ki, tam suvarılan şəraitdə dən məhsuldarlığı ilə əlaqəli olan UMC2359 praymeri 9-cu xromosom üzərində yerləşir. Quraqlıq stresi şəraitində isə dən məhsuldarlığı ilə əlaqədar olmuş UMC2359, UMC1432, UMC1862 və UMC1719 praymerləri isə uyğun olaraq 9, 10, 1 və 4-cü xromosomlar üzərində yerləşiblər. SSR markerlər əsasında əldə edilən nəticələr genetik müxtəlifliyinin öyrənilməsi üçün UMC1862, UMC1719, PHI031, UMC1545, UMC2359 praymerlərinin daha səmərəli olduğunu göstərmişdir. UMC1862 (1.11), UMC1719 (4.10-11), UMC1447 (5.03), UMC2359 (9.07), UMC1432 (10.02) markerləri başqa markerlərdən daha çox quraqlığa davamlılığı kodlaşdıran xromosom sahələrində yerləşirlər. Beləliklə, quraqlıq stresi şəraitində dən məhsuldarlığını artırmaq üçün qarğıdalı hibridlərinin seçimində bu SSR markerlərdən istifadə etmək olar.**

***Açar sözlər:*** *quraqlığa davamlılıq, SSR markerlər, qarğıdalı hibridləri*

## GİRİŞ

Qarğıdalı bitkisi, buğda və düyüdən sonra dünyada ən çox istifadə edilən dənli bitkilərdən biridir. Beynəlxalq Qida Siyasəti Elmi-Tədqiqat Institutunun (IFPRI) təqdim etdiyi layihədə göstərilir ki, 2020-ci ilə kimi inkişaf etməkdə olan ölkələrdə qarğıdalıya olan tələbat, buğda və düyüyə olan tələbatı üstələyəcəkdir (Gerpacio, Pingali, 2007).

Kənd təsərrüfatı məhsullarının artırılması əkin sahələrinin və vahid əkin sahəsindən məhsuldarlığın artırılması yolu ilə baş verə bilər. Əkin yerlərinin məhdud olması səbəbindən, əkin sahələrini artırmaq o qədər də asan deyildir. Lakin, stresə davamlı bitki sort və hibridlərin yaradılması və onların qeyri əlverişli torpaq-iqlim şəraitində becərilməsi yolu ilə əkin sahələrini xeyli genişləndirmək, vahid əkin sahəsindən məhsuldarlığı yüksəltmək olar.

Hazırda yer üzərində istifadə oluna bilən torpaq sahələrinin 26%-dən çox hissəsi quraqlıq stresinin təsiri altındadır ( Blum,1986). Quraqlıq stresi ən geniş yayılmış xarici mühit amillərindən biri olmaqla bitkilərdə bir çox fizioloji, biokimyəvi və molekulyar cavabları induksiya edir və bu səbəbdən bitkilər ekstremal mühit şəraitinə adaptasiya olunurlar (Arora et al., 2002). Belə adaptasiya mexanizmlərinin öyrənilməsi, əlverişsiz xarici mühit amillərinə qarşı davamlı bitki sort və formalarının yaradılmasında böyük praktiki əhəmiyyət kəsb edir.

Son zamanlar molekulyar genetika sahəsində əldə edilmiş nailiyyətlər seleksiya işində əlamətlərin seçilməsi və müəyyənləşdiril-məsində geniş imkanlar yaratmışdır. Quraqlığa davamlılıq genlərinin molekulyar markerlərlə tapılması və onların xromosomlar üzərində yerlərinin aşkar edilməsi seleksiya işində genlərin klonlaşdırılmasında və markerlər vasitəsilə seçim aparılmasında mühüm röl oynayır.

## MATERİAL VƏ METODLAR

Tədqiqatlar 38 qarğıdalı hibridi üzərində aparılmışdır. 18 ana xətti iki ata (K3653/2 və K3615/1 testerlərilə) xətti ilə hibridləşdirilmiş və nəticədə 36 F1 hibridi əldə edilmişdir. Valideyn xətlərinin adları 1-ci cədvəldə verilmişdir. Hibridlərin quraqlğa davamlılığını öyrənmək üçün 36 hibriddən əlavə, SC704 (quraqlığa davamlı) və SC700 (quraqlığa həssas) hibridlərindən nəzarət kimi istifadə edilmişdir. Tədqiqatlar tarla və laboratoriya şəraitlərində həyata keçirilmişdir. Quraqlığa davamlı və həssas hibridlərin seçilməsi üçün R.A. Fischer, R. Maurer (1978), A.A. Rosielle, J. Hamblin (1981) və G.C.J. Fernandez (1992) tərəfindən verilmiş indekslərdən istifadə olunmuşdur.

Laboratoriya şəraitində hibridlərin quraqlığa davamlılığını təyin etmək üçün toxumların cücərmə qabiliyyətindən və yarpaq-larda xlorofilin sintezinin depressiya dərəcəsindən istifadə olunmuşdur (Shiri et al., 2010).

**Cədvəl 1.** Hibridləşdirmə proqramında istifadə olunmuş qarğıdalı xətlərinin adları

| № | Xətlərin şəcərəsi | Kodlar | № | Xətlərin şəcərəsi | Kodlar |
|---|---|---|---|---|---|
| 1 | KLM77008/1-3-3-1-2-2-1 | L1 | 11 | K74/2-2-1-21-2-1-1-1 | L11 |
| 2 | KLM77012/4-1-1-4-1-2-1 | L2 | 12 | K74/2-2-1-21-3-1-1-1 | L12 |
| 3 | KLM77021/4-1-2-1-2-1-2 | L3 | 13 | K74/1 | L13 |
| 4 | KLM77029/8-1-1-1-2-1-5 | L4 | 14 | K3545/7 | L14 |
| 5 | KLM77029/8-1-1-1-2-2-2 | L5 | 15 | K3544/4 | L15 |
| 6 | KLM76004/3-5-1-2-2-1-1-1 | L6 | 16 | K3640/6 | L16 |
| 7 | KLM76012/1-3-1-1-1-2-1-1 | L7 | 17 | KLM75010/4-4-1-2-1-1-1 | L17 |
| 8 | K74/2-2-1-3-1-1-1-1 | L8 | 18 | KLM76010/1-13-1-2-1-1 | L18 |
| 9 | K74/2-2-1-4-4-1-1-1 | L9 | 19 | K3653/2 | T1 |
| 10 | K74/2-2-1-19-1-1-1-1 | L10 | 20 | K3615/1 | T2 |

Öyrənilən 38 qarğıdalı hibridində 12 cüt praymerlərdən istifadə edilərək, DNT amplifikasiyaları ilə hibridlər arasındakı mövcud olan polimorfizm tədqiq olunmuşdur. Tam suvarılan və quraqlıq stresi şəraitlərində dən məhsuldarlığı, tədqiq olunan digər əlamətlər və quraqlığa tolerantlıq indeksləri ilə əlaqədar xromosom hissələrinin və informativ SSR markerlərin müəyyən edilməsi üçün ardıcıl reqressiya üsulundan istifadə edilmişdir. Statistik analizlərin yerinə yetirilməsində SAS, PATH2, SPSS, POPGENE32 və NTSYS-PC proqramlarından istifadə olunmuşdur (Senior,1998; Yeh et al., 1999).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Qarğıdalı hibridlərində tam suvarılan şəraitdə dənin dolma sürətindən başqa (o heç bir informativ markerdə müşahidə edilməmişdir), qalan digər əlamətlər üçün ən azı bir informativ marker müşahidə olunmuşdur. Aparılan tədqiqatlarda ən çox informativ marker xlorofil “a”-nın miqdarında müşahidə edilmişdir. Ən az informativ marker dən məhsulu, qıça sırasında dənin sayı, qıça dəninin sıra sayı, xlorofil “b”- nin miqdarı ilə bağlı olan markerdir. Bunlarda cəmi bir ədəd informativ marker aşkar edilmişdir (Cədvəl 2). Tədqiqatlarda istifadə olunan 12 marker arasında UMC2359 və PHI031 praymerləri 8 əlamətin informativ markerı kimi müəyyən edilmişdir. UMC2359 praymeri tədqiq olunan praymerlər arasında ən yüksək polimorfizmə sahibdir. Quraqlıq stresi şəraitində tədqiq olunan əlamətlər arasında dənin dolma dövrünün müddəti əlamətindən başqa, heç bir informativ marker müşahidə edilməmiş, qalan əlamətlərdə isə ən azı bir informativ marker müşahidə olunmuşdur. İstifadə olunan 12 markerlər arasında UMC1719 praymerinin 6 əlamət üçün informativ marker olduğu müəyyən edilmişdir. Öyrənilən praymerlər arasında UMC1719 polimorfizmin miqdarı yüksək olan praymerlərdəndir. Ona görə də genetik müxtəlifliyinin tədqiq edilməsində UMC1719 və UMC2359 praymerləri ən əhəmiyyətli praymerlər hesab olunur.

Alınan nəticələrə əsasən demək olar ki, UMC2359 praymeri tam suvarılan şəraitdə dən məhsuldarlığı ilə əlaqədardır. Bu praymer 9-cu xromosom üzərində və 9.09 lokusda yerləşir və bu şəraitdə məhsuldarlığın fenotipik variasiyasının təqribən 15 %-ini yerinə yetirir. Quraqlıq stresi şəraitində isə dörd praymer (UMC2359, UMC1432, UMC1862, UMC1719) dən məhsuldarlığı ilə əlaqədardır. Bu dörd praymer uyğun olaraq, 9.07, 10.02, 1.11 və 4.10 xromosom sahələrində yerləşir və quraqlıq şəraitində məhsuldarlığın fenotipik variasiyasının təqribən 63 %-ini yerinə yetirirlər (Cədvəl 2).

TOL (tolerantlıq), SSI (stresə həssaslıq) indeksləri məhsuldarlıq potensialı ilə müqayisədə daha çox bitkinin davamlılıq mexanizminə və genotiplərin həssaslığına bağlıdırlar. NC133 praymeri hər iki indekslə əlaqədar praymerdir. Bu praymer uyğun olaraq, 28 və 30 faiz SSI, TOL indeksləri genetik dəyişikliklərini əhatə edirlər. NC133 praymeri 2-ci xromosom üzərində və 2.05 lokusda yerləşir. TOL, SSI indekslərin əksinə olaraq MP (orta məhsuldarlıq), STI indeksləri məhsuldarlıq potensialı ilə əlaqədardır. UMC1447, UMC2359 praymerlərinin MP indeksi ilə əlaqədar olduqları müəyyənləşmişdir. Bu iki praymer 26 faiz MP indeksi dəyişikliklərini əhatə edirlər. UMC1447 və UMC2359 praymerləri fenotipik variasiyanın 25 %-ni doğrultmaqla STI indeksini kodlaşdıran xromosom məkanlarında yerləşmişdir. UMC1447 və UMC2359 praymerləri 6.03, 9.03 lokuslarda yerləşirlər. Tədqiqatların nəticələrinə diqqət yetirdikdə aşkar olunur ki, ümumiyyətlə, dən məhsuldarlığını kodlaşdıran genlər 9, 10, 1, 4 və 5-ci xromosomlar üzərində yerləşirlər (Cədvəl 2). UMC1862, UMC1719, UMC1447, UMC2359 və UMC1432 markerləri başqa markerlərdən fərqli olaraq, daha çox quraqlığa davamlılığı kodlaşdıran

**Cədvəl 2.** Dən məhsulu və quraqlığa tolerantlıq indeksiləri ilə informativ markerləri üçün ardıcıl reqressiya modelin regressiya əmsalı (b), $R^2$, uyğunlaşdırılan $R^2$ ($R^{-2}$) və P dəyəri

| Əlamətlər | Praymerlər | Lokusun yeri | b | $R^2$ | $R^{-2}$ | P dəyəri |
|---|---|---|---|---|---|---|
| YP | UMC2359 | 9.07 | 0.389 | 0.151 | 0.128 | 0.014 |
| YS | UMC2359 | 9.07 | 0.30 | 0.38 | 0.33 | 0.00 |
| YS | UMC1432 | 10.02 | 0.46 | 0.41 | 0.36 | 0.00 |
| YS | UMC1862 | 1.11 | 0.30 | 0.50 | 0.44 | 0.02 |
| YS | UMC1719 | 4.10-11 | 0.25 | 0.63 | 0.56 | 0.04 |
| TOL | NC133 | 2.05 | 0.491 | 0.281 | 0.240 | 0.002 |
| SSI | NC133 | 2.05 | 0.485 | 0.299 | 0.259 | 0.002 |
| MP | UMC1447 | 5.03 | 0.431 | 0.136 | 0.112 | 0.006 |
| MP | UMC2359 | 9.07 | 0.357 | 0.259 | 0.217 | 0.021 |
| STI | UMC1447 | 5.03 | 0.405 | 0.116 | 0.091 | 0.010 |
| STI | UMC2359 | 9.07 | 0.369 | 0.248 | 0.205 | 0.018 |

YP: suvarılan şəraitdə dən məhsulu, YS: quraqlıq şəraitində dən məhsulu, TOL: tolerantlıq indeksi, SSI: stresə həssaslıq indeksi, MP: orta məhsuldarlıq indeksi, STI: stresə davamlılıq indeksi

sahələrdə yerləşirlər. Beləliklə, dən məhsuldarlığını artırmaq üçün qarğıdalı hibridlərinin seçimində bu marker-lərdən istifadə etmək olar. L. Dubey və əmək-daşları (Dubey et al.,2009) quraqlığa davamlılıqla bağlı SSR markerlərini müəyyənləşdirmək üçün apardıqları tədqiqatda isti iqlimə məxsus 24 qarğıdalı xəttində quraqlıq stresi şəraitində fərqli reaksiya müşahidə etmişlər. Onlar belə nəticəyə gəlmişlər ki, BNLG1866 (1.03), DUPSSR12 (1.08), UMC1042 (2.07), UMC1056 (5.03), DUP13 (7.04), UMC1069 (8.08), UMC1962 (10.03), BNLG1028 (10.06) və UMC1344 (10.07) markerləri quraqlığa həssas və davamlı xətlərdə quraqlıqla əlaqədar praymer markerlərdir.

Bizim tədqiqatlarda tam suvarılan şəraitdə UMC2359 markeri 6.05 lokusunda yerləşir və dən məhsuldarlığı ilə əlaqədardır. Halbuki, quraqlıq stresi şəraitində UMC2359, UMC1432, UMC1862, UMC1719 praymerləri, uyğun olaraq, 9.07, 10.02, 1.11 və 4.10 (4.11) lokuslarında yerləşirlər və dən məhsuldarlığı ilə əlaqədardırlar. Əvvəlki tədqiqatlarda QTL xəritələri ilə müəyyənləşdirilmişdir ki, dən məhsuldarlığı üçün müxtəlif ekoloji şəraitdə QTL-in sayı və ya təsiri fərqlidir. Məsələn, Y.N. Xiao və əməkdaşlarının (Xiao et al., 2005) araşdırmalarında tam suvarılan şəraitdə dən məhsuldarlığına aid edilən iki QTL (QTLs- two putative) müəyyənləşdirilmiş və bu gen məkanları 1 və 9-cu xromosom üzərində yerləşmişlər. Bu iki QTL, dən məhsuldarlığının təqribən 21 faiz fenotip dəyişikliklərini həyata keçirir. Halbuki, quraqlıq stresi şəraitində 9-cu xromosom üzərində yerləşən yalnız bir QTL müəyyənlıəşdirilmişdir ki, bu da, fenotip variasi-yasının təqribən 13.8 %-ni təşkil edir.

Agrama və Mounir (1996) isə quraqlığa davamlılıqda təsiredici xromosom məkanlarının 8, 6, 5, 3, 1-ci xromosomlar üzərində yerləşdiyini müəyyən etmişlər. Məhsuldarlıq üçün qəbul edilən beş QTL müəyyənləşdirilmişdir. Bu araşdırmanın nəticələri ilə Y.N. Xiao və əmək-daşlarının apardıqları tədqiqatın nəticələrinin oxşarlığına baxmayaraq, fərqlərin mövcudluğu da diqqət çəkir ( Xiao et al., 2005). Qarğıdalıda dən məhsuldarlığı bir kəmiyyət əlaməti olduğu üçün çox sayda genlərlə idarə olunur. Bu isə o deməkdir ki, dən məhsuldarlığının formalaşma-sında da çoxlu xromosom məkanları iştirak edir. Ədəbiyyat məlumatlarının təhlili və əvvəllər aparılan tədqiqatlar yuxarıda çıxarılan nəticələrin doğru olduğunu təsdiqləyir (Ribaut et al. 1997; Barriere et al., 2001; Xiao et al., 2005). Bu təd-qiqatlarda tam suvarılan və quraqlıq stresi şərait-lərində dən məhsuldarlığı ilə bağlı markerlər bir-birindən fərqlənirlər. Bu da müxtəlif suvarma re-jimlərində genlərin tənzimlənməsinin bir-birindən fərqli olduğunu göstərir.

Tam suvarılan şəraitdə dən məhsuldarlığı ilə bağlı olan UMC2359 markeri, 1000 dənin kütləsi, məhsulun yetişməsinə lazım olan günlərin sayı və dənin uzunluğu əlamətləri ilə bağlı olmuşdur. Quraqlıq stresi şəraitində dən məhsuldarlığı ilə bağlı olan UMC1719 markeri qıça dəninin sıra sayı, 1000 dənin kütləsi və məhsulun yetişməsinə lazım olan günlərin sayı əlamətləri ilə bağlı markerdir və həm də dən məhsuldarlığı ilə bağlı olan UMC2359 markerinin dənin dolma sürəti əlamətinə də bağlı marker olduğu müəyyən edilmişdir (Cədvəl 2).

Bu nəticələr göstərir ki, qıça dəninin sıra sayı, 1000 dənin kütləsi, məhsulun yetişməsinə lazım olan günlərin sayı, dənin dolma dövrünün müddəti və dənin dolma sürəti dən məhsuldarlığı ilə bağlı ən mühüm əlamətlərdir. Tarla şəraitində də qıça dəninin sıra sayı, 1000 dənin kütləsi, məhsulun yetişməsinə lazım olan günlərin sayı, dənin dolma dövrünün müddəti və dənin dolma sürəti kimi əlamətlərin başqa əlamətlərlə müqayisədə qarğıdalının dən məhsuldarlığında daha böyük rolu

vardır.

Müəyyən edilmişdir ki, qarğıdalı hibridləri hibridlərinin qruplaşdırılması və genetik müxtəlifliyin araşdırılmasında SSR marker-lərindən istifadə etmək olar və əlamətlərin dolayı yolla markerlər vasitəsilə seçilməsi ilkin informasiyanın verilməsində faydalı ola bilər. Əlbəttə markerlər və müxtəlif əlamətlər arasındakı bağlantılıq əlaqələrinin müəyyənləşdirilməsində F2 (Second filial- İkinci nəsil), DH (Doubled haploid - İkiqat haploid) və RIL-in (Recombinant inbred line-Rekombinant xalis xətt) hazırlan-masına ehtiyac vardır. Bu populyasiyalar əsasında bağlılıq xəritələri hazırlanmış və daha sonra xromosom üzərində bu əlamətləri idarə edən gen məkanlarının yerləri müəyyənləşdirilmişdir. Bu tədqiqatdan əldə olunmuş informasiya əlverişli praymerlərin seçilməsinə kömək etməklə bağlan-tılı xəritələrinin hazırlamasında faydalı olacaqdır. Müxtəlif xromosomlar üzərində SSR markerlərin yerlərini müəyyənləşdirmək və o xromosomlardakı yabanı qarğıdalı növlərinə aid əlverişli əlamətlərin olmasını aydınlaşdırmaqla, onlardan gələcək seleksiya işlərində istifadə etmək olar. Beləliklə də, yabanı növlərin xromosomları ilə onların əvəz edilmiş bəzi xromosomları yeni təsərrüfat xətlərinin yaranmasına gətirib çıxara bilər. Başqa sözlə, quraqlığa davamlılıqla əlaqədar markerlərdən istifadə etməklə xromosom dəyişikliyi olan xətlər yaratmaq və onların arasında quraqlığa davamlılığı transfer etmək olar (Rashidi-Monfared et al., 2008).

Aparılan tədqiqatda müəyyən olunmuş bəzi markerlərdən dən məhsuldarlığını artırmaq və quraqlığa davamlı formaları seçmək üçün informativ markerlər kimi istifadə edilə bilər. Alınan nəticələr göstərir ki, əgər daha çox praymerlərdən istifadə olunarsa, məhsuldarlıq və quraqlığa davamlılıq əlamətləri ilə yüksək korrelyasiyaya malik markerləri müəyyən etmək olar.

## ƏDƏBİYYAT SİYAHISI

**Arora A.S., Sairam R.K., Srivastava G.C.** (2002) Oxidative stress and antioxidative systems in plants. *Curr. Sci.,* **82:** 1227-1238

**Agrama H.A.S., Mounir E.M.** (1996) Mapping QTLs in breeding for drought tolerance in maize (*Zea mays* L.) . *Euphytica,* **91:** 89-97

**Barriere Y., Gibelin C., Argillier O., Mechin V.** (2001) Genetic analysis in inbred lines of early dent forage maize. I. QTL mapping for yield, earliness, starch and crude protein contents from per se value and top cross experiments. *Maydica,* **46:** 253-266

**Blum, A.** (1986) Breeding Crop Varieties for Stress Environments. *Critical Reviews in Plant Sciences,* **2:** 199-237

**Dubey L., Prasanna B.M., Ramesh B.** (2009) Analysis of drought tolerant and susceptible maize genotypes using SSR markers tagging candidate genes and consensus QTLs for drought tolerance. *Indian J. Genet. Plant Breed.,* **69:** 344-351

**Fernandez G.C.J.** (1992) Effective selection criteria for assessing plant stress tolerance. In: Adaptation of food crops to temperature and water stress tolerance (ed. Kuo C.G.). *Asian Vegetable Research and Development Center* (Taiwan): 257-270

**Fischer R.A., Maurer R.** (1978) Drought resistance in spring wheat cultivars. I. Grain yield responses. *Aust. J. Agric. Res.,* **29:** 897-912

**Gerpacio V.R., Pingali P.L.** (2007) Tropical and subtropical maize in Asia: Production systems, constraints and research priorities. *CIMMYT* (Mexico): 93p.

http://www.SAS.com. Accessed in June 2010.

http://www.SPSS.com Accessed in June 2010.

**Rashidi-Monfared S., Mardi M., Hossienzadeh A., Naghavi M.R.** (2008) Association analysis of important agronomic traits to retrotransposon markers SSAPs in durum wheat accessions. *Modern Genet. J.,* **3:** 29-36

**Ribaut J.M., Jiang C., Gonzalez-de-Leon D. et al.** (1997) Identification of quantitative trait loci under drought conditions in tropical maize. II. Yield components and marker-assisted selection strategies. *Theor. Appl. Genet.,* **94:** 887-896.

**Rosielle A.A., Hamblin J.** (1981) Theoretical aspects of selection for yield in stress and non-stress environments. *Crop Sci.,* **21:** 943-946

**Senior M.L., Mutphy J.P., Goodman M.M., Stuber C.W.** (1998) Utility of SSRs for determining genetic similarities and relationships in maize using an agarose gel system. *Crop Sci.,* **38:** 1088-1098

**Shiri M.,Aliyev R., Choukan R.** (2010) The effect of drought stress on genetics properties of leaf chlorophyll content of in maize. *The 11th Iranian congress of genetics,* Iran, Tehran: 124-128.

**Xiao Y.N., Li X.H., George M.L. et al.** (2005) Quantitative trait locus analysis of drought tolerance and yield in maize in China. *Plant Mol. Biol. Reporter,* **23:** 155-165

**Yeh F.C., Yang R.C., Boyle T.** POPGENE version 1.31 Microsoft window- based freeware for population genetic analysis. University of Alberta, Edmonton, Canada, 1999, 28p.

**Определение SSR маркеров и хромосомных участков, связанных с засухоустойчивостью у гибридов кукурузы**

**Р.Т.Алиев[1], М.А.Аббасов[1], М.Ш.Шири[2]**

*[1]Институт генетических ресурсов НАНА*
*[2]Научно-исследовательская станция Ардебиль, Иран*

Установлено, что праймер UMC2359, связанный с продуктивностью зерна в полностью орошаемых условиях, находится на хромосоме 9. А в условиях засухи праймеры UMC2359, UMC1432, UMC1862 и UMC1719, связаные с продуктивностью зерна зерновых, расположены на 9, 10, 1 и 4-ой хромосоме, соответственно. Результаты, полученные на основе SSR маркеров, показали, что праймеры UMC1862, UMC1719, PHI031, UMC1545 и UMC2359 более эффективны для исследования генетического разнообразия. Маркеры UMC1862 (1.11), UMC1719(4.10-4.11), UMC1447(5.03), UMC2359 (9.07) и UMC1432(10.02) по сравнению с другими маркерами больше расположены в засухоустойчивость -кодирующих зонах хромосом. Таким образом, эти SSR маркеры могут быть использованы для повышения продуктивностью зерна в условиях засухи при выборе гибридов кукурузы.

***Ключевые слова:*** *засухоустойчивость, SSR маркеры, гибриды кукурузы*

**Determination of SSR markers and chromosomal regions associated with drought-resistance in maize hybrids**

**R.T. Aliyev[1], M.A.Abbasov[1], M.Sh. Shiri[2]**

*[1] Institute of Genetic Resources, ANAS*
*[2]Research Station of Ardabil, Iran*

It has been determined that the primer UMC2359, associated with productivity under fully irrigated conditions, is located on chromosome 9. And under drought stress the primers UMC2359, UMC1432, UMC1862 and UMC1719, associated with grain productivity are located on 9, 10, 1 and 4th chromosomes in accordance. The results obtained on the basis of SSR markers showed that UMC1862, UMC1719, PHI031, UMC1545, UMC2359 praymers were more useful to study genetic diversity. Markers UMC1862 (1.11), UMC1719 (4.10-4.11), UMC1447 (5.03), UMC2359 (9.07) and UMC1432 (10.02) are mostly located in chromosomal regions associated with drought-resistance in comparison with other markers. Thus, these SSR markers could be used in breeding of maize hybrids to increase the productivity of grain under drought stress conditions.

***Key words:*** *drought resistance, SSR markers, maize hybrids*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 68, №3, səh. 199-203 (2013)*

# Muğan Düzünün Basdırılmış Çəmən-Boz Torpaqları

**M.P. Babayev, F.M. Feyziyev**

*AMEA Torpaqşünaslıq və Aqrokimya İnstititu, M. Rahim, 5, Bakı AZ1073, Azərbaycan;*
*E-mail: fikrat.fm@gmail.com*

**Məqalədə Muğan düzündə tarixi proses nəticəsində basdırılmış torpaqların morfogenetik diaqnostikası, kimyəvi və fiziki xüsusiyyətləri şərh edilmişdir. Qeyd olunan hər iki kəsimin şərhindən o nəticəyə gəlinmişdir ki, basdırılmış torpaqların əmələ gəlməsinə səbəb bu ərazilərin daşqın altında intensiv qalması və torpaq üzərində aqroirriqasiya gətirmələrinin toplanması olmuşdur. Buna görə də bu torpaqların paleotorpaq kimi tədqiqinə ciddi ehtiyac vardır. Ümumiyyətlə, basdırılmış hesab olunan qat çəmən-boz torpaq qatının əlamətlərini göstərir. Yeni qatlar basdırılmış hissədə zaman nöqteyi-nəzərindən "qaynama" prosesi gedir və təsnifatı müəyyənləşdirmək problemi yaranır. Paleotorpaq kimi tədqiq olumanın digər əhəmiyyəti ondan ibarətdir ki, torpaq və onun genetik qatları öz morfogenetik göstəricilərində əmələgəlmə şəraitini xronoloji şəkildə saxladığından zaman etibarı ilə hansı dəyişikliklərin getdiyini müəyyənləşdirmək mümkün olur.**

***Açar sözlər:*** *Basdırılmış torpaqlar, paleotorpaq, morfogenetik diaqnostika, genetik qat, humus*

## GİRİŞ

Muğan düzündə qədimdən suvarılan torpaqlar min illərdir ki, təbii və antropogen təsirə məruz qalır. Təbii ki, bu da onların morfogenetik profilində müəyyən izlər qoymuşdur.

Basdırılmış torpaqlar haqqında məlumatlara Azərbaycanda müxtəlif tədqiqatçıların əsərlərində rast gəlinir (Волобуев, 1951, Алекперов, 1952, Babayev 1976, Babayev və b., 2011). Daha geniş tədqiqatlara isə M.P. Babayevin tərəfindən Mil və Muğan düzlərində aparılmışdır. Ümumiyyətlə, basdırılmış torpaqlar bütün dünyada geniş öyrənilmiş tədqiqat sahəsidir. Basdırılmış torpaqların geniş tədqiq olunmasına baxmayaraq, bu problem hal-hazırda da geniş öyrənilir, çünki bu torpaqlar uzun tarixi bir proses keçməklə ətraf mühit amillərinə intensiv məruz qalaraq bir çox məlumatları özündə gizlədir. Basdırılmış torpaqlarla bağlı əsas problemlərdən biri onların təsnifatı və nomenkulaturasıdır (Helmes et al., 2002).

Basdırılmış torpaqların morfoloji təsvirini göstərmək, həmçinin morfoloji dioqnostikasını müəyyənləşdirmək praktiki olaraq mümkündür, lakin həmin torpaqların basdırılmadan əvvəlki vəziyyətini şərh etmək çox çətindir. Ola bilər ki, bu torpaqlar başqa torpaq tipinin altında qalmış və ya çökmə materialları olsun (İsbel, 2001). Tipik nümunə kimi, daşqına məruz qalan lilli, qumlu-allüvial çöküntülü torpaqları göstərmək olar. İstənilən halda basdırılmış torpaqlar müəyyən tarixi bir prosesə məruz qalmağı onların paleotorpaq kimi tədqiq olunmasına zərurət yaradır.

M.P. Babayevin fikrincə, suvarılan torpaqlarda basdırılmış torpaqların yaranma səbəbi uzun müddət suvarılan torpaqların üzərində aqroirriqasiya gətirmələr toplanaraq üst münbit qatın basdırılmasıdır. Basdırılmış qata, əsasən, 1,0 və 1,5-2,0 metr dərinlikdə rast gəlinir (Babayev, 1976).

## MATERİAL VƏ METODLAR

Tədqiqatlar Muğan düzünün əsasən çəmən-boz torpaqlarının inkişaf etdiyi ərazilərdə aparılmışdır. Torpaq nümunəsinin götürülmə metodikasına uyğun olaraq, xarakter yerlər seçilmiş və torpaq kəsimləri qoyulmuşdur. Qoyulmuş torpaq kəsimlərinin morfoloji təsviri verilmiş və genetik qatlar üzrə nümunələr götürülərək laboratoriyaya gətirilmişdir. Torpaq kəsiminin coğrafi koordinatını müəyyənləşdirməkdən ötrü "GARMİN" GPS qurğusundan istifadə olunaraq coğrafi kordinatları qeyd olunmuşdur. Gətirilən torpaq nümunələrində humus Tyurin üsulu ilə, udulmuş əsaslar D.I. Ivanov üsulu ilə, qranulometrik tərkib – N.A.Kaçinski üsulu ilə, pH- ionomer-pH-metr ilə müəyyən edilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Muğan düzündə çəmən-boz torpaqların morfogenetik dioqnostikasının tədqiqi zamanı basdırılmış torpaqlara xarakterik əlamətlər müəyyən edilmişdir.

SP 1 nömrəli kəsim Saatlı rayonda Çəfərxan təcrübə məntəqəsində coğrafi koordinatı E 48˚31'531, N 39˚56'31 olan -23 m hündürlükdə qoyulmuşdur. Torpaq kəsiminin qoyulduğu yer taxıl altında istifadə edilən ərazidir (Şəkil 1).




**Şəkil 1.** Torpaq kəsiminin profili (solda) və götürüldüyü yerin Googlearth-dən görünüşü (sağda).

AU a'iz – 0-25 sm. Yüngül gilli, boz rəngli, tozlu kəltənli, yumşaq, çoxlu iri çatlar, çoxlu kök və kökcüklər, quru, keçid tədrici, qaynayır.

AYaive– 25-35 sm. Yüngül gilli, Açıq boz, kəltənli, bərkimiş, kip, kök və kökcüklər, nəm, keçid tədrici, qaynayır.

BTaig – 35-50 sm. Yüngül gilli, boz şabalıdı, yumşaq, struk-tursuz, kök və kökcüklər, çox rütubətli.

BChg – 50-65 sm. Ağır gilliсəli, samanı rəngli, struktursuz, çox rütubətli, tədrici keçidə malik.

AY hhg – 65-85 sm. Yüngül gilli, tünd qəhvəyi rəngli, , kəltənli, çoxlu pas ləkləri rütubətli, keçidi tədrici

AU hhgca – qara rəngli, yumşaq, çoxlu pas ləkələri, keçidi aydın, orta gilli, çox rütubətli

C - 95-158 sm. Gilli, açıq qəhvəyi, struktursuz, çox rütubətli, yumşaq.

Kəsimin morfogenetik diaqnostikasında olduğu kimi analiz nəticələrində də basdırılmış qatın açıq əlamətləri əks olunur.

Ümumiyyətlə, bu torpaq kəsimində humusun miqdarı çəmən-boz torpaqların inkişaf etdiyi ərazilərdən götürülən nümunələrlə müqayisədə yüksəkdir (Şəkil 2).

Çəmən-boz torpaqlarında aparılmış əksər tədqiqatlarda humusun maksimum miqdarı 2,0-2,5 % göstərilir (Babayev və b. 2011). Lakin bu torpaq kəsimində humusun miqdarı üst 0-20 sm-də 3,74 % təşkil edir. Aşağı genetik qatlara doğru azalma müşahidə edilərək 50-65 sm-lik dərinlikdə bu göstərici 1,81%-ə dək enir. Humusun miqdarı 65-85 sm-də yenidən artaraq 2,14%-ə, 85-95 sm-də isı 2.19% təşkil edir və yenidən azalma müşahidə edilir (Cədvəl 1).

Humusa müvafiq olaraq azotun miqdarının da dərinlik üzrə paylanmasında eyni dəyişkənlik baş verir.

Udulmuş əsasların miqdarı 65-85 və 85-95 sm-lik genetik qatda artaraq 13,75-19,38 mq/ekv təşkil edir (Cədvəl 1).

Çəmən və allüvial torpaqların oxşar əlamətlərindən biri də onların profilin gilli olmasıdır (Rycroft, 1995). Götürülən bu torpaq nümunəsində göstərilən qanunauyğunluğa müvafiq olaraq qranulometrik tərkibcə gilli-gilliсəli torpaqlardır (Cədvəl 1.)




**Şəkil 2.** Basdırılmış torpaqda humusun dərinlik üzrə paylanması

***Cədvəl 1.*** Basdırılımış torpağın kimyəvi göstəriciləri

| Kəsimin №-si | Dərinlik | Humus %-lə | Azot %-lə | Ca | Mg | C:N | Hiqroskopik nəmlik, %-lə | Duzların miqdarı | pH |
|---|---|---|---|---|---|---|---|---|---|
| SP 1 | 0-20 | 3,74 | 0,27 | 13,85 | 8,20 | 8,03 | 5,83 | 0,210 | 7,41 |
| | 20-35 | 2,24 | 0,17 | 12,29 | 8,45 | 7,64 | 5,86 | 0,264 | 7,49 |
| | 35-50 | 1,91 | 0,15 | 12,90 | 10,55 | 7,38 | 5,98 | 0,236 | 7,69 |
| | 50-65 | 1,81 | 0,14 | 10,45 | 9,50 | 7,49 | 4,91 | 0,270 | 7,74 |
| | 65-85 | 2,14 | 0,17 | 13,75 | 12,50 | 7,30 | 7,09 | 0,287 | 8,00 |
| | 85-95 | 2,19 | 0,17 | 18,35 | 20,15 | 7,47 | 10,09 | 0,307 | 7,58 |
| | 95-158 | 0,64 | 0,07 | 16,50 | 13,60 | 5,30 | 8,02 | 0,287 | 7,75 |

Gilin miqdarının 0-50 sm-lik hissəsində ciddi dəyişkənlik nəzərə çarpmasa da 50-60 sm-də 45.6% təşkil edir ki, bu da ağır gilliçəli qranulometrik tərkibə uyğundur. Müvafiq olaraq gilin miqdarı yenidən dərinlik üzrə artımla müşahidə olunur və basdırılan qatda 74-78.04 % təşkil edir (Şəkil 3).

Qrafikdə əks olunduğu kimi, torpaq kəsiminin genetik profilində < 0.01 olan hissəciklərin miqdarı böyük üstünlük təşkil edir.

Torpaqların hiqroskopik nəmlik göstəricisi qranulometrik tərkibi və humusun miqdarı ilə sıx əlaqədardır. Qanunauyğun olaraq qranulometrik təkib ağırlaşdıqca hiqroskopik nəmlik də yuksəlir. Adı çəkilən torpaq nümunəsində hiqroskopik nəmliyin ən yüksək göstəricisi 85-95 və 95-158 sm-lik qatlarda müşahidə olunur (Cədvəl 1).

Muğan düzünün çəmən-boz torpaqlarının tədqiqi zamanı analoji basdırılmış torpaq qatının morfoloji təsvirinə nəzər saldıqda basdırılma halını digər ərazilərdə də görmək mümkündür. Şəkildə koordinatı 39˚55´34 N və 48˚40´47 olan, -22 metr hündürlükdə, yonca bitkisi altında qoyulmuş kəsimin dərinlik üzrə genetik qatlarının ortofotosu və profil görüntüsü verilmişdir (Şəkil 4).




**Şəkil 3.** SP 3 nömrəli kəsimin qranulometrik tərkibi




**Şəkil 4.** Çəmən-boz torpaq nümunəsinin profil şəkli (solda) və ortofotosu (sağda)




**Şəkil 5.** Humusun dərinlik üzrə paylanması.

***Cədvəl 2 .*** Basdırılmış torpağın kimyəvi göstəriciləri

| Kəsimin №-si | Dərinlik | Humus %-lə | Azot %-lə | Ca | Mg | C:N | Hiqroskopik nəmlik %-lə | Duzların miqdarı | pH |
|---|---|---|---|---|---|---|---|---|---|
| SP 3 | 0-20 | 1,34 | 0,12 | 11,55 | 14 | 6,47 | 7,71 | 0,322 | 7,92 |
| | 20-35 | 1,31 | 0,12 | 12,25 | 13,65 | 6,33 | 8,32 | 0,875 | 8,29 |
| | 35-60 | 0,67 | 0,04 | 19,25 | 15,40 | 9,71 | 8,40 | 0,647 | 7,84 |
| | 60-82 | 1,50 | 0,12 | 23,40 | 16,50 | 7,25 | 7,91 | 1,211 | 7,74 |
| | 82-92 | 0,99 | 0,06 | 16,60 | 18,05 | 9,57 | 8,79 | 0,429 | 7,72 |
| | 92-125 | 3,05 | 0,22 | 17,40 | 12,70 | 8,04 | 7,91 | 0,884 | 7,97 |
| | 125-160 | 1,55 | 0,13 | 35,70 | 12,95 | 6,91 | 5,22 | 1,179 | 7,86 |

AYa'vz – 0-20 sm. yüngül gilli, tünd boz rəngli, kəltənvari, yumşaq, xırda çatlı, bioloji işlək, çoxlu kök və kökcüklər quru, qaynayır. keçidi tədirici.

AB – 20-35 sm. orta gilli, tünd boz rənglı, kök və kökcüklər, zəif rütubətli, keçidi tədrici.

BT csse – 35-60. Gilli, qonur rəngli, kəltənvari, az miqdarda kök və kökcüklər, nəm, keçidləri aydın.

AYhhsecacs – 60-82 sm. Gilli, Göyümsov-boz rəngli, yumşaq, kif şəklində karbonatlar, gips ləkələri, duz kristalları, güclü qleyləşmə əlamətləri, keçidi kəskin, yaşıl balıq pulucuqları.

A hh – 82-92 sm. Gilli, tünd şabalıdı-qara rəngli, kömürləşmiş, çürüntülü, yumşaq, çox rütubətli, keçidi kəskin.

A hh – 92–125 sm. Gilli, yumşaq, qleyləşmiş, çox nəm, keçidi aydın.

C se ca g - 125-160 sm. orta gilli, qəhvəyi rəngli, kəltənli, çox rütubətli, qleyləşmiş, çoxlu pas ləkələri.

Kəsimin analitik göstəricilərində təkrar basdırılma aydın nəzərə çarpır. Bu kəsimin üst 0-20 və 20-35 sm-lik hissəsində humus 1,34-1,31% təşkil edir və aşağı qatlara doğru azalır. Lakin, 60-82 sm dərinlikdə yenidən artaraq 1,5% olur (Cədvəl 2) ki, bu da bu torpaqlarda iki dəfə basdırılma prosesi getməsini sübut edir.

Bu kəsim qranulometrik tərkib göstəricilərinə görə gilli torpaqdır. Üst 0-20 sm qat yüngül gilli, aşağı qatlara doğru daha da ağırlaşır. Əsas basdırılmış hesab etdiyimiz qat 82-92 sm-lik dərinlik yüngül gilli, 92-152 sm-lik qat isə orta gilli genetik qatdır. Bu da üst AY və AB qatlarının təkrarlanmasına uyğundur. Şəkil 5-də humusun basdırılmış torpaqda dərinlik üzrə paylanması dinamikası göstərilmişdir.

Təbiidir ki, hiqroskopik nəmliyin göstəriciləri torpaqların qranulometrik tərkibi və humusun miqdarı ilə sıx əlaqədardır. Bu torpaq kəsimində də hiqroskopik nəmliyin dərinlik üzrə dəyişməsi qranulometrik tərkibə uyğun dəyişir.

Yekun olaraq, o nəticəyə gəlinir ki, Muğan düzündə yeni gətirmələr altında paleotorpaqlar mövcuddur ki, bunlar da fiziki, kimyəvi tərkibinə görə üst hissədən fərqlənir.

## ƏDƏBİYYAT

**Babayev M.P.** (1976) Mil düzünün basdırılmış torpaqları. *Xəbərlər (Biologiya elmləri)*, **III:** 55-58.

**Babayev M.P. Həsənov V.H., Cəfərova Ç.M., Hüseynov S.M.** (2011) Azərbaycan torpaqlarının

morfogenetik dioqnostikası, nomenklaturası və təsnifatı. Bakı: Elm, 194 s.

**Волобуев В.Р.** (1951) Вопросы качественной оценки земельного фонда Азербайджана. *Известия АН Азерб.ССР*, **I:** 89-100.

**Алекперов К.А**. (1952) О ветровой эрозии в Азербайджане. *Тр.Ин-та Земледелия АН Азерб.ССР*, **I:** 37-42.

**Helmes D., Effland A. B.W., Durana P.S.** (2002) Profiles in the history of U.S. Soil survey. A Blackwell Publisher, **239.**

**İsbel R.F. (2001)** Australian Soil Classification, 8.

**Rycroft D.W., Amer M.H.** (1995) Prospects for the drainage of clay soils. Fao İrrigation And Drainage Paper 51**. İSNN 0254-5284. FAO.**

## Погребенные Серо-Луговые Почвы Муганской Равнины

**М.П Бабаев, Ф.М. Фейзиев**

*Институт Почвоведения и Агрохимии НАНА*

В статье дан обзор морфогенетической диагностики, физических и химических особенностей погребенных в результате исторического процесса почв Муганской равнины. Согласно обзорам двух указанных порезов можно прийти к выводу, что причиной образования погребенных почв стало интенсивное нахождение этих почв под наводнениями и проведение агроирригаций на поверхности почв. Поэтому считается необходимым провести палеоземельное исследование этих почв. В целом, слой почвы, который считается погребенным, показывает свойства слоя серо-луговых почв. В частях ново погребенных почв с точки зрения времени идет процесс «кипения» и создается проблема для классификации. Другой необходимостью для проведения палеоземельного исследования является то, что по ходу течения времени станет возможным определить происходящие изменения, т.к. почва и ее генетические слои сохраняют условия почвообразования в хронологическом порядке в своих морфогенетических показателях.

***Ключевые слова:*** погребенные почвы, палео-земельный, морфогенетическая диагностика, генетический слой, гумус

## Buried Meadow Gray - Soils Of The Mughan Plain

**M.P. Babaev, F.M. Feyziyev**

*Institue of Soil Science and Agro Chemistry*

Morphogenetic diagnostics, physical and chemical characteristics of the buried soils of the Mughan plain as a result of the historical process have been presented in the review article. According to surveys of these two cuts it can be concluded that the reason for the formation of buried soils is the intensive floods and agro-irrigation on the surface of the soil. Therefore it is considered necessary to conduct a paleo-soil investigation of these soils. In general, the layer of the soil, which is considered buried, shows the properties of the layer of gray - meadow soils. Despite the fact that in parts of newly buried soils the time-dependent process of "boiling" occurs and creates a problem for classification. Another necessity for paleo-soil investigation is that with the passing of time it will be possible to determine the occurring changes, because soil and its genetic layers preserve the conditions of soil formation in their morphogenetic indicators in chronological order.

***Key words:*** *Buried soils, pale-soil, morphogenetic diagnostics, genetic layer, humus*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 68, №3, səh. 204-210 (2013)*

# Azərbaycanın Qərb Bölgəsinin Xüsusi Mühafizə Olunan Təbiət Ərazilərinin Səhləbkimiləri *(Orchidaceae)*

**A.A.Bayramova**

*Gəncə Dövlət Universiteti, Gəncə şəh., Azərbaycan*

**Azərbaycanın Qərb Bölgəsində antropogen təsirlərə məruz qalmış və Xüsusi Mühafizə olunan təbiət ərazilərində Səhləbkimilərin növ tərkibi, yayılma qanunauyğunluqları və mühafizəsinin nəzəri və praktiki əsaslar tədqiq olunmuşdur. Aşkar olunmuşdur ki, antropogen landşaflarda səhləbkimilər tək-tək, səpələnmiş halda, yalnız müəyyən refigiumlarda özünü qoruyub saxlaya bilir. Rast gəlinən növlər isə tam həyat tsiklini başa çatdıra bilmir. Göy-göl Milli parkının meşə talalarında Səhləbkimilərin əmələ gətirdiyi təbii örtük Xüsusi Mühafizə olunan Təbiət ərazilərinin rolunun nə qədər vacibliyini göstərir. Ərazidə yayılan 14 cinsə aid 27 növün (onlardan 2 növ ərazi üçün ilk dəfə göstərilir) həyat tsikli ilə yanaşı, bioekoloji xüsusiyyətləri də öyrənilmişdir.**

***Acar sözlər**: flora, fəsilə, cins, növ, Orchidaceae*

## GİRİŞ

Öz gözəlliyi və zənginliyi ilə dünyada məşhur olan səhləblər bitkilər aləminin əvəzolunmaz bir hissəsidir. "Səhləb" gözəllik, cazibədarlıq, sevgi rəmzidir. Tropik ölkələrdə Səhləbkimilər fəsiləsinə 1000 cinsə aid olan 25.000-30.000-ə qədər növ daxildir. Səhləblər növ müxtəlifliyinə, ölçüsünə, çəkisinə və rəng çalarlarına görə bir-birindən çox fərqlənir.

Bəzi səhləblər yeraltı, bəziləri qayalar üzərində, torpaqda və bir çoxları digər bitki və ağac üzərində inkişaf edərək epifit həyat tərzi kecirir.

Səhləblər ekoloji mühitə uygunlaşan (quru yerlər istisna olmaqla) tropik iqlim zonalarında geniş yayılmışdır. Məsələn, keçmiş SSRİ ərazisində 120 növ, Azərbaycanda 50 növ, Uzaq Şərqdə 60,Vyetnamda 200, Floridada 100, Kubada 307, Venesuelada 1055 növü var (Конспект Флоры Кавказа, 2006; Флора Азербайджана, 1952; Черепанов, 1995).

Səhləbkimilərin nümayəndələrinin sayı intensiv antropogen təsirlər nəticəsində ərazilərdə kəskin azalır. Səhləbkimilərin əksəriyyəti "Qırmızı kitaba" salınıb və onların toplanması yolverilməzdir.

## MATERİAL VƏ METODLAR

Tədqiqatlar 2008-2013-cü illərdə Azərbaycanın qərb bölgəsinin xüsusi mühafizə olunan təbiət ərazilərində (Göy-göl Milli Park (GMP), Eldar şamlığı (EŞDTQ), Qarayazı (QDTQ), Korçay Dövlət Təbiət Qoruğu (KDTQ) aparılmışdır. Tədqiqat materialı Səhləbkimilər (*Orchidaceae*) olmuşdur.

Tədqiqatların aparılmasında marşurut stasionar və kameral metodlardan istifadə olunmuşdur (Гроссгейм, 1936; Гаджиев, 1971; Əsgərov, 2011; Толмачев, 1986). Eyni zamanda Botanikada istifadə olunan floristik, floristik-sistematik, areoloji, botaniki-coğrafi, fitosenoloji, statistik metodlar nəzərə alınmışdır (Лавренко, 1964; Novruzov, 2010; Novruzov və b., 2010). Marşurutlar orta dağ qurşağından başlayıb subnival və nival qurşaqlarına qədər dağ suxurları, yarğanları, çılpaq və eroziyaya uğramış suxurları və töküntüləri əhatə etmişdir

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Azərbaycan florasında növ tərkibi, yayılma qanunauyğunluqları və mühafizəsinin nəzəri və praktiki əsaslarla işlənib hazırlanması məqsədilə Azərbaycanın Qərb Bölgəsində antropogen təsirlərə məruz qalmış və Xüsusi Mühafizə olunan təbiət ərazilərində səhləbkimilər tədqiq olunmuşdur.

Xüsusi Mühafizə olunan Təbiət ərazilərində Səhləbkimilərin 14 cinsə aid olan 27 növü yayılmışdır.

Səhləbkimilər fəsiləsindən *Ophrys apifera* Huds. 1762, Fl. Angl.:340.; *Anacamptis pyramidalis* (L.) Rich.1817, Orchid. Eur. Annot.:33; *Goodyera repens* (L.) R. Br. 1813, in Ait.et Ait. f. Hort. Kew ed. 2,5:198.; *Corallorhiza trifiida* Chatel. 1760, Sp. Inaug. Corall.:8. Azərbaycanda yalnız Qərb Bölgəsində Xüsusi Mühafizə olunan təbiət ərazilərinin refigiumlarında qorunub saxlanılmışdır. *Ophrys apifera*, *Anacamptis pyramidalis* kiminövlər Göy-göl Milli Parkının meşə talalarında səhləbkimilərin əmələ gətirdiyi təbii örtük Xüsusi Mühafizə olunan Təbiət

ərazilərinin rolunu nə qədər vacibliyini göstərir (Bayramova, 2013; Əlizadə, 2011; Novruzov və b., 2010) (Şəkil 1).



**Şəkil 1.**Göy-göl Milli Parkında səhləb cəngəlliyi.

Tədqiqat ərazisindəki bütün səhləbkimilər kökyumrusu əmələ gətirən qısa kökümsovlu (geofit) çoxillik otlar, kriptofitlərdir.

***Fəs. Orchidaceae* Juss.- *Səhləb***

**Cins*: Orchis* L.- *Səhləb***

***O.tridentata* Scop.**1772, Fl. Catn. ed. 2, 2:190.-*O.taurica* Lindl. 1835,Gen. Sp. Orchid.: 271.-Üçdiş s.

Kökyumrusu əmələ gətirən qısa kökümsovlu çoxillik otdur, kriptofit (geofit), 20-30 sm boyunda bitkidir. Çiçəkləmə V-VI. Orta dağ qurşağında, kolluqlarda, gölməçələrin və çayların kənarında daşlı yerlərdə rast gəlir. EŞDTQ, GMP, Avro-Aralıqdənizi areallıdır.

Növ Avropadan təsvir olunmuşdur.

Azərbaycanda Kür düzənliyində, Kiçik Qafqazın Şimali-cənubunda, Lənkaranda yayılır. Qafqazda Dağıstanda, Qərbi və Şərqi Zaqafqaziyada rast gəlinir.

Ümumi yayılma: Atlantika, Mərkəzi, Cənubi Avropa, Cənub-Qərbi (Türkiyə, Şimali Suriya, Şimali İrak, Şimali İran) Asiya.

***O. papilionacea* L.** 1759, Systema, ed. 10:1242.-*Vermeulenia papilionacea* (L.) A.et D. Löve, 1972, Acta Bot. Neerl.21:554.- Əmzikvarı s.

Hündürlüyü 20-30 sm-ə çatır, çiçəkləmə V-VI. Orta və yüksək dağ qurşağında, dağ ətəklərində rast gəlir. EŞDTQ, GMP. İran-Turan.

Növ Avropadan təsvir olunmuşdur.

Azərbaycanda Samur-Dəvəçi düzənliyi, Qobustan, Kür-Araz düzənliyi, Lənkaranda yayılır.

Qafqazda Dağıstan və Şərqi Zaqafqaziyada yayılır.

Ümumi yayılma: Cənub-Qərbi Asiya (Şimali İran).

***O.punctulata* Stev.ex Lindl.**1835, Gen. Sp. Orch. Pl.:273. - *O.sepulchralis* Boiss. et Heldr. 1854, in Boiss. Diagn. Pl. Orient.Ser. 1,13:10.-*O. schelkownikowii* Woronow, 1909, Изв.Кавк. муз. 4:266.-*O.adenocheila* Czerniak. 1924, Not. Syst.(Leningrad), 5:173.- *O. aserica* B.Baumann, H. Baumann, Lorenz et Peter, 2003, J. Eur. Orch. 35, 1:174. - Nöqtəvari s.

20-35 sm hündürlükdə çoxillik otdur, çiçəkləmə V-VI. Aşağı və orta dağ qurşağından subalp yüksəkliyinə qədər, kolluqlarda, meşədə, meşə kənarında yayılır. GMP, EŞDTQ, KDTQ. İran-Turan

Növ Krımdan təsvir olunmuşdur.

Azərbaycanda Kür-Araz düzənliyi, Bozqır yaylası, Lənkaranda yayılır.

Qafqazda Şərqi-Qərbi Zaqafqaziyada yayılır.

Ümumi yayılma: Cənub-Şərqi Avropa, Aralıq dənizi, Cənub-Qərbi Asiya (Türkiyə, Şimal-Qərbi İran, Şimali İrak).

***O.stevenii* Reichenb.**1849, Bot. Zeit. 7:892.- O.militaris subsp. steveni (Reichenb. f.) B. Baumann, H. Baumann, Lorenz et Peter, 2003,J. Eur. Orch. 35, 1:179. – Steven s.

25-30 sm hündürlükdə çoxillik otdur, çiçəkləmə V-VI. Aşağı və orta dağ qurşağında, meşədə, çay kənarında daşlı yerlərdə rast gəlir. EŞDTQ, QDTQ.Qafqaz

Növ Qafqazdan təsvir olunmuşdur.

Azərbaycanda Quba, Kür-Araz düzənliyi, Kiçik Qafqazın Şimal və Mərkəzində yayılmışdır.

Qafqazda Şərqi, Cənubi Zaqafqaziyada və Talışda yayılır.

Ümumi yayılma:Cənub-Qərbi Asiya (Türkiyə).

***O. purpurea* Huds.** 1762, Fl. Angl.:334- O. fusca Jacq. 1776, Fl. Austr.4:4, tab. 307.-*O. maxima* C. Koch, 1846, Linnaea, 19:14.-*O. caucasica* Regel, 1870, Ind. Sem. Hort. Bot. Petropol. 1868, Suppl. 1869:22 - *O.purpurea subsp. caucasica* (Regel) B. Baumann, H. Baumann, Lorenz et Peter, 2003,J. Eur. Orch. 35, 1:182. - Fır-fır s.

25-35 sm ölçüdə çoxillik otdur. çiçəkləmə V. Orta dağ qurşağında, meşə kənarında, kolluqlarda, daşlı qayalıqlı yerlərdə yayılır. EŞDTQ. Avro-Qafqaz.(R.)

Növ İngiltərədən təsvir olunmuşdur.

Azərbaycanda Quba, Samur- Dəvəçi düzənliyi, Qobustan, Kür-Araz düzənliyi, Kiçik Qafqazın Şimal və Mərkəzindən yayılmışdır.

Qafqazda Dağıstan, Şərqi və Qərbi Zaqafqaziyada yayılır.

Ümumi yayılma: Atlantika. Mərkəzi, Cənubi, Cənub-Şərqi Avropa, Aralıqdənizi,Cənub-Qərbi Asiya (Türkiyə).

***O.mascula* L.**1755, Fl. Suec. ed. 2:310.- *O.mario var.mascula* L.1753, Sp.Pl. 2:941.- Erkək s.

20-40 sm ölçüdə çoxillik otdur, çiçəkləmə V-VI. Aşağı və orta dağ qurşağından subalp yüksəkliyinə qədər, meşədə kolluqlarda yayaılır. EŞDTQ, KDTQ, QDTQ. Avro-Qafqaz

Növ Avropadan təsvir olunmuşdur.

Azərbaycanda Böyük Qafqazın Şərq, Qərb, Kiçik Qafqazın Şimalı, Mərkəzi, Naxçıvan və Lənkərandan yayılmışdır.



**Şəkil 2.**Orchi *mascula* L.

Qafqazda Cənubi, Şərqi və Qərbi Zaqafqaziyada yayılir.

Ümumi yayılma:Avropa, Aralıqdənizi, Şimali, Cənub-Qərbi Asiya

***O.palustris* Jacq.**1787, Collect. Bot. 1:75 - *O.elegans* Heuff. 1835, Flora (Reichenb.), 18:250.- *O.pseudolaxiflora* Czerniak. 1941, Фл. Узбек.1:525, 545, табл. 77, 2.-*O.laxiflora* auct. non Lam.: Гроссг.1940. Фл. Кавк. изд .2, 2 : 240. - Bataqlıq s.

25-35 sm hündürlükdə çoxillik otdur, cicəkləmə V-VI. Orta dağ qurşağında, bataqlıqlarda, gölməçələrdə, çay kənarında yayılır. QDTQ. Avro-Aralıqdənizi

Növ Avstriyadan təsvir olunmuşdur.

Azərbaycanda Samur-Dəvəçi düzənliyi, Böyük Qafqazın Şimalı, Kür-Araz düzənliyi, Kiçik Qafqazın Şimalı, Naxçıvan və Lənkaranda yayılır.

Qafqazda Şərqi, Cənubi Zaqafqaziya və Talışda yayılır.

Ümumi yayılma:Atlantika, Mərkəzi,Cənubi Avropa,Cənub-Qərbi , Orta Asiya

**Cins*: Ophrys* L. - *Quşsəhləbi***

***O.apifera* Huds.**1762, Fl. Angl.:340.- İyli q.10-20 sm hündürlükdə çoxillik otdur, çiçəkləmə V. Aşağı və orta dağ qurşağında quru yamaclarda yayılır. KDTQ, EŞDTQ,QDTQ. Avro-Qafqaz.(R.)

Növ İngiltərədən təsvir olunmuşdur. Azərbaycanda Lənkaranda yayılması barədə məlumatlar vardır (Флора Азербайджана, 1952) Azərbaycanın Qərb Bölgəsinin Xüsusi Mühafizə Olunan Təbiət Əraziləri üçün ilk dəfə bizim tərəfimizdən göstərilir.

Qafqazda Qərbi, Şərqi və Cənubi Zaqafqaziyada, Talışda yayılır.

Ümumi yayılma: Atlantika. Mərkəzi, Cənubi, Cənub-Şərqi Avropa, Aralıqdənizi ,Cənub-Qərbi Asiya (Suriya, Türkiyə, Şimali İran, Şimali İrak).

**Cins*: Traunsteinera* Reichenb. - Traunsteinera**

***T. sphaerica* (Bieb.) Schlechter**, 1928, Monogr.Ic. Orch. Eur.1,7-8:227.-*Orchis sphaerica* Bieb.1808, Fl. Taur.-Cauc. 2:362.-*O. globosa var. sphaerica* (Bieb.) Schmalh. 1897, Фл. Ср. Южн. Рос.2:456. - Kürəvi t.

Yüksək dağ qurşağında subalp və alp çəmənliyində yayılır. GMP. Qafqaz. (Pl.)

Növ Gürcüstadan təsvir olunmuşdur.

Azərbaycanda Böyük Qafqazın Qərbi, Kiçik Qafqazın Şimali və Mərkəzində yayılır.

Qafqazda Dağıstan, Qərbi, Şərqi və Cənubi Zaqafqaziyada yayılır.

Ümumi yayılma: Cənub-Qərbi Asiya (Şimali-Şərqi Türkiyə).

**Cins*: Dactylorhiza* Neck.ex Nevski-Daktylorhiza**

***D. iberica* (Bieb. ex Willd.) Soo**1962, Nom. Nov.Gen.Dactylorhiza:3-*Orchis iberica* Bieb. ex Willd.1805, Sp. Pl. 4: 25 – İberiya d.

8-25 sm ölçədə çoxillik odur, çiçəkləmə V-VI. Aşağı və orta dağ qurşağında rütubətli yerlərdrast gəlir. KDTQ, QDTQ, EŞDTQ.Qafqaz

Növ Şərqi Qafqazdan təsvir olunmuşdur.

Azərbaycanda Qobustan, Kiçik Qafqazın Cənubi və Şimalında yayılır.

Qafqazda Şərqi və Cənubi Zaqafqaziyada yayılır.

Ümumi yayılma:Cənub-Şərqi Avropa (Bolqariya, Krım), Aralıqdənizi,Cənub-Qərbi Asiya (Türkiyə, İran, İrak, Suriya, Livan).

***D. flavescens*(C. Koch) Holub**, 1976, Folia Geobot. Phytotax.(Praha),11,1:83.- *Orchis flavescens* C. Koch, 1849, Linnaea, 22:281.- *O.tenuifolia* C.Koch,1849, 1. c.:281. - Sarımtıl d.

8-25 sm hündürlükdə çoxillik otdur, cicəkləmə V-VI. Aşağı dağ qurşağından subalp yüksəkliyinə qədər, rütubətli yerlərdə, meşə və kolluqlarda rast gəlir. KDTQ, EŞDTQ,QDTQ. İran-Turan

Növ Zaqafqaziyadan təsvir olunmuşdur.

Azərbaycanda Böyük Qafqazın Qərbi, Şərqi, Kiçik Qafqaın Mərkəzi, Cənubu, Naxçıvan MRvə Lənkaranda yayılır.

Qafqazda hər yerdə rast gəlinir.

Ümumi yayılma:Cənub-Qərbi (Şərqi Türkiyə, Şimali-Qərbi İran, Şimali İrak), Orta (Türkmənistan) Asiya.

***D.urvilleana*(Steud.) H.Baumann et Kuenkele**, 1981, Mitt. Bl. Arbeitskr. Heim. Orch. Badem-Wurth. 13, 2: 240.- *Orchis urvilleana* Steud.1841, Nomencl. Bot. ed. 2,2 : 252-*O.pontica* H.Fleischm. et Hand.- Mazz.1909, Ann. Naturh. Mus. (Wien) 23,1-2:208.-*D. amblyoloba* Nevski, 1935, Фл. СССР, 4:707.-Urveliand.

8-25 sm hündürlükdə çoxillik otdur, cicəkləmə V-VI. Orta və yüksək dağ qurşağında meşə və kolluqlarda, rütubətli çəmənliklərində rast gılir. GMP, EŞDTQ. Qafqaz

Növ Abxazidən təsvir olunmuşdur.

Azərbaycanda Böyük Qafqazın Şərqi, Qərbi, Kiçik Qafqazın Mərkəzi və Şimalında yayılır.

QafqazdaŞərqi, Qərbi, Cənubi Zaqafqaziyada rast gəlinir.

Ümumi yayılma:Cənub-Qərbi Asiya (Şimali-Şərqi Türkiyə, Şimali-Qərbi İran).

***D.euxina* (Nevski) Czer**.1981(17 Feb.),Сосуд. раст. СССР:308; H.Baumann et Kuenkele, 1981, Mitt.Bl. Arbeitskr. Heim. Orch. Baden-Wurth. 13, 2:235. –*Orchis euxina* Nevski, 1935, Фл. СССР, 4:709.-*O. monticola subsp. caucasica* Klinge, 1898, Dactylorch. Monogr. Prodr.(seors.expr.):35-*O.caucasica* (Klinge) Medw. 1919, Тр.Тифл. бот.сада, 18,2:476, non Regel, 1869.- Qılıncyarpaq d.

15-30 sm hündürlükdə çoxillik otdur, çiçəkləmə V-VI. Kiçik Qafqazın şimalında, alp qurşağında rütubətli alp çəmənliyində rast gəlir. GMP.Qafqaz

Növ Qafqazdan təsvir olunmuşdur.

Azərbaycanda Böyük Qafqazın Şimali-Qərbi,Şərqi, Kiçik Qafqazın Şimalı və Mərkəzi.

Qafqazda Dağıstan Qərbi və Şərqi Zaqafqaziyada rast gəlinir.

Ümumi yayılma: Cənub-Qərbi Asiya (Şimali-Şərqi Türkiyə, Şimali-Qərbi İran).

***D.salina* (Turcz ex Lindl.)** Soo, 1962, Nom.Nov.Gen.Dactylorhiza:4-*Orchis salina* Turcz. ex Lindl.1835, Gen. Orch. Pl.:259.- *O.sanasunitensis* auct. Caucas. non H.Fleischm.: Невский, 1935, Фл.СССР, 4:715; Гроссг. 1940, Фл. Кавк., 2, 2:244; он же, 1949, Опред. раст. Кавк.: 645 Фл. Азерб. 2:254, 255; Галушко, 1978, Фл. Сев.Кавк.1:183.- Şoran d.

15-30 sm hündürlükdə çoxillik otdur, cicəkləmə V-VI. Kiçik Qafqazın, yüksək dağ qurşağında, çəmənliklərdə yayılır. GMP.Ümumqədimaralıqdənizi.

Növ Baykaldan təsvir olunmuşdur.

Azərbaycanda Böyük Qafqazın Qərbi, Kiçik Qafqazın Şimali və Qərbi, Naxçıvanda yayilir.

Qafqazda Dağıstan, Şərqi və Qərbi Zaqafqaziyada rast gəlinir.

Ümumi yayılma:Şimali (Cənub-Şərqi Sibir), Orta (Tacikistan, Qırğızıstan, Qazaxıstan) Mərkəzi (Monqolustan, Şimali-Şərqi Çin) Asiya.

**Cins*: Anacamptis Rich. - Bağ səhləbi***

***A. pyramidalis*** ( L.)Rich.1817, Orchid. Eur. Annot.:33- *Orchis pyramidalis* L. 1753, Sp.Pl.2:940 - Piramidal b.

25-35 sm hündürlükdə çoxillik otdur, cicəkləmə V. Aşağıdan orta dağ qurşağına qədər, dağ yamaclarında, kolluqların kənarında yayılır. KDTQ, QDTQ, EŞDTQ. Avro-Aralıqdənizi

Növ İngiltərədən təsvir olunmuşdur.

Azərbaycanda Quba və Qusar rayonları arasında rast gəlir. Azərbaycanın Qərb Bölgəsinin Xüsusi Mühafizə Olunan Təbiət Əraziləri üçün ilk dəfə göstərilir.

Qafqazda Dağıstanda və Böyük Qafqazın Şərqində yayılır.

Ümumi yayılma:Avropa, Cənub-Qərbi Asiya (Türkiyə, Şimali İrak, Şimali Suriya, Şimali İran).

**Cins*: Coeloglossum* Hartm. *–Boş ləçək.***

***C.viride* (L.) C.Hartm**.1820, Handb. Scand. Fl.:329.-*Satyrium viride* L.1753 Sp.Pl.: 944.- Yaşıl b.

15-25 sm hündürlükdə çoxillik otdur, cicəkləmə V-VI. Kiçik Qafqazın şimalında, subalp və alp qurşağında çəmənliklərdə, dağ ətəklərində, yüksək dağ meşələrində rast gəlir. GMP. Holarktik

Növ Avropadan təsvir olunmuşdur.

Azərbaycanda Böyük Qafqazın Qərbi və Şərqi, Kiçik Qafqazın Mərkəzi və Şimalında yayılır.

Qafqazda Dağıstan, Qərbi və Şərqi Zaqafqaziyada yayılır.

Ümumi yayılma:Avropa, Asiya, Şimali Amerika.

**Cins*: Gymnadenia* R.Br.*- Dəmir səhləb***

***G. conopsea*(L.) R. Br.** 1813, in Ait. et Ait.f. Hort. Kew, ed. 2,5:191- *Orchis conopsea* L.1753, Sp.Pl.: 942.– Çılpaq d.

20-40 sm hündürlükdə çoxillik otdur, cicəkləmə V-VIII. Yüksək dağ qurşağında alp və subalp çəmənliyində rast gəlir. GMP. Polearktik.

Növ Avropadan təsvir olunmuşdur.

Azərbaycanda Böyük Qafqazın Qərbi, Şərqi, Kiçik Qafqazın Şimali, Mərkəzi, Cənubu və Lənkaranda yayılır.

Qafqazda hər yerdə.

Ümumi yayılma: Avropa, Asiya.

**Cins*: Cephalanthera Rich. – Tozbaş səhləb***

***C.rubra* (L.) Rich**.1817, Orchid. Eur. Annot.:38- *Serapias rubra* L.1767, Syst. Ed.12,2:594. – Qırmızı t.

20-30 sm hündürlükdə çoxillik otdur, cicəkləmə VI. Orta dağ qurşağında meşədə, kolluqlarda,daşlı dağ yamaclarında rast gəlir. GMP, EŞDTQ.Panboreal

Növ Avropadan təsvir olunmuşdur.

Azərbaycanda Samur-Dəvəçi düzənliyi, Böyük Qafqazın Şərqi, Qərbi, Qobustan, Kiçik Qafqazın Şimali, Mərkəzi, Cənubu və Lənkəranda yayılır.

Qafqazda Qərbi, Cənubi və Şərqi Zaqafqaziyada yayılır.

Ümumi yayılma: Atlantika. Orta, Mərkəzi,Cənubi, Cənub-Şərqi, Şərqi Avropa, Şimali(Sibir), Cənub-Qərbi (Şimai İrak, Şimali İran), Orta (Şimal-Şərqi Qazaxıstan) Mərkəzi (Qərbi Manqolustan, Şimali Çin) Asiya.

***C. longifolia* (L.) Fritsch**, 1888, Österr. Bot. Zeitschr. 38:81.-*Serapias helleborine var. langifolia* L.1753, Sp.Pl. 2:950.- *S . lonchophyllum* L. f.1781, Suppl.:404.- *Cephalanthera ensifolia* Rich. 1817, Orchid. Eur. Annot.:38. – Uzunyarpaq t.

20-40 sm hündürlükdə çoxillik otdur, cicəkləmə VI. Aşağı və orta dağ qurşağında kserofit meşələrdə və kolluqlarda yayılır. KDTQ, QDTQ, EŞDTQ. Panboreal

Növ Avropadan təsvir olunmuşdur.

Azərbaycanda Samur-Dəvəçi düzənliyi, Böyük Qafqazın şərqi, qərbi, Kiçik Qafqazın Şimalı, Mərkəzi, Cənubu və Lənkəranda yayılır.

Qafqazda Cənubi Zaqafqaziyadan başqa hər yerdə rast gəlir.

Ümumi yayılma:Atlantika. Mərkəzi,Cənubi, Cənub-Şərqi Avropa, Cənub-Qərbi, Mərkəzi Asiya.

***C.damasonium* (Mill.) Druce**, 1906, Ann.Scott. Nat. Hist. 60:225.-*Serapias damasonium* Mill.1768, Gard. Dict. ed. 8, N2.-*S.grandiflora* L.1767, Systema, ed.12,2:594, nom. illeg. Superfl.- *C.grandiflora* (L.)S.F. Gray, 1821, Nat. Arr.Brit. Pl. 2:210. –Damason t.

20-40 sm hündürlükdə çoxillik otdur, hemikriptofitdir, cicəkləmə V-VI. Orta dağ qurşağına qədər, kserofit meşələrdə və kolluqlarda rast gəlir. QDTQ, EŞDTQ. Avro-Qafqaz

Növ İngiltərədən təsvir olunmuşdur.

Azərbaycanda Samur-Dəvəçi düzənliyi, Böyük Qafqazın Qərbi, Kiçik Qafqazın şimalı vəmərkəzində yayılır.

Qafqazda Qərbi və Şərqi Zaqafqaziyada.

Ümumi yayılma:Atlantika. Mərkəzi,Cənubi, Cənub-Şərqi Avropa, Cənub-Qərbi (Türkiyə, İran) Asiya.

**Cins: *Epipactis* Zinn – *Mürgəkotu***

***E.helleborine*(L.) Crantz**, 1769, Stirp. Austr. ed. 2, 2:467.- *Serapias helleborine* L.1753, Sp.Pl.:949, p.p. quoad var. latifolia L.-*S.latifolia* (L.)L.1767, Syst. Nat. Ed. 12,2:593. –*Epipactis latifolia* (L.) All.1785, Auct. Fl.Pedem.2: 151, nom. rej- İşıqsevən m.

Qısakökümsovlu çoxillik otdur, kriptofit, 30-60 sm, çiçəkləmə VII-VIII. Aşağı və orta dağ qurşağında meşədə, kolluqların kənarında yayılır. EŞDTQ, KDTQ, QDTQ.Holarktik.

Növ Avropadan təsvir olunmuşdur.

Azərbaycanda Samur-Dəvəçi düzənliyi, Böyük Qafqazın şərqi, qərbi, Kiçik Qafqazda hər yerdə və Lənkəranda yayılır.

Qafqazda hər yerdə rast gəlir.

Ümumi yayılma: Avropa, Aralıqdənizi, Şimali, Cənub-Qərbi ( Türkiyə,Suriya, İran,İrak, Əfqanıstan, Pakistan) Orta (Qazaxıstan), Mərkəzi (Şimal-Qərbi Çin, Şimal-Qərbi Monqolustan) Asiya, Şimali Amerika.

***E.palustris*(L.) Crantz**, 1769,Stirp. Austr.ed. 2,2:462.- *Serapias helleborinevar.palustris* L.1753, Sp.Pl. 2:950.-*S. palustris*(L.) Mill. 1768, Gard. Dict.ed.8, N 3. – Batdaxlı m.

Sulu və quru mühitdə yaşayan 40-100 smboyunda, çoxillik otdur, çiçəkləmə VI-VII. Orta dağ qurşağına qədər, rütubətli yerlərdə, kölgəli meşələrdə və kolluqlardarast gəlir. KDTQ, QDTQ.Panboreal

Növ Avropadan təsvir olunmuşdur.

Azərbaycanda Quba, Kür düzənliyi və Kiçik Qafqazın Şimalında yayılır.

Qafqazda Şərqi, Qərbi Zaqafqaziyada.

Ümumi yayılma:Atlantika. Şimali, Mərkəzi,Cənubi, Cənub-Şərqi, Şərqi Avropa, Şimali (Sibir), Cənub-Qərbi(Şimai İrak, Şimali İran), Orta (Şimal-Şərqi Qazaxıstan)Mərkəzi (Qərbi Manqolustan, Şimali Çin) Asiya.

**Cins*:* *Epipogium* J.G.Gmel. ex Borkh. *(=Epipogon* Patze et al.) – Saqqalüstü**

***E.aphyllum* (F.W.Schmidt) Sw**.1814, Summa Veg. Scand.:32.- *Satyrium epipogium* L. 1753, Sp. Pl. 2:945.- *Orchis aphylla* F.W. Schmidt, 1791, in Mayer, Phys. Aufs.: 240, non Forsk.1775.- *Epipogium gmelinii* Rich. 1817, Orchid. Eur. Annot.:36– Yarpaqsız s.

Qısakökümsovlu çoxillik otdur, kriptofit (saprofit), 15-25 sm, çiçəkləmə VII-VIII. Aşağı və orta dağ qurşağında kölgəli, palıd meşələrinin kənarında rast gəlir. KDTQ, QDTQ, EŞDTQ. Polearktik.

Növ Sibirdən təsvir olunmuşdur.

Azərbaycanda Böyük Qafqazın şərqi, qərbi, Kiçik Qafqazın şimalı və Lənkəranda yayılır.

Qafqazda Şərqi, Qərbi Zaqafqaziya və Talışda rast gəlir.

Ümumi yayılma: Avropa, Asiya.

**Cins: *Listera* R.Br. – Gizli çiçək**

***L.ovata* (L.) R. Br**. 1813, in Ait.et Ait.(f.) Hort. Kew ed. 2,5:202.-*Ophrys ovata* L.1753, Sp. Pl. 2:946.– Oval g.

Qısakökümsovlu çoxillik otdur, hemikriptofit , 20-30 sm, çiçəkləmə V. Orta dağ qurşağına qədər, meşədə, rütubətli yerlərdə, kölgəli meşələrdə, kolluqlarda, KDTQ, QDTQ. Plyuregional.

Növ Avropadan təsvir olunmuşdur.

Azərbaycanda Böyük Qafqazın qərbi, şimalı, Kiçik Qafqazın mərkəzi, və Lənkəranda yayılır.

Qafqazda Dağıstan, Şərqi, Qərbi Zaqafqaziya və Talışda rast gəlir.

Ümumi yayılma:Avropa,Şimali, Cənub-Qərbi(Türkiyə), Şərqi Asiya, Şimali Amerika.

**Cins: *Neottia* Guett. – Yuvacıq otu**

***N.nidus-avis* (L.) Rich**. 1817, Orch. Eur. Annot.:37.- *Ophrys nidusavis* L.1753, Sp.Pl.:945. – Həqiqi y.

Qısakökümsovlu, 10-25 sm boyunda çoxillik hemikriptofit (saprofit)otdur, cicəkləmə V-Vİ. Aşağı və orta dağ qurşağında kölgəli meşələrdə, dağ ətəklərində yayılır. KDTQ, QDTQ. Panboreal.

Növ İsveçrə, Almaniya və Fransadan təsvir olunmuşdur.

Azərbaycanda Böyük Qafqazın şərqi, qərbi, Kiçik Qafqazın şimalı, cənubu və Lənkəranda yayılır.

Qafqazda Dağıstan, Şərqi, Qərbi Zaqafqaziya və Talışda rast gəlir.

Ümumi yayılma: Avropa, Aralıqdənizi, Şimali və Cənub-Qərbi Asiya (Türkiyə, Şimali və Qərbi İran) .

**Cins: *Goodyera* R. Br. – Qudayera**

***G.repens*(L.) R. Br**. 1813, in Ait.et Ait. f. Hort. Kew ed. 2,5:198.- *Satyrium repens* L.1753, Sp. Pl. 2:945. – Sürünən q.

Həmişəyaşıl boyu 8-15 sm olan, çoxillik, hemikriptofit, otdur.ÇəkləməVI-VII. Orta və yüksək dağ qurşağında şam meşələrində rast gəlir. GMP, EŞDTQ.Holarktik.

Növ İsveçrə, İngiltərə və Sibirdən təsvir olunmuşdur.

Azərbaycanda Kiçik Qafqazın şimalında yayılır. Azərbaycanın Qərb Bölgəsinin Xüsusi Mühafizə Olunan Təbiət Ərazilərində tək-tək rast gəlir.

Qafqazda Dağıstan, Şərqi, Qərbi və Cənubi Zaqafqaziyada yayılmışdır.

Ümumi yayılma:Avropa, Şimali və Cənub-Qərbi (Türkiyə, Şimali və Qərbi İran) Asiya, Şimali Amerika.

**Cins: *Corallorhiza* Chatel. – Mərcan gülü**

***C.trifiida*Chatel.**1760, Sp. Inaug.Corall.:8.- *Ophrys corallorhiza* L. 1753, Sp. Pl. 2:945. – *Corallorhiza innata* R. Br.1813, in Ait et Ait. fil. Hort. Kew ed. 2,5:208– Uçyarıq m.

Qısakökümsovlu çoxillik otdur, boyu 10-20 sm-dir, çiçəkləmə VII. Orta və yüksək dağ qurşağında, kölgəli meşələrdə kolluqlarda yayılır. GMP, EŞDTQ. Holarktik.

Növ Şimali Avropadan təsvir olunmuşdur.

Azərbaycanda Kiçik Qafqazın şimalında və Qərb Bölgəsinin Xüsusi Mühafizə Olunan Təbiət Ərazilərində yayılır.

Qafqazda Dağıstan, Şərqi Zaqafqaziyada rast gəlinir.

Ümumi yayılma: Avrasiya, Şimali Amerika.

Aşkar olunmuşdur ki,antropogen landşaflarda səhləbkimilər tək-tək, səpələnmiş halda, yalnız müəyyən refigiumlarda özünü qoruyub saxlaya bilmişdir. Rast gəlinən növlər isə tam həyat tisklini başa çatdıra bilməmişlər.

## ƏDƏBİYYAT


**Bayramova A.A.** (2013) Azərbaycanın qərb bölgəsinin xüsusi mühafizə olunan təbiət ərazilərinin flora biomüxtəlifliyi. Bakı. Elm: 327 s.

**Bayramova A.A.** (2010) Korçay Dövlət Təbiət Qoruğunun bitkiliyi. *AMEA GREM Xəbərlər məcmuəsi* (Gəncə), **39**: 29-33.

**Əlizadə V.M.** (2011) Azərbaycanın bioloji müxtəlifliyi, öyrənilməsi, qorunması və zənginləşdirilməsi. *AMEA Botanika İnstitunun Elmi əsələri,* **XXXI:** 3-16.

**Əsgərov A.M.** (2011) Azərbaycan florasının konspekti. Bakı, Elm: 202.

**Novruzov V.S., İsmayılova Z.M., Bayramova A.A.** (2010) Azərbaycanın qərb bölgəsində xüsusi mühafizə olunan təbiət ərazilərinin (Göy-göl, Eldar şamlığı, Qarayazı) flora biomüxtəlifliyi və genofondun mühafizəsi. *Azərbaycan Botaniklər Cəmiyyətinin Elmi əsərləri,* **I**: 89-94.

**Novruzov V.S.** (2010) Fitosenologiyanın (geobotanika) əsasları. Bakı, Elm: 306 s.

**Гаджиев В.Д.** (1971) Анализ флоры высокогорий Малого Кавказа. Баку: 169 с.

**Гроссгейм А.А.** (1936) Анализ флоры Кавказа. *Тр. БИН АзФАН СССР*, **1:** 275 с.

**Конспект флоры Кавказа.** (2006) СПб, **II**: 467 с.

**Лавренко Е.М.** (1964) Ботанико-географические доминанты и ареалы растений. В кн.: *Физико-географический атлас мира.* М.: 288 с.

**Толмачев А.И.** (1986) Методы сравнительной флористики и проблемы флорогенеза. Новосибирск: 195 с.

**Флора Азербайджана** (1952) Баку. **II**: 317с.

**Черепанов С.К.** (1995) Сосудистые растения России и сопредельных государств. СПб: 995 с.

**Эфендиева Ш.** (1955) Растительность района озера Гей-гель на Малом Кавказе. *Автореф. канд. дисс.,* Баку: 20с.

**Орхидеи (*Orchidaceae*) Особо Охраняемых Территорий Западных Регионов Азербайджана**

**Байрамова А.А.**

*Гянджинский государственный университет*

В статье даются сведения о видовом составе, распространении, биоэкологических особенностях представителей семейства *Orchidaceae*. Установлено, что на особо охраняемых территориях Западных регионов Азербайджана встречаются 27 видов, 14 родов из семейства *Orchidaceae*. Проведен систематический, ареалогический и экологобиологический анализ флоры.

***Ключевые слова:*** *флора, семейство, род , вид, Orchidaceae*

**Orchids of Specially Protected Areas in the West of Azerbaijan**

**A.A. Bayramova**

*Ganja State University*

Species composition and the ecological structures of the Orchids spread in the specially protected areas in the West of Azerbaijan have been investigated. 27 species, 14 genera of the Orchidaceae family were detected in Azerbaijan. Systematic, areological and ecobiological analyses of the flora were conducted.

***Key words:*** *flora, family, genus, species, Orchidaceae*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 68, №3, səh. 211-214 (2013)*

# Qaya və Töküntülərin Daşdələnləri (*Saxifraga* L.) və Onların Bioekoloji Xüsusiyyətləri

**Y.A.Aslanova**

*Gəncə Dövlət Universiteti, Gəncə şəh., Azərbaycan*; *E-mail:* vnovruzov1@rambler.ru

***Saxifragaceae* Juss. fəsiləsinin əksər növləri yüksək dağlığın ekstremal şəraitində çılpaq qayalıqlar üzərində adaptasiya olunmuşdur. Buna görə də bitkilərin bioekoloji xüsusiyyətlərini öyrənmək zərurəti qarşıya çıxır. Bu məsələlərlə yanaşı tərəfimizdən yeraltı orqanların morfostrukturu, toxumların cücərməsi xüsusiyyətləri, populyasiyaların yaş xüsusiyyətləri və dinamikası öyrənilmişdir.**

***Açar sözlər:*** *qaya, töküntü, fəsilə, cins, növ, Daşdələn*

## GİRİŞ

*Saxifraga* L. cinsi *Saxifragaceae* Juss. fəsiləsinə daxil olub, müasir florada 480 növü yayılmışdır (Шхагапсоев, 2003). Qafqazda 22 növ (Гроссгейм, 1948; Гаджиев, 1971), Şimali Qafqazda 28 növü (Галушко, 1978) yayılmışdır. E.A.Myausov (Мяусов, 2000) Qafqazda 27 növün oldugunu dəqiqləşdirmişdir. Azərbaycanda 15 növünə təsadüf edilir. Kiçik Qafqazın simal-şərq hissəsinin yüksək dağlığında isə 6 növ yayılmışdır. O cümlədən Qoşqar dağ massivində 5 növ - *S.moschata, S.pontica, S.adenophora, S. cartilaginea, S.exarata,* Kəpəz dağ massivində isə cəmi 3 növ - *S.exarata, S. juniperifolia, S.adenophora* müəyyən edilmişdir.

Asiyanın, Avropanın, Amerikanın yüksək dağ bitkiliyinin tərkibində mühüm yer tutur. Əhəng süxurlarında daha yaxşı inkişaf edir. Əsasən hiqrofit və mezofitlərdir. Yüksək dağlarda bitənlər arasında subkserofitlər də mövcuddur. Subkserofitlər rütubət çatışmamazlığına ətvari kutinləşmiş yarpaqları ilə uyğunlaşa bilir. Həmçinin yarpaq rozetində atmosfer rütubəti və şeh damlaları yığıla bilir. Bu da zoğların inkişafını təmin edir.

## MATERİAL VƏ METODLAR

Tədqiqatlar 2010-2013-cü illərdə Kiçik Qafqazın şimal-şərq hissəsinin Qoşqar dağ (3361 m) və Kəpəz dağ (3065 m) sistemlərində aparılmışdır. Tədqiqat materialı Kiçik Qafqazın yüksək dağlığının Daşdələnləri (*Saxifraga* L.) olmuşdur.

Tədqiqatların aparılmasında marşurut stasionar və kameral metodlardan istifadə olunmuşdur. Eyni zamanda Botanikada istifadə olunan floristik, floristik-sistematik, areoloji, botaniki-coğrafi, fitosenoloji, statistik metodlar nəzərə alınmışdır (Əsgərov, 2010; Жмылев, 2000; Гурбанов, 2004; Novruzov, 2010; Шхагапсоев, 2005). Marşurutlar orta dağ qurşağından başlayıb subnival və nival qurşaqlarına qədər dağ suxurları, yarğanları, çılpaq və eroziyaya uğramış suxurları və töküntüləri əhatə etmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Qaya və töküntü bitkilərindən olan daşdələnlər ikili xarakter daşıyırlar. Onların kökləri qaya çatlarından dərinliyə gedir və yastıqvari forma əmələ gətirir.Qısalmış və torpağın üzərinə düşmüş zoğların yarpaq lövhəcikləri müəyyən qədər reduksiya olunmuşdur. Üzəri isə qalın epiderma ilə örtülür.

Yüksək dağ subkserofitlərinin ən mühüm xüsusiyyətlərindən biri də daşdələnlərin yarpaqları üzərində nazik əhəng qatının yığılmasıdır. Əhəngin ayrılması hidototlar vasitəsi ilə həyata keçirilir. Hidototlar epidermisin altında xlorofili olmayan ötürücü topalardır. Ayrılmış əhəngin miqdarı çox azdır. Bunu əhəngli işartı da adlandırmaq olar ki, bu da suyun buxarlandırılmasından, ultrabənövşəyi şüaların məhvedici təsirindən bitkini mühafizə edir.

Yüksək dağ şəraitində uyğunlaşmaqla əlaqədar daşdələnlərin çiçəkləmə biologiyasında bir sıra xüsusiyyətlər nəzərə çarpır, əsasən də mövsümü fazaların çox sürətli ritmlə keçməsi. Yəni, ilk yarpaq əmələ gəlməsindən yaşlı dövrə qədər olan mərhələni sürətlə keçirir. Çiçəkləmə müddəti reproduktiv zoğların tumurcuqda formalaşmasından asılıdır. İlk əvvəl çiçək rüşeymi müşahidə olunur. Sonra isə yayda çiçək zoğları formalaşır, bu zoğlar payızda, qışda da həmin vəziyyətdə qalır. Bu zaman çiçək tumurcuğunun daxilində yumurtalıq, erkəkciklər, çiçək yatağı və ləçəklər artıq formalaşır. Erkən yazda isə qarın altından çıxır. Əksər növlərdə çiçək tumurcuqları hətta iyulda, bəzilərində isə avqustda formalaşır. Tədricən növbəti ildə çiçəkləmə üçün hazırlıq gedir. Gec

çiçəkləyən növlərin toxumları qış başlayan zaman qarın altından çiçək halında baş qaldırır. Bütün daşdələnkimilər əsasən həşəratlarla tozlanır. Yüksəkliklərdə həşəratlar az olduğundan onları cəlb etmək üçün ləçəklərində (nektarın toplandığı yerdə) carımtıl, ağımtıl, bənövşəyi rəngli parlaq nöqtələr və damarlar müşahidə olunur ki, bu da əmələ gəlmiş uyğunlaşmadır. Yüksək dağlarda tez çiçəkləyən növlərdə tozlandırıcı həşəratlar olmadığından öz- özünə tozlanma baş verir.

Daşdələnlər adətən çox xırda toxumlar əmələ gətirir. Tədricən qutucuq açılır və toxumlar ətrafa yayılır. Saxifraga adenophora C.Koch və Saxifraga exarata Vill. toxumları çox rütubətli yerlərdə, daşların hamar səhtındə yaxşı cücərir. Tədqiqat ərazisində bəzi rütubət sevən növlərdə toxumlar 18-20 günə qədər rütubət içərisində dinclik dövünü keçirir. Toxumla çoxalmadan başqa daşdələnkimilər vegetativ yolla da çoxalırlar. Onlar yarpaq qoltuğunda tumurcuqlar əmələ gətirirlər. Bu tumurcuqlarda qısalmış zoğun üzərində yarpaqlar bir-birinin üzərini örtür. Əksər növlərdə isə vegetativ çoxalma ilə yanaşı toxumla çoxalma da baş verir. Onların digər çoxalma üsulu da vardır, məsələn, ətvari kökərin üzərində yeni zoğların əmələ gəlməsi.

*Saxifraga* L. cinsinin əksər növləri yüksək dağlığın eksterimal şəraitində çılpaq qayalıqlar üzərində adaptasiya olunmuşdur. Bu şəraitdə çılpaq qayalıqlarda *Saxifraga* cinsi özünü şəraitə uyğun aparır. Bizim tərəfimizdən bitkinin ekoloji, bioloji xüsusiyyətlərio cümlədən yeraltı orqanların morfostrukturu, toxumun cücərmə qabiliyyəti, yaş xüsusiyyətləri, populyasiyasının dinamikası öyrənilmişdir.

Kök sistemi bir çox tədqiqatçılar tərəfindən öyrənilmışdır (Рысин, 1987; Таршис, 2003) və bitkilərin müxtəlif fitosenozlarda torpaq iqlim şəraitindən asılı olaraq kök sisteminin yayılma qanunauyğunluqları müəyyənləşdirilmiş, yüksək dağ bitkilərinin kökləri stabil substratlara uyğunlaşmışdır. Kökün getmə dərinliyi substratın xarakterindən asılıdır. Bəzi bitkilərin kök sistemi nəmli buz qatından da keçə bilir, hətta sərt buz qatına da çata bilir və əlaqədə olur (Novruzov, 2010). Aşağıda tədqiqat ərazisinin Daşdələnlərinin qaya və töküntülərdə inkişaf xüsusiyyətləri haqqında məlumat verilir.

***Saxifraga adenophora C.Koch***- Vəzli d.

Alp və subalp qurşağının qayalarında rast gəlinir. Diametri 5 mm olan mil kök sisteminə malikdir. Kökü qayalıqların yarıqlarına daxil olaraq S-vari forma alır. 46sm-ə qədər dərinliyə gedir və sonra məhv olur. Yan köklər praktik olaraq budaqlanmır. Yalnız iki dəfə 2 yan köklər (diametri 3-3,2mm) 50 sm-ə qədər qaya yarıqlarına daxil olur.Bunlardan yalnız biri apikal hissədə qaya yarıqlarında olan kiçik torpaq hissəciyində intensiv yelpikvari budaqlanır. Kökün bazal hissəsi qırışdır, əyilmişdir, yastılaşmış formada olub açıq sarı rənglidir.

***Saxifraga cartilaginea Willd.*** - Ximircəyi d.

Alp və subalp qurşağında daşlı çınqıllı yerlərdə rast gəlinir. Çoxillik otdur. Kökü mil köklüdür. Maksimal olaraq 27-30 sm-ə qədər dərinliyə daxil olur. Kökün əsas hissəsi 8-15sm dərinlikdə yerləşir. Budaqlanma kök boğazından sonra başlayır. Beləliklə, I zonanın yan köklərinin uzunluğu 20-21 sm, II zonanın yan köklərinin uzunluğu 4,5-5 sm, III zonanın yan köklərinin uzunluğu 1,5-2 sm, IV zonanın yan köklərinin uzunluğu isə 0,1-0,2 sm olur. Üst hissəsinin rəngi açıq (noxudu), bütövlükdə qəhvəyi rəngdədir. Kökün üfüqi yayılma diametri 50-51 sm-dir.

***Saxifraga exarata Vill***- Kövrək daşdələn.

Qaya və töküntülərdə çınqıllıqlar arasında rast gəlinir. Mil köklü bitkidir. Kökü tünd boz rəngli,diametri 1,5 sm-ə malikdir. 165 sm-ə qədər dərinliyə gedə bilir. Bu zaman diametri azalır. Kökün üst qatından 20 sm-dən başlayaraq diametri 4 mm olan 5-6 yan köklər inkişaf edir.Həmin köklər 65 sm-ə qədər uzanır. Bəziləri vertikal, bəziləri isə horizontal uzanır. Budaqlanma kökün III zonasına qədər baş verir. I zonanın yan köklərinin uzunluğu 70 sm, II zonanın yan köklərinin uzunluğu 8,5 sm, III zonanın yan köklərinin uzunluğu isə 7 sm olur. Beləliklə, güclü inkişaf etmiş əsas köklərin fonunda zəif inkişaf etmiş yan köklərin skeleti görünür. Kökün yayıldığı sahə 100-110 sm-dir. Kökü qırışlı, tünd boz rəngdə, kəsiyi isə noxudu rəngdədir. Qatılığı bərkdir.

***Saxifraga juniperifolia Adams.***-Ardıcyarpaq d.

Daşlı qayalı yerlərdə rast gəlinir. Mil kökü iki eyni bərabər hissəyə bölünmüşdür. Budaqlanma kökün II zonasından başlayır, uzunluğu 40 sm-ə qədərdir. III zonada 9-10 sm, IV zonada 2-3 sm, V zonada 0,5-1,0 sm, VI zonada isə 0,1-0,2 sm olur. Beləliklə, yayılma diametri 40-50 sm-dir. Maksimal olaraq 80-120 sm-ə qədər dərinliyə gedir. Kökün əsas hissəsi 19-20 sm dərinliyində yerləşir. Rəngi tünd qəhvəyi, aşağı hissəsi isə sarımtıl rəngdədir. II dərəcəli yan köklər 1sm-ə qədərdir, sarımtıl rənglidir. Beləliklə, kök sisteminin ümumilikdə diametri 70-80 sm-dir.

***Saxifraga moschata Wulf.*** – İyli d.

Subnival qurşağına qədər hər yerdə, buzlaqlarda rast gəlinir. Açıq rəngli, 10-17 sm uzunluğunda, 0,05-0,07 sm diametrində mil kök sisteminə malikdir. 5-7 sm dərinliyə daxil olur. II dərəcəli köklərin uzunluğu 2 sm-ə qədərdir. Budaqlanma kökün aşağı hissəsindən başlayır. Yayılma diametri 12-15 sm-ə qədərdir.

***Saxifraga pontica Alb., Prosdr. Fl.***- Pont d.

Alp və subalp qurşağında qayalıqlarda, daşlı çınqıllı yerlərdə rast gəlinir. Çoxillik otdur. Kökü 70 sm uzunluğunda, diametri 0,25-3sm olan mil köklüdür. Maksimal olaraq 27-30 sm-ə qədər dərinliyə daxil olur. Kökün əsas hissəsi 8-15sm dərinlikdə yerləşir. Budaqlanma kök boğazından sonra başlayır. Beləliklə, I zonanın yan köklərinin uzunluğu 20-21 sm, II zonanın yan köklərinin uzunluğu 4,5-5 sm, III zonanın yan köklərinin uzunluğu 1,5-2 sm, IV zonanın yan köklərinin uzunluğu isə 0,1-0,2 sm olur. Üst hissəsinin rəngi açıq (noxudu), bütövlükdə qəhvəyi rəngdədir. Kökün üfüqi yayılma diametri 50-51 sm-dir.

Qayalar bitkinin substrata bərkiməsi üçün az əlverişli olub, hərtərəfli daşlıq massiv köklərin ora daxil olmasına ciddi maneə yaradır. Qaya yarıqları arasına bitkinin özünün müqavimətini saxlaması üçün 150-180 sm-ə malik olan kök sistemi olmalıdır. Cınqıllı və daşlı yamacları yeraltı orqanların inkişafı və yayılmasına təsiri çox böyükdür. Müxtəlif növlərin köklərinin daşlı mühitə daxil olması eyni deyildir. Kiçik Qafqazın yüksək dağlığında Saxifraga L. cinsinin*S. juniperifolia Adams, S. pontica Alb., S. exarata Vill.*növlərinin yeraltı orqanları yaxşı inkişaf etmişdir. Digər qrup bitkilər isə *S. moschata Wulf., S. cartilaginea Willd., S. adenophora C.Koch.* yeraltı orqanlarının uzunluğunun o qədər də əhəmiyyəti yoxdur.

Bir çox tədqiqatçılar (Зозулин, 1959) həyati formaların təsnifatı üçün kök sisteminin xüsusiyyətləri əsas götürmüşlər. Bir qrup tədqiqatçılar isə (Жмылев, 2000) 5 morfoloji nişanə əsasında daşdələnlərin həyati formalarının sistemlərini qurmuşdur. Həmin təsnifata uyğun olaraq bizim tərəfimizdən Qoşqar və Kəpəz dağ massivlərindəSaxifraga cinsinin qaya və töküntülərdə rast gələn aşağıdakı həyati formaları ayrılmışdır.

I. Kolcuqlar
- 1.1 Yastıqvarı uzun milköklülər

II. Otvari polikarplar
- 2. Otvari milköklülər
- 2.1 Yastıqvari üzün mil köklülər
- 2.2. Çim əmələgətirən rozet tipli uzun mil köklülər.

3. Otvarı - saçaqlılar
- 2.4. Otvarı- saçaqlı köklülər
- III. Otvarı-monokarplar
- 3. Çoxillik monokarplar

Nahamar substratlarda qaya və töküntülər üzərində 3 tip 4 yarımtipə aid 10 həyati forma müəyyənləşdirilib.

Daşdələnlərin biomorflarının təhlili və mövcud ədəbiyyatlar göstərir ki, onlar arasında biomorfoloji adaptasiya geniş yayılır ki, bu da şübhəsiz taksonomik təkamüllə əlaqədardır (Шхагапсоев, 2005).

Toxum məhsildarlığını müəyyənləşdirmək üçün potensial toxum məhsuldarlığı və real toxum məhsuldarlığını müəyyən etmək lazımdır.

Real toxum məhsuldarlığı - yetişmiş tam həyat qabiliyyətli toxumların miqdarı həm keyfiyyət, həm də kəmiyyətinə görə meyvə vermə qabiliyyətini xarakterizə edir.

Potensial toxum məhsuldarlığı - bir genetativ zoğda olan toxum verən çiçəklərin miqdarı başa düşülür.

*Saxifraga exarata*-nın toxum məhsuldarlığı Kəpəz dağ massivində qaya və töküntülər içərisində iki populyasiyalarda öyrənilmişdir. Bu növ toxum vasitəsilə çoxalır, həşərat vasitəsilə tozlanır. Çiçəkləmə aprel ayında başlayır və iyunun sonuna qədər, meyvə vermə isə iyunun ortasından avqustun sonuna qədər davam edir.

*Saxifraga cartilaginea*–nın toxum məhsuldarlığı bizim tərəfimizdən Qoşqar dağ massivində müəyyən edilmişdir. Çöl müşahidələri nəticəsində müəyyən oldu ki, həmin növ toxumla çoxalır, həşəratla tozlanır. Çiçəkləmə dövrü mayda başlayır, iyulun sonuna qədər davam edir. Meyvə vermə isə avqustun sonuna kimi davam edir.

Toxum məhsuldarlığına görə toplanan məlumatların təhlili göstərir ki, Qoşqar və Kəpəz dağ sistemində ən çox toxum məhsuldarlığı qayalıqlarda, ən az isə töküntülərdə müşahidə edilir.

*Saxifraga* növlərini iki yolla mühafizə etmək olar.

1.Mədəni halda becərmək - Botanika bağları və dendroparklarda, landşaft memarlığında istifadə oluna bilər.

2. Təbii şəraitdə - arealı qoruqlardan yuxarı əraziləri əhatə etdiyinə görə növlərin əksəriyyəti xüsusi mühafizə olunan əraziləri əhatə etmir. Bununla əlaqədar bitmə yerlərinin yasaqlıq adlandırmaq məqsədəuyğun hesab edilir.

## ƏDƏBİYYAT

**Əsgərov A.M.** (2010) Azərbaycan florasının konspekti. Bakı: 183 s.

**Novruzov V.S.** (2010) Fitosenologiyanın əsasları (geobotanika). Bakı. Elm: 306 s.

**Гаджиев В.Д.** (1971) Анализ флоры высокогорий Малого Кавказа. Баку.

**Галушко А.И.** (1978) Флора Северного Кавказа. Ростов. **Т.**1-3

**Гроссгейм А.А.** (1948) Растительный покров Кавказа.М.: Моск. об-ва испыт. природы: 15-264.

**Гурбанов Е.А.** (2004) Флора и растительность Атропатанской провинции. *Автореферат*

*докт. дисс.*, Баку: 59 с.

**Жмылев П.Ю.** (2000) Жизненные формы камнеломок в связи с экологией рода *Saxifraga* L. (*Saxifragaceae*). *Бюлл.МОИП,* **105(6)**: 32-37.

**Зозулин Г.М.** (1959) Подземные части основных видов травянистых растений и ассоциаций плакоров среднерусской лесостери в связи с вопросами формирования растительного покрова. *Тр. Центр.-Черноземн. Госзаповедника* (Курск) **5:** 313 с.

**Мяусова Е.А.** (2000) Эколого-географический и систематический анализ рода камнеломока флоры Северного Кавказа: *Автореф. дис. канд. биол. наук.*, Ставрополь: 17 с.

**Рысин Л.П., Рысина Г.П.** (1987) Морфоструктура подземных органов лесных травянистых растений. М.: Наука: 205 с.

**Таршис Л.Г.** (2003) Структурное разнообразие подземных органов высших растений. Екатеринбург: 184с.

**Шхагапсоев С.Х.** (2003) Анализ петрофитного флористического комплекса западной части центрального Кавказа. Нальчик: 217 с.

**Шхагапсоев С.Х., Тлехас-Мурзаканова Л.З.** (2005) Экология камнеломок Кабардино-Балкарии. Нальчик: 78 с.

## Камнеломка (*Saxifraga L.*) Скально-Осыпных Высокогорий Малого Кавказа И Их Биоэкологические Особенности

**Я.А.Асланова**

*Гянджинский Государственный Университет*

В статье даются сведения о видовом составе, распространении, биоэкологических особенностях представителей рода *Saxifraga L.* на скалах и осыпях высокогорий Малого Кавказа. Установлено, что на высокогорье встречаются 6 видов из рода *SaxifragaL*. Их местообитание отмечено на щебенистых и каменистых территориях. Проведен систематический, ареалогический и экологобиологический анализ флоры.

***Ключевые слова:*** *скала, осыпь, семейства, род, вид, Камнеломка*

## Species Of *Saxifraga* L. In The Rock Debris Of High Upland Parts Of The Small Caucasus And Their Bioecological Features

**Y.A. Aslanova**

*Ganje State University*

The article provides information on the species composition, distribution, biological and ecological features of the genus *Saxifraga L.* in the rocks and debris of upland parts of the Small Caucasus. Six species of the genus *Saxifraga* L. were detected in the uplands. Their habitat was found to be pebbly and stony areas. Systematic areal and ecobiological analyses of the flora were carried out.

***Keywords:*** *rock, debris, family, genus, species, Saxifraga*

# İBRAHİM SƏFƏROV - 100

## GÖRKƏMLİ ALİM VƏ SƏMİMİ İNSAN

Bu yaxınlarda Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, kənd təsərrüfatı elmləri doktoru, professor, respublikanın Əməkdar meşəçi alimi, əmək və müharibə veteranı, Şöhrət ordenli İ.S.Səfərovun 100 illiyi qeyd olundu. Həmişə tələbələrinin, həmkarlarının, onu tanıyanların qəlbində yaşayan İbrahim müəllimin yadda qalan dəyərli fikirləri, xatirələri var ki, onlardan bir neçəsini qələmə almağı özümə borc bildim.

Görkəmli dendroloq-alim İbrahim Səfər oğlu Səfərov 1913-cü il avqust ayının 28-də Azərbaycanın səfalı guşələrindən biri olan Şamaxı rayonunun Quşçu kəndində anadan olmuşdur.

1965-ci ildə akademik V.R.Volobuyevin təşəbbüsü və yaxından köməkliyi ilə Botanika İnstitutunda Biogeosenologiya laboratoriyası yaradıldı və İ.S.Səfərov onun rəhbəri təyin edildi. 1969-cu ildə mən aspiranturaya daxil olarkən, İ.S.Səfərov və V.C.Hacıyev məni məqsədli aspirantura kursunu keçmək üçün Moskvaya, V.N.Sukaçov adına Biogeosenologiya İnstitutuna göndərdilər. Laboratoriya müdiri, örkəmli alim professor N.V.Dılis elmi rəhbərim təyin edildi. Azərbaycanda biogeosenologiya üzrə mütəxəssislərə böyük ehtiyac var idi. Mən gənc bir kadr kimi hazırlanaraq 1972-ci ildə yenidən vətənimizə qayıtdım. Bu zaman artıq Biogeosenologiya laboratoriyası Meşəşünaslıq şöbəsi adı altında fəaliyyət göstərirdi.

1973-cü ildə ilk dəfə olaraq, institutun mövzu planına əsasən tozağacı (*Betula* L.) meşələrində kompleks şəkildə biogeosenoloji metodlarla elmi-tədqiqat işi aparmağa başladım. Təcrübə sahəsi Quba rayonunun Dərk kəndi ərazisində Babadağ tozağacı meşəsində idi. Həmin meşə sahəsinin yolu çox çətin və nəqliyyatın gedə bilmədiyi yerdə olduğuna görə ora yalnız atla getmək mümkün olurdu. Belə çətinliyin olmasına baxmayaraq, İbrahim müəllim mənim apardığım elmi-tədqiqat işini yoxlamaq üçün Dərk kəndinə gəldi. Təcrübə sahələrinə mütləq atla getmək lazım idik. 60 yaşlı alim çox cəsarətlə, heç bir çətinlikdən qorxmayaraq, at belində dəniz səviyyəsindən 1600 m hündürlükdə olan Babadağının tozağacı meşəsinə yollandı. Bütün təcrübə sahələrini gəzib yoxladıqdan sonra işimdən razı qaldığını bildirdi. Əlbəttə, bu yenicə elmi-tədqiat işinə başlayan gənc alim üçün böyük ümidverici nailiyyət idi. İbrahim müəllimlə 26 il bir yerdə işləməyimlə çox böyük



fəxr hissi keçirirəm. Mən onun yanında həyat məktəbi keçmişəm. Bu müddət ərzində ondan çox şeylər öyrənməklə yanaşı, yadımda qalan bir çox dəyərli anlar da olub. Bunlardan bir neçəsini açıqlamaq istəyirəm.

Şöbə böyük kollektivdən - 22 əməkdaşdan ibarət olub, beynəlmiləl xarakter daşıyırdı. Hətta "qonşu" respublikadan da şöbədə 2 nəfər işçi də çalışırdı. Ibrahim müəllimin rəhbərlik etdiyi şöbənin kollektivi çox səmimi və işgüzar insanlardan ibarət idi. O zaman kollektivdə S.Ə.Sadıxova, K.S.Əsədov, Q.Cəlilov, O.H.Mirzəyev, Ş.Q.Hüseynov, E.S.Səfərova, E.P.Səfərova, G.İ.Rzayeva və başqa əməkdaşlar fəaliyyət göstərirdilər. Ekspedisiya və ezamiyyətlərə gedərək elmi-tədqiqat işlərimizi rahat və yaxşı nəticələrlə yerinə yetirirdik. Bunun da əsas səbəbi İbrahim müəllimin tələbələri və yetirmələri demək olar ki, respublikamızın əksər bölgələrində Meşələrin Bərpası və Mühafizəsi Müəssisələrin rəhbərləri və əməkdaşları idilər. Onlar bizə çox böyük qayğı göstərirdilər.

İbrahim müəllimin ən yaxşı xüsusiyyətlərindən biri də o idi ki, kollektivdə həmişə səmimi və mehribançılığın bərqərar olmasına çalışırdı. Odur ki, şöbədə həmişə abu-hava təmiz və sağlam olurdu. Onun təşkilatçılığı ilə bütün bayram tədbirlərini keçirirdik. İbrahim müəllimin xanımlara böyük hörməti var idi və onlara xüsusi qayğı göstərirdi. 8 Mart Beynəlxalq Qadınlar bayramını

xüsusi ilə, hədiyyələrlə keçirilməsini xoşlayırdı. O da xatirəmdədir ki, Moskvada spirtli içkilərin istifadəsinə, xüsusən ictimai yerlərdə qadağa qoyulduğu bir vaxtda şöbədə Qadınlar bayramını qeyd edəndə İbrahim müəllim 1 ədəd Şampan şərabının alınmasını təklif etdi.

İbrahim müəllimə bir nüfuzlu şəxsiyyət kimi yanaşırdıq. Bu hörməti o, özü qazanmışdı. Institutumuzun bütün kollektivi ona yüksək səviyyədə hörmət edirdilər, ona böyük ehtiramla yanaşırdılar. Hətta institutun bütün tədbirlərində, o cümlədən elmi şurada onun həmişə oturduğu stulda hörmət əlaməti olaraq heç kim oturmazdı. Botanika İnstitutuna həmişə görkəmli alimlər rəhbərlik ediblər. Onlar hər zaman İbrahim müəllimin şəxsiyyətinə böyük hörmət əlaməti olaraq ya daxili telefonla xırda məsələlərə görə müraciət edər, yaxud ciddi problemli məsələ olanda onun kabinetinə gələrdilər. Mən İbrahim müəllimlə işlədiyim dövrdə bunların hamısının şahidi olmuşam.

İbrahim müəllim əməkdaşlara çox diqqətli idi. İbrahim müəllim səhhətinə görə öz istəyi ilə 1987-cu ildə şöbə rəhbərliyindən azad olunarkən, onun təklifi ilə məni onun yerinə təyin etdilər, o isə elmi məsləhətçi oldu. Bu zaman öz oturduğu kabineti İbrahim müəllim mənə təklif edəndə mən razılaşmadım və ona ömrünün axırına kimi öz kabinetində oturmağı və bizə elmi məsləhətlər verməyini xahiş etdim. Onunla bundan sonra 10 il bir yerdə işlədik.

İbrahim müəllim hər bir işçisinə qayğı ilə yanaşaraq köməklik göstərərdi. Botanika İnstitutunun əməkdaşı Rafiq Kamil oğlu Məlikov uzun müddət evsiz idi. Bakı Sovetinin deputatı olan İbrahim müəllimin xahişi və köməkliyi ilə ona ev verirdi. Mənim üçün də İbrahim müəllim qayğısını əsirgəməyib. Məlum olduğu kimi, keçmiş SSPİ məkanında tədris saatları mərkəzdən-Moskvadan verilirdi. Bizdən başqa əksər respublikaların universitetlərində gənc elm sahəsi olan Biogeosenologiya fənni tədris olunurdu. Mənim Moskvada olan elmi rəhbərim professor N.V.Dılis birinci dəfə olaraq 1977-ci ildə Bakıya gəlmişdi. O, professor İ.S.Səfərovla şöbədə görüşərkən bir çox məsələlərlə yanaşı, həm də Biogeosenologiya fənninin tədrisi ilə maraqlandı. Bu fənn tədris olunmadığı üçün, N.V.Dılis və İ.S.Səfərov Bakı Dövlət Universitetinin rektoru F.Bağırzadə ilə görüşdülər. Rektor F.Bağırzadə Biogeosenologiya fənninə saat ayırmağı vəd etdi və mənim bir gənc alim kimi həmin fənni tədris etməyə razılığını verdi. Ancaq təssüf ki, bu vədə əməl olunmadı.

İbrahim müəllim səmimiliyi, qayğıkeşliyi ilə yanaşı, elmi işlərin aparılmasında çox ciddi və məsuliyyətli alim idi. Meşələrimizin mühafizəsi və onların sahələrinin artırılması üçün həmişə dəyərli tövsiyələrini verirdi. Təsadüfi deyil ki, Xaçmaz rayonundan 2-ci, 3-cü xətlə Şollar suyunun Bakı şəhərinə çəkilməsi zamanı meşələrə toxunulmamasını tövsiyə edirdi. Meşə sahələrinin artırılması və zənginləşdirilməsi üçün uzun müddətli ətraflı tədqiqat işlərini aparan İbrahim müəllim meşə salarkən bir çox ağac cinslərindən istifadə edilməsini təklif etmişdir. Lənkəran meşələrinin əsas tərkibini təşkil edən, yaxşı inkişafı olan şabalıdyarpaq palıdın (*Quercus castanufolia*) Yalama ərazisində əkilməsi layihəsini 1953-cü ildə məhz professor İbrahim Səfərov vermişdir. Hal-hazırda şabalıdyarpaq palıd Yalama meşələrinin əsasını təşkil edir. Dəmirağacının (*Parrotia persica*), o cümlədən Eldar şamının (*Pinus eldarica*) və s. ağac cinslərinin meşə əkinlərində, yaşıllıq və parkların salınmasında istifadə edilməsini təklif etmişdir.

Onu da qeyd etmək vacibdir ki, İbrahim müəllim istirahətə gedərkən elmi-tədqiqat və müşahidə işlərinə də diqqət edirdi. O, olduğu yerlərin ətrafındakı meşələri, parkları, salınmış yaşıllıqları mütləq gəzər və nəticədə öz təkliflərini verərdi. Təsadüfi deyil ki, Nalçik və Yessentuki sanatoriyasında istirahər edərkən oranın rəhbər işçiləri ilə görüşərək, eldar şamından meşə əkinlərində, yaşıllıqların və parkların salınmasında istifadə edilməsini tövsiyyə edən məhz İbrahim müəllim olmuşdur. Bir neçə ildən sonra həmin şəhərlərə gedərkən eldar şamının yaxşı inkişaf etməsini müşahidə etmişdir. Ümumiyyətlə, İbrahim müəllim hər hansı ölkələrdə olarkən oranın təbiəti, bitki aləmi və xüsusən də meşələri ilə maraqlanmış, lazımı məsləhət və tövsiyələrini vermişdir.

Ümumdünya əhəmiyyətli məşhur Kislovodski şəhərinin ətrafında olan Kurort meşələri və qozmeyvəlilər plantasiyası bilavasitə 1951-ci ildən başlayaraq professor İ.Səfərovun təşəbbüsü ilə salınmışdır və bununla bağlı 2 nəfər elmlər namizədi hazırlanmışdır.

Professor İbrahim Səfərovun gərgin əməyinin və elmi axtarışlarının nəticələri 200-dən çox elmi məqalə, o cümlədən 11 monoqrafiyada öz əksini tapmışdır . Onun təklifi əsasında Bolqarıstan, Ruminiya, Əlcazair və başqa ölkələrdə Eldar şamı meşəsi salınaraq sınaqdan çıxarılmış və Bolqarıstanın cənubunda Sandanski rayonunda eldar şamının meşə massivi yaradılmışdır.

Azərbaycan Elmlər Akademiyasının müxbir üzvü olan İ.Səfərov yüksək ixtisaslı elmi kadrların hazırlanmasına xüsusi diqqət vermiş, onun rəhbərliyi altında 2 elmlər doktoru və 40-a yaxın elmlər namizədi hazırlanmışdır.

Professor İ.Səfərov 20 ildən çox Bakı Şəhəri Sovetinin yaşıllaşdırma və ekologiya komissiyasının sədri vəzifəsində çalışmış və həmin illərdə Bakı Sovetinin deputatı olmuşdur. Elmin

inkişafında göstərdiyi yüksək xidmətlərinə görə Azərbaycan prezidenti Heydər Əliyev onu ölkənin ən yüksək mükafatlarından olan Şöhrət ordeni ilə təltif etmişdir.

İbrahim müəllimin ürəyində həyata keçiriləsi çoxlu qlobal planları var idi. Lakin nə etmək olar... Ölüm imkan vermədi. Görkəmli alim İbrahim Səfərov 1998-ci il noyabr ayının 21-də dünyasını dəyişdi. Lakin İbrahim müəllimin xatirəsi onu tanıyanların və tələbələrinin qəlbində həmişə yaşayacaqdır. Allah rəhmət eləsin.

***Oqtay Mirzəyev***
***AMEA Botanika İnstitutunun***
***Geobotanika şöbəsinin***
***aparıcı elmi işçisi, b.ü.f.d.***

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 68, №3, səh. 218-219 (2013)

# TARİYEL TALIBOV – 65



Əməkdar Elm Xadimi, AMEA-nın müxbir üzvü, biologiya üzrə elmlər doktoru, professor Tariyel Talıbov uzun illər dərin tədqiqatlar aparan və botanika elmində əhəmiyyətli nəticələr əldə edən nüfuzlu alimlərdən biridir.

Tariyel Hüseynəli oğlu Talıbov 22 fevral 1949-cu ildə Naxçıvan MR Şərur rayonunun Siyaqut kəndində qulluqçu ailəsində anadan olmuşdur. 1966-cı ildə Siyaqut kənd onbirillik orta məktəbi, 1973-cü ildə isə Azərbaycan Dövlət Universitetinin biologiya fakültəsini bitirmişdir. Təhsilini başa vurduqdan sonra Naxçıvan Regional Elm Mərkəzində kiçik elmi işçi vəzifəsinə işə qəbul edilmiş, hərbi xidmətə çağırılmış, 1974-cü ildə hərbi xidmətdən qayıtdıqdan sonra Naxçıvan Dövlət Pedaqoji İnstitutunun (İndiki Naxçıvan Dövlət Universiteti) kimya-biologiya kafedrasında baş laborant, Biologiya kafedrasında müəllim, baş müəllim, Botanika kafedrasında dosent vəzifələrində çalışmış, 1989- 2002-ci illərdə universitetin Botanika kafedrasının müdiri vəzifəsində işləmişdir.

2003-cü ildə AMEA Naxçıvan Bölməsinin Bioresurslar İnstitutunun direktoru vəzifəsinə təyin olunmuş və hal- hazırda həmin vəzifədə çalışır.

1978-ci ildə Azərbaycan EA Genetika və Seleksiya İnstitutunun aspiranturasına daxil olmuş, 1986-cı ildə namizədlik dissertasiyası müdafiə edərək biologiya elmləri namizədi elmi dərəcəsi almışdır.

2003-cü ildə AMEA Botanika İnstitutunda "Naxçıvan MR-in flora biomüxtəlifliyi, onun səmərəli istifadəsi və qorunması" mövzusunda doktorluq dissertasiyası müdafiə edərək "Botanika" ixtisası üzrə biologiya elmlər doktoru elmi dərəcəsi almışdır.

Apardığı elmi tədqiqatların mühüm nəticələri və hazırladığı kadrlara görə 2007-ci ildə ona professor elmi adı verilmişdir. Tariyel Talıbov 160 əsərin, o cümlədən, 31 kitab, metodik vəsait, proqram və xəritələrin müəllifidir. T.Talıbov bir çox nüfuzlu beynəlxalq qurultay, simpozium və konfranslarda (Türkiyə, Kiyev, Vitebsk, Moskva, Sankt-Peterburq, Novosbirski və Simferopol) iştirak etmişdir.

T.H.Talıbovun Naxçıvan Muxtar Respublikasının biomüxtəlifliyinin tədqiqinə dair qiymətli əsərləri və monoqrafiyaları nəşr olunmuşdur. Bunlardan "Naxçıvan MSSR-də biosferin mühafizəsi", "Naxçıvan diyarının dərman bitkiləri", "Naxçıvan MR-in flora biomüxtəlifliyi və onun nadir növlərinin qorunması", İki cildlik "Naxçıvan Ensiklopediyası" (Əsas məqalə müəlliflərindən biri), "Naxçıvan abidələri ensiklopediyası. The encyclopaedia of Nakhchivan monuments" (Əsas məqalə müəlliflərindən biri), "Naxçıvan Muxtar Respublikası bitkiliyi", "Naxçıvan Muxtar Respublikası florasının yabanı alma və armud növləri", ilk dəfə olaraq Naxçıvan MR-in iki cildlik "Qırmızı Kitab"ı, "Naxçıvan Muxtar Respublikası florasının çılpaqtoxumlu bitkiləri", "Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri" və "Naxçıvan Muxtar Respublikasının ampeloqrafiyası"nı göstərmək olar.

T.H.Talıbovun aspirant və dissertantların hazırlanılmasında böyük xidmətləri vardır, onun rəhbərliyi altında biologiya üzrə elmlər doktoru və fəlsəfə doktorları müdafiə etmişdir.

Tariyel Talıbovun çoxillik səmərəli elmi, elmi - təcrübi və təşkilatçılıq fəaliyyəti bir çox Fəxri fərman və adlarla mükafatlandırılmışdır. Azərbaycan Respublikası Təhsil Nazirliyinin, AMEA Rəyasət Heyətinin "Fəxri fərman"ları, ümummilli lider Heydər Əliyevin 90 illik yubileyi ilə əlaqədar olaraq "Qızıl medal"la təltif edilmişdir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə ona "Azərbaycan Respublikasının Əməkdar elm xadimi" fəxri adı verilmişdir.

2006-2009-cu illərdə Ümumdünya Təbiəti Mühafizə Fondunun (WWF) Qafqaz Ekoregional Şurasının üzvü kimi fəaliyyət göstərmişdir. AMEA Botanika İnstitutunda fəaliyyət göstərən Dissertasiya Şurasının sədr müavini kimi Şuranın iclaslarının təşkili və aparılmasında iştirak etmişdir.

Botanika elmində əldə etdiyi yüksək elmi nəticələrinə görə 2007-ci ildə "Botanika" ixtisası üzrə AMEA-nın müxbir üzvü seçilmişdir.

Elmi fəaliyyəti ilə yanaşı, professor Tariyel Talıbov həm də ictimai xadimdir. O, 2005 və 2010-cu illərdə 12 saylı Şərur seçki dairəsindən III və IV çağırış Naxçıvan Muxtar Respublikası Ali Məclisinə deputat seçilmişdir. Yeni Azərbaycan Partiyasının üzvü kimi dövlətçiliyimizin qorunmasında, Naxçıvan MR-in inkişafında böyük xidmətlər göstərmişdir.

Gorkəmli alim, tanınmış pedaqoq Tariyel Talıbov sadə, təvazökar və xeyirxah, nəcib insani keyfiyyətlərə, yüksək elmi və təşkilatçılıq qabiliyyətinə malik olduğundan həmkarları arasında böyük nüfuz və hörmət qazanmışdır. O, özünə və yoldaşlarına qarşı tələbkar, ciddi, işinə məsuliyyətli, daim öz üzərində çalışan, elmi və pedaqoji fəaliyyətinin artırılması qayğısına qalan bir tədqiqatçı alim kimi Azərbaycanda və ölkə hüdudlarından kənarda tanınır.

***Səyyarə İbadullayeva***
***b.ü.e.d., prof., AMEA Botanika İnsitutunun Etnobotanika lab.-nın müdiri***